# DİLÇİLİK LINGUISTICS ЯЗЫКОЗНАНИЕ

**Kazımov Qəzənfər Şirin oğlu**
AMEA, Nəsimi adına Dilçilik institutu

## AŞİNA VƏ AZƏRBAYCAN

*«Hadisələr arasındakı əlaqəni aşkara çıxaran tarixçinin işi hadisələrin mövcudluğunu müəyyənləşdirən filoloq-şərqşünasın işinin qurtardığı yerdə başlanır».*

***Lev Qumilyov***
***«Qədim türklər», s.118***

*«Bir də, ümumiyyətlə, xalqın tarixini istisnasız şəkildə onun əleyhdarının mövqeyindən öyrənmək olmaz».*

***Lev Qumilyov***
***«Qədim türklər», s.106***

***Açar sözlər:*** *Böyük Türk Xaqanlığı, Aşına tayfası, L.Qumilyov, türk dili, qədim türklər , Ön Asiya, türük*
***Key words:*** *Keywords: Great Turkic Kaganat, Ashina tribe , L. Gumilev, Turkic, ancient Turks, Front Asia, Turks*
***Ключевые слова***: *Великий Тюркский Каганат, род Ашина, Л.Гумилев, тюркский язык, древние тюрки, Передняя Азия, тюрюкки*

Bizim dilçi və tarixçilərin əksəriyyəti bu fikirdədir ki, Mərkəzi Asiyada Böyük Türk Xaqanlığı (eramızın V- VIII əsrləri) dağıldıqdan sonra Oğuz tayfaları XI əsrdən başlayaraq tədricən Azərbaycana daxil olmuş, XIII əsrin birinci rübünün sonlarında gələn monqolların köməyi ilə Şimali Azərbaycan ərazisindəki ləzgidilli, Cənubdakı irandilli əhalini assimilyasiyaya uğradaraq türkləşdirmişlər. Bu cür düşüncə, yəni Şimali Azərbaycan əhalisinin ləzgidilli, Cənubun irandilli, türklərin isə assimilyasiya nəticəsi və gəlmə olduğu barədə fikir qəsdən və türkə yaramaz münasibətlə də bağlı ola bilər. Amma bizim fikrimizcə, bu, hər şeydən əvvəl, savadsızlıqla, bəşər tarixinə, bəşərin inkişaf yoluna bələd olmamaqla bağlıdır. Hələ də bir çoxları nəzərə ala bilmir ki, bəşərin doğuluşu Ön Asiya–Aralıq dənizi hüdudları ilə bağlıdır – vahid dil, ulu insan burada doğulmuş, Yer üzünə buradan yayılmışdır. Ulu dil tipoloji cəhətdən fərqlənən dillərə burada parçalanmışdır. Türklər Ön Asiyanın əzəli və əbədi sakinləri olmaqla yanaşı, şimala, şərqə və qərbə buradan yayılmışlar. Hindavropalılar da Yer üzünə buradan yayılmışlar, samilər, qafqazdillilər və başqaları da. Türk qolunun bir hissəsi Ön Asiyadan ayrılıb Şərqə getdikdən sonra monqolları, tunqusları, yaponları, koreyalıları və lap elə çinliləri də doğurmuşdur. Nə üçün Ön Asiyada türk var, monqol yoxdur, türk var, çinli yoxdur? Deməli, mezolitdən sonrakı dövrlərdə Şərqə üz tutan əhali uzaq ərazilərdə bir-birindən təcrid olunaraq parçalanma prosesini minilliklər ərzində davam etdirmiş, yeni nəsillər əmələ gətirmişdir.

Bu, belədir və dəqiq tarixi prosesdir. Bizim araşdırdığımız məsələ isə nisbətən konkretdir: Böyük Türk Xaqanlığını yaradan, onun başında duran «500 evlik Aşina ailəsi» - Bumın kağanın, İstəminin qəbiləsi e.ə. I minilliyin sonlarında Çinin şimalına və oradan Altaya Azərbaycandan getmişlər. Bu fikir özlüyündə çox mühüm tarixi hadisənin izahından ibarət olub, aşinalıların adət-ənənələri, ictimai-siyasi görüşləri, dini baxışları, mif və totemləri və xüsusilə onların dilində işlənən ictimai-siyasi leksikanın köməyi ilə təsdiq olunur.

Qədim misilsiz abidəmiz olan «Kitabi-Dədə Qorqud»un 1300 illiyini qeyd etdik. Hətta 1500 illiyinə də cürət etmədik. Bu və ya digər bir halda dastanın daha qədim olduğunu söylədikdə yüz yerdən «əsas» soruşulur və naşı gözlər dərhal hücuma keçirdi. Budur, e.ə. XIII əsrin hadisələrindən bəhs edən Homer poemaları «İliada» və «Odisseya» ilə müqayisələr göstərir ki, «Kitabi-Dədə Qorqud» Homerin yaşıdıdır və bu cəhət o qədər zəngin faktlarla təsdiq olunur ki, təkzibi heç cür mümkün deyil. Troyalıların türk, Troyanın türk şəhəri olduğunu göstərən faktlar isə misilsizdir[1].

Düşünürük ki, hörmətli oxuculara təqdim etdiyimiz bu kiçik yazı ümumtürk tarixinin düzgün tədqiqi üçün həqiqi tarixçilərə kömək olacaqdır.

[1] Bax: Q.Kazımov. Homerin poemaları və "Kitabi-Dədə Qorqud", Bakı, "Təhsil" nəşriyyatı, 2006.

Bizim «Azərbaycan dilinin tarixi» (bax 1) əsərimizin meydana çıxmasını şərtləndirən amillərdən biri dünya tarixinin verdiyi faktlar və arxeoloji materiallar əsasında insanın Yer üzərinə Ön Asiyadan yayıldığını xatırlatmaq idi. Bu cəhətin düzgün dərk olunması ilə dünya tarixinin tədqiqinə dair bir çox yanlış konsepsiyalar təbii şəkildə öz əhəmiyyətini itirmiş olur. Biz həmin ideya əsasında türklərin şərqə, şimala və qərbə Ön Asiyadan yayıldığını bir daha faktlaşdırmış olduq. Tədqiqatçılar əksəriyyət etibarilə türk tayfalarını Orta və Mərkəzi Asiya ilə bağlamağa çalışmış və bir çoxları başqa cür düşünməyi ağıllarına belə gətirməmişlər. Lakin bəşər tarixi aydın şəkildə sübut edir ki, miqrasiyalar mezolitdə Ön Asiyadan və Aralıq dənizi hüdudlarından başlamış, insan yer üzünə Avropanın, Afrikanın və Asiyanın qovuşduğu bu ərazidən yayılmışdır. Sonralar əks miqrasiyalar da olmuşdur. Bunlar qeyd etdiyimiz kitabda bizim tərəddüdsüz qənaətimizdir və bu barədə artıq söz söyləmək fikrində deyilik.

Bu məqələdə isə bizi bir neçə sual maraqlandırır: nə üçün bütün türk xalqlarının adı var, lakin yalnız bizim dilimiz keçən minillik ərzində «türk dili» adlanmışdır? «Türk» adı harada və bizə məlum olan tarixin hansı dövründə meydana çıxmışdır? Böyük türk xaqanlığının – o xaqanlıq ki, çin imperatorlarını «cənubdakı bizim uşaqlar» adlandırırdılar (2, 3) – əsasını qoymuş köçəri Aşina tayfası ilə Azərbaycan əlaqələri barədə nə demək olar? Bu suallara cavab vermək üçün Lev Qumilyovun «Qədim türklər» əsərindəki faktlar bizim üçün müqayisə mənbəyi olmuşdur.

Hər şeydən əvvəl qeyd edək ki, böyük türk xaqanlığının əsasını qoymuş «500 evlik Aşina ailəsi» və bu ailənin rəhbərlik etdiyi, öz arxasınca apardığı türklər Qumilyovun əsərində aşinalıların o dövrdə adlandığı kimi «türküt» adlandırılmış və bununla Orta və Mərkəzi Asiyadakı başqa türk tayfalarından fərqləndirilmişdir.

Əvvəlcə, «500 ailəlik» Aşina tayfasının öz əcdadları barədə əfsanələrinə diqqət yetirək. Şəcərələrin öyrənilməsi, Qumilyovun yazdığına görə, ən qədim zamanlardan Mərkəzi Asiya xalqları üçün səciyyəvi olmuşdur. Həm də maraqlıdır ki, həmin xalqlar bu və ya digər vəhşi heyvanı öz nəsillərinin banisi saymışlar. Məsələn, «…tibetlilər erkək meymunu və dişi rakşası (meşə ruhu), monqollar boz qurdu və maralı, telelər canavarı və hun şanyuyunun qızını, türklər isə hun şahzadəsini və dişi canavarı öz əcdadları sayırdılar». (3, 30) Buradan aydın göründüyü kimi, monqollar, telelər və türkütlər qurdu (canavarı) və maralı öz əcdadları hesab etmişlər.

Maral sonrakı hadisədir – Sibir çölləri ilə bağlıdır və türklərdə həlledici əhəmiyyətə malik deyildir. Qədim türklərin bayrağında daim qızılı rəngli qurd başı təsvir edilmişdir. Qumilyov ***seryy volk, volk*** və ***volçitsa*** sözlərini işlətmişdir. (3, 22) Monqolların, telelərin boz qurda, türklərin dişi canavara tapınması elə bir fərq yaratmır. Deməli, bu xalqların əfsanəvi əcdadı bir olmuşdur. Bu birlik onların kök birliyindən irəli gəlir. Türklərin və monqolların bir kökdən olduğuna heç kim şübhə etmir, lakin onlardan hansının hansından ayrıldığı barədə mübahisə hələ də davam etməkdədir.

Tobalıların (çinlilərin) Şimali Çinin fəthi zamanı tabe etdikləri tayfalar içərisində «beş yüz Aşina ailəsi» də qeyd olunur. IV əsrdə hunların və syanbilərin (monqolların) çinlilərdən aldıqları Şensi əyalətinin qərb hissəsində məskunlaşmış bu ailə «müxtəlif tayfaların qaynayıb-qarışmasından» yaranmışdı.(3, 30) Türküt əhalisinin «…etnik mənşəyi müxtəlif idi, lakin öz aralarında hamısı kiçik tələffüz fərqi olan ümumi türk dilində danışırdılar. Onlar bir «budun» - xalq təşkil edirdilər, lakin bu söz «etnos» deyil, daha çox «demos» anlayışına yaxın bir mənada işlənirdi. Çünki «budun» «bəylər»ə qarşı qoyulurdu». (3, 72) Müəllif bunu «türk bəglər budun» - «türk bəylərinin xalqı» ifadəsi ilə düzgün əsaslandırmışdır. Bu sözlər də göstərir ki, əslən türk olan hunlar və monqollar özlərini bir-birinə daha yaxın saymaqla çinlilərə qarşı birlikdə mübarizə aparmışlar.

Şensi vilayətinin qərbindəki Xesidə yerləşən aşinalılar həmin ərazinin işğalı zamanı tobalıların (çinlilərin) təbəəliyini qəbul etməmiş, Altayın mərkəzi hissəsinə köçmüş, uzun müddət səssiz-səmirsiz yaşamış, sonralar jujanların vassalı olduqlarını elan etmişlər. Çin mənbələri onların bu vaxta qədər «mağarada» yaşadıqlarını qeyd etmişlər. «Mağara» Altayın mərkəzində yerləşmişdi. Maraqlıdır ki, adi dağ dərəsi «Suyşu»da (Çin mənbəyi) «mağara» adlandırılmışdır.(3, 96) Beləliklə, Aşinanın «500 ailəsi», gələcək əyanlar V əsrdə Ordosdan köçüb artıq türkdilli əhalinin yaşadığı Altayın cənub ətəklərində məskən salmalı olmuşlar. (3, 93)

Qumilyovun qeydlərinə görə, türküt xalqı bu dövrdə yeni keyfiyyətlər qazanır, Altay dağlarına qovulduqdan sonra davakar köçəri heyvandarlardan azadlıqsevər, oturaq həyat keçirən heyvandarlara çevrilirlər. (3, 208)

Qumilyov yazır: «Həmin tayfa birləşməsi (müəllif Aşinalıları bir neçə tayfanın qarışığı sayır – *Q.K.*) ilkin dilinin necəliyindən asılı olmayaraq, V əsrdə o, tarix səhnəsinə qədəm qoyanda dövrün tayfalararası ünsiyyət vasitəsi olan syanbi – yəni qədim monqol dili tayfaların hamısı üçün anlaşıqlı idi. Bu, komanda, bazar, diplomatiya dili idi. Bu dildə *Aşina nəsli 430-cu ildə Qobinin şimal həndəvərinə köçmüşdü*». (3, 31)

Göründüyü kimi, müəllif monqol dilinin üstünlüyünü, tayfalararası ünsiyyət vasitəsi olduğunu göstərir. Bu, ağlabatan deyil, aşinalıların məhz bu dildə – monqol dilində Qobinin şimal həndəvərinə köçdüyü barədə fikir elmi əsası olmayan fikirdir. Ola bilər ki, belə bir dövrdə monqollar və türklər təzə təcrid olunduqları üçün bir-birini asan anlamışlar. Lakin Aşina tayfasının monqol dili ilə Qobinin şimal həndəvərinə köçməsi və 100 il

sonra təmiz və zəngin türk dili ilə danışması, bu dildə misilsiz abidələr yaratmağa başlaması barədə fikirlər heç cür ağlabatan deyil və müəllifin daha qədimləri görə bilməməsi ilə bağlıdır. Bütün Şərqə və Qərbə yayılmış türklərlə çox seyrək olan syanbiləri-monqolları müqayisə edib, türklərin monqol tayfalarından təcrid olunması qənaətinə gəlmək heç bir məntiqə sığmır. İnsanın Yer üzünə Ön Asiyadan yayıldığını və Ön Asiyada monqol izlərinin olmadığını nəzərə aldıqda monqolların Orta və Mərkəzi Asiyaya gedən türklərdən ayrılmış olduğuna şübhə etməmək olar.

Qumilyovun monqol üstünlüyü, monqol birinciliyi barədə fikirləri davam edir: «Çinlilər Aşina xanlarının təbəələrini *Tu-kyu* adlandırırdılar. Bu söz Pelyo tərəfindən «türküt» - yəni «türklər» kimi uğurlu şəkildə açılmışdır. Lakin sözün sonundakı çoxluq bildirən şəkilçi türk deyil, monqol mənşəlidir. Qədim türk dilində bütün siyasi terminlər monqol cəm şəkilçisi ilə yaranırdı. Bu isə güman etməyə əsas verir ki, həmin sözlər türk dil mühitinə kənardan gətirilirdi».(3, 31).

L.Qumilyovun bu fikri tamamilə yanlışdır. ***–üt,-at*** cəm şəkilçisi monqollardan neçə min il əvvəl Ön Asiya xalqlarının, o cümlədən qədim Azərbaycan tayfalarının (kuti, kassit, lullubi, turukki və s.) və Manna, Midiya xüsusi adlarının tərkibində işlənmişdir. *Kuti* sözündəki *–ti* haqqında danışılan şəkilçidir–söz *kular* mənasını ifadə edir. (1, 210) ***Skol-ot, massaq-et*** sözlərindəki ***-at, et*** də eyni şəkilçidir. Bu şəkilçi ulu dildən gələn bir şəkilçi kimi bütün iltisaqi dillərdə mövcud olmuşdur, Hami-Sami dillərində də yayılmışdır. Odur ki Aşina tayfasının dilinə monqol dilindən keçməsi barədə fikir doğru ola bilməz. Ona görə də müəllif «Qədim türk dilində bütün siyasi terminlər monqol cəm şəkilçisi ilə yaranırdı» sözlərində və bu cür sözlərin kənardan gətirilmə olması barədə fikrində tam yanlış mövqe tutmuşdur. Monqollar kəmiyyət etibarilə türklərdən daim qat-qat az olmuşlar və monqolların türklərdən ayrılması barədə Poppenin fikri son dərəcə ağlabatandır.

Budur, L.Qumilyov fikrini dərinləşdirərək yazır: «Aşinanın adı ilə birləşən həmin «beş yüz ailə» mənşəyindən asılı olmayaraq, hərbi müvəffəqiyyətin dəyişkənliyi onları Çindən Altaya atana qədər öz aralarında monqol dilində danışırdılar. Lakin türkdilli mühitdə yüz il qalmaları, təbiidir ki, danışıq dilinin tezliklə dəyişməsinə gətirib çıxarmalı idi. Onu da nəzərə almaq lazımdır ki, ***«Aşinanın beş yüz ailəsi» türk dənizində bir damla idi*** (fərqləndirmə mənimdir – *Q.K.*). Güman ki, VI əsrin ortalarına doğru Aşina nəslinin üzvləri tamamilə türkləşmiş, monqoldilliliyin əlamətlərini yalnız özləri ilə gətirdikləri titullar sistemində saxlamışdılar».(3, 34)

Heç kəsi inandırmaq olmaz ki, 100 il ərzində bir tayfa öz ana dilini unudub türk dilini aşinalılar qədər dərindən mənimsəmiş olsun. Yenə qeyd edirik ki, arada yalnız türk–monqol yaxınlığı, bir-birini anlama ola bilərdi. O böyüklükdə abidələr qoyub getmiş xalq başqa bir dilin yetirməsi ola bilməzdi, odur ki aşağıdakı sözlər heç bir etibar doğurmur: «İndi türk dilləri adlanan dillər ən qədim zamanlarda meydana gəlmişdi, türküt xalqı isə V əsrdə… Gəlmələrin yerli əhali ilə qaynayıb-qarışması o qədər güclü olmuşdur ki, artıq 100 il sonra – 546-cı ildə onlar qədim türk xalqı, yaxud türküt adlandırılan vahidə çevrilmişdilər». (3, 4) Sonrakı qeydlərimiz də göstərəcək ki, bunlar əsassız söhbətlərdir. Qumilyovda sövqi-təbii türkütlərin qərbdən gəlmə duyğusu var, lakin türkün yer üzünə qərbdən yayılma duyğusu yoxdur.

Qumilyovun əsərində aşinanın tarixi, dili və nə üçün daim «köçərilər» adlandırıldığı obyektiv izahını tapa bilməmişdir. Nə vaxtsa, monqol dilinin türklər üçün də ümumünsiyyət vasitəsi olması isə xəyali fikirlərdəndir.

İndi biz Aşinanın türk mənşəyi barədə əqli və nəqli dəlilləri nəzərdən keçirəcəyik. Görək aşinalılar haradan gəlmişlər, kimdirlər və nə üçün daim türk və monqol tayfaları arasında «köçərilər» adı ilə tanınmışlar?

«Umiyakov ehtimal edir ki, «türk» sözü XII-XIII əsrlərdə türklərin ümumi adından başqa, həm də çox ehtimal ki, «**bundan əvvəl də *ayrılıqda götürülmüş bir türk tayfasının adını bildirirdi***» (fərqləndirmə mənimdir – *Q. K.*). Şübhəsiz ki, bu, belədir. Bizim təklif etdiyimiz şərti «türküt» termini hətta E.Şvann kimi bir analiz nəhənginin də qurban getdiyi anlayış və kənara çıxma dolaşıqlığından xilas olmağa imkan verir». (3, 180) Müəllifin burada gətirdiyi sitat və öz qənaəti doğrudur.

Dedik ki, müəllif Aşina türklərini xüsusiləşdirmək üçün «türküt» terminini (onların öz adını) seçmiş, türk xaqanlığını yaradan türkləri başqa türklərdən fərqləndirməyə nail olmuşdur. Və eyni zamanda aşinalıların mənşəyi ilə bağlı əfsanəni nəzərdən keçirərək çox düzgün nəticə çıxarmışdır: «…biz bir əfsanənin mətni daxilində iki süjetin kəsişməsi – mifoloji (mənşəyini dişi canavardan götürmək) və tarixi (türkütlərin bir hissəsinin əcdadlarının Altaydakı dağ vadilərinə qaçması) ilə qarşılaşırıq». (3, 96) Məlum olan birinci məsələdən (dişi canavar) fərqli olaraq, ikinci məsələ (türkütlərin Altaydakı dağ vadilərinə qaçması, daha doğrusu, Altay ərazilərinə gəlməsi) köklü və maraqlı məsələdir. Lakin qeyd edilən qaçıb gəlmə prosesinin ilkin nöqtəsi – başlanğıcı Qumilyov üçün tam şəkildə məchul və qaranlıqdır. Müəllif başlanğıcın Ön Asiya olduğunu qətiyyən ağlına gətirmir.

«Aşina Ordosdan qərbdə, Xuanxe və Nanşan çayları arasında yerləşən Xesinin hakimi, hun knyazı Muğana tabe idi. 439-cu ildə tobalar hunlara qalib gələrək Xesini Vey (Çin) imperiyasına birləşdirəndə knyaz

Aşina «beş yüz ailə» ilə jujanların yanına qaçdı və Altay dağlarının cənubunda məskunlaşaraq jujanlar üçün dəmir emal etməyə başladı». (3, 31; 4, 221) Bu sözlərdən aydın olur ki, Aşina haqqında ilkin məlumata görə, aşinalılar V əsrin əvvəllərində hun tayfaları tərkibində olmuş, çinlilər Xesi ərazilərini işğal edərkən Çin asılılığından imtina edərək V əsrin ortalarında Altay dağlarının cənubuna – türk tayfaları olan əraziyə qaçmış və o dövrün bir qədər irticaçı sayılan türk tayfası jujanların asılılığını qəbul etmiş, onlar üçün dəmir istehsal etməyə başlamışlar. Qısası: ən pis türk asılılığını Çin əsarətindən üstün tutmuşlar. Burada bizim üçün ən qiymətli məlumat tobaların-çinlilərin işğal etdiyi Xesinin hun hakiminin ***Muğan*** titulu daşımasıdır. Aşina «Hun knyazı Muğana tabe idi» sözlərindən aydın olur ki, Aşina tayfasının da daxil olduğu bu knyazlığın hakimləri ***Muğan*** titulu daşıyırlar. Bu knyazlıqdan ayrıldıqdan sonra Aşina hakimləri də bu titulu daşımışlar. Deməli, knyaz Muğana tabe olan tayfalar qohum tayfalardır. Əgər Aşina tayfası Muğanın knyazlığında bir sıra tayfalarla təsadüfi birləşmiş olsa idi, Aşina hakimləri ***Muğan*** titulu daşımazdılar. Misallara diqqət yetirək.

552-ci ildə Bumın xaqan öldükdə yerinə oğlu Qara İssık xan keçir. O da tez ölür və hakimiyyətə Qara İssık xanın qardaşı (Bumının kiçik oğlu) Kuşu çıxır. Kuşu Muğan xan titulunu qəbul edir (3, 48) «Bu xanın aşağıdakı adları vardı: vəhşi heyvan adı- Tszuşu (yəni Kuşu - Quş), nəsil adı – Sıqin (yəni nəvə, qardaş oğlu), ləqəbi – Yandı (yəni qalib), titulu – Muyuy, yaxud Muğan. Biz elmi ədəbiyyatda daha çox işlədilən sonuncu addan istifadə edirik». (3, 38) «554-cü il knyazlığın imperiyaya çevrilməsi ili idi… Muğan xan artıq öz şimal sərhədlərini möhkəmləndirmişdi».(3, 40) – cümləsi və əsər boyu qeyd edilən bir sıra adlar da göstərir ki, ***Muğan xan*** işlək titul olmuşdur.

Aşinanın əvvəlcə tabe olduğu hun knyazı da *Muğan* titulunu daşıyır, Aşina hakimləri də. Deməli, təklikdə Aşina deyil, böyük hun knyazlığı bu titulun daşıyıcıları olmuşlar. Tədqiqatçılar bunları üzə çıxarmışlar, lakin təəccüblü orasıdır ki, bu titulun haradan yarandığına əsla fikir verməmişlər.

***Muğan*** sözü necə əmələ gəlmişdir? Harada yaranmışdır? Muğan haradadır? Və nə üçün bu suallara cavab axtarılmır?

Məlumdur ki, Muğan cənublu-şimallı Azərbaycanın ən qədim ərazisidir. Muğan müğlərin, mağların yaşadığı ərazidir. Mağlar Azərbaycanın və dünyanın ən qədim mədəni tayfalarındandır – türkdilli Azərbaycan tayfasıdır. (1, 258-272) Aşina hakimlərinin Muğan titulu daşıması iki çox mühüm məsələni aydınlaşdırmağa kömək edir: Muğan titulu daşıyanlar hunlar-türklərdir, deməli, mağlar türk tayfalarındandır; ikincisi, mağların vətəni Azərbaycandır, deməli, Muğan titulu daşıyan Xesi hunları və o cümlədən aşinalılar Mərkəzi Asiyaya Ön Asiyadan – Azərbaycandan gəlmişlər. Ərəb mənbələrinin məlumatına görə, Xəzərin cənub-qərbində yerləşən türk tayfaları öz hakimlərini *Muğan xan* adlandırmışlar.

Qumilyov yazır: «Qaçqınların gəlib çıxdıqları Monqolustan Altayının ətəkləri hunlardan törəyən və türk dilində danışan tayfalarla məskunlaşmışdı. Knyaz Aşinanın drujinası da həmin aborigenlərlə qaynayıb-qarışdılar və onlara «türk», yaxud «türküt» adı verdilər».(3, 33)

Kim verdi, niyə verdilər bu adı onlara?–Bunlar Qumilyov üçün aydın deyil. Bu barədə bir qədər sonra danışacağıq. Hələlik başqa bir məsələyə diqqət yetirək, yuxarıda verdiyimiz bir cümləni yenə xatırlayaq: «***Aşinanın beş yüz ailəsi» türk dənizində bir damla idi***». (3, 34) Deməli, Altayın ətəkləri türk tayfalarından ibarətdir; aşinalılar bunlara münasibətdə «qaçqın» və ya «köçəri» hesab olunur və nəhayət, aşinalılar türk dənizində bir damladır. Görünür, bu məsələlər yaxşı öyrənilməyib, çünki digər tərəflən də L.Qumilyov özü qeyd edir ki, çinlilər türkütləri «*ağacın kökü»,* qalan tayfaları isə *«yarpaqlı budaqlar» hesab edirdilər».* (3, 284) Bu sözlər göstərir ki, köçərilər (türklər-türkütlər) nazik və kövrək fidan kimi o qədər də zəif olmamış və müxtəlif bölüklərdən ibarət olmuşlar.

Aydın olur ki, Orta və Mərkəzi Asiya çoxdan türk yurdudur, yəni Ön Asiyadan bu yerlərə köçən türklər, bəlkə, öz köçmə tarixlərini də unutmuşlar. Lakin aşinalıların gəlmə tarixi o qədər də uzaq deyil, ona görə də onlar qaçqın hesab olunurlar. Ətraf hamısı türk aləmidir və qaçqınlar - köçərilər onların arasında bir damla kimidir. Bu müəmmada mühüm məsələ aşinalıların haradan gəlməsi məsələsidir. Haradan və nə vaxt gəlmişlər? Nə üçün gəlmişlər?

Köçəri həyatına başlanmasının və bir çox tayfaların öz yurdlarını dəyişməsinin səbəbləri çoxdur. Bu cəhəti Qumilyov özü də yaxşı izah etmişdir: «…örüş və otlaqların məhdudluğu, ən başlıcası isə suyun çatışmaması köçəriləri öz sürülərini bölməyə məcbur edirdi. Nəticədə köçəri həyat keçirən ailələr də bölünməli olurdular. Otlaqların bölünməsi və onların sərhədlərinə ciddi nəzarət köçərilərin örüş, suvat və ov yerləri üçün qaldırdıqları amansız qardaş qırğınının qarşısını almaqdan ötrü yeganə vasitə idi». (3, 87) Düşmən tayfalarla amansız müharibələr də köçəriliyə səbəb ola bilirdi. Təbii ki, Aşina ailəsinin Orta və ya Mərkəzi Asiyaya gəlişi də bu səbəblərdən biri ilə bağlıdır, lakin onların bu yerlərə nə vaxt gəldikləri barədə L.Qumilyovun fikirləri ziddiyyətlidir.

Dediyimiz kimi, aşinalıların mənşəyi haqqında iki əfsanə vardır. Daha tipik olan birinci əfsanədə deyilir ki, qonşular bu nəsli qırıb-qurtarmış, yalnız 9 yaşlı bir oğlan xilas olmuşdur. Düşmənlər onun əllərini və ayaqlarını kəsərək bədənini bataqlığa atmış, burada dişi qurd həmin oğlandan hamilə olmuşdur. Dişi qurd

Altaya qaçıb orada on oğul doğmuşdur. Onlar artıb çoxalmış və «bir neçə nəsildən sonra Asyan-şe adlı birisi bütün aymağı ilə mağaradan çıxaraq özünün Jujan xanının vassalı olduğunu etiraf etmişdi.

Qumilyov göstərir ki, əfsanələrin ikisi üçün də səciyyəvi cəhət onların hər ikisində tarixi hadisəyə – Aşina ordasının Qansudan köçməsinə kiçicik bir işarənin olmamasıdır. «Ona görə də əfsanələrin Altayda meydana çıxdığını, bəlkə də gəlmələrin müstəsnalıq hüququnu əsaslandırmaq üçün məxsusi olaraq yaradıldığını düşünmək mümkündür». (3, 32) Buradakı son fikir yenə əsassızdır. Aşina ordasının Qansudan köçməsinə dair heç bir işarənin olmaması tam təbiidir. Müəllifin buna təəccübünə səbəb bəşərin inkişaf və yayılma istiqaməti barədə xəbərsizliyidir. Əfsanənin Altayda müəyyən məqsədlə məxsusi yaradılması fikri də doğru ola bilməz. Bir yerdən başqasına köçməklə, həm də o qədər uzaq olmayan bir məsafəyə, yeni əfsanə yaranmazdı. Əfsanə, fikrimizcə, tam köklü əfsanədir və tayfanın haradan gəldiyini dəqiq şəkildə bildirməkdədir. Elə birinci əfsanənin maraqlı cəhəti aşinalıların əcdadları barədə məlumat verilərkən onların «***Qərb ölkəsindən qərbdə yaşayan hunlar evinin nəsli***» kimi səciyyələndirilməsidir. (3, 32) Müəllif bu məlumatı bir məqamda Attila ilə əlaqələndirməyə çalışmış və V əsrə aid etmişdir. «***Qərb ölkəsindən qərbdə yaşayan hunlar***» – sözləri ikiqat qərb anlayışı bildirir; birincisi Altayın qərbidirsə və burada Qərbi türk xaqanlığının yerləşdiyi ərazilər (Altaydan Xəzərə qədər) nəzərdə tutulursa, ikincisi bu qərbin qərbidir. Bu «qərbin qərbi» isə artıq Ön Asiya əraziləridir. Dediyimiz kimi, Qumilyov «qərb hunları» dedikdə bir məqamda Attilanı nəzərdə tutur və çox məntiqsiz bir müqayisə apararaq yazır: «Beləliklə, bu əfsanəyə görə Altay türkləri-tukyular (türkütlər) mənşəcə Qərb hunlarından törəmişlər». «…nəzərə alsaq ki, Qərb hunları 468-ci ildə məhv edilib, türklər isə xalq kimi artıq 545-ci ildə tarix səhnəsinə gəliblər, onların artım sürətinə və nəsillərin bir-birini əvəzləməsinə yalnız heyrətlənmək olar». (3, 32) Aşina 430-cu ildə Qobinin şimal həndəvərinə köçübsə, bunun 468-ci ildə məhv edilən Qərb türkləri - Attila hunları ilə nə əlaqəsi ola bilər? Amma Qumilyovun «qərbin qərbi»ni Cənubi Avropada, Bizans ətrafında, Xəzərin şimal sahillərində, Qara dəniz ətrafı ərazilərdə düşünməsi onun sövqi-təbii duyğularının üstünlüyünü təsdiq edir. Beləliklə, bu türklər Attila türkləri ola bilməzdi. Bunu müəllifin aşağıdakı sözləri də təsdiq edir: «Bölgə sisteminin prototipi çox güman ki, II əsrdə cənubi hunlar arasında mövcud olmuş taxt-tac varisliyi idi: V əsrdə Aşina nəsli knyazlarının əcdadları onlarla ünsiyyət saxlamışdılar». (3, 73) Yəni müəllif demək istəyir ki, aşinalıların quruluş sistemi II əsrin cənub hunlarının quruluş sisteminə uyğun idi. Bu sözlər də Aşina ictimai quruluşunun Attila hunları ilə əlaqəsini inkar edir.

Qumilyov qonşular tərəfindən aşinalıların qırılması əhvalatını 93-cü ildə şimal hunlarının məğlubiyyəti ilə də əlaqələndirmişdir: «Həqiqətdə də bu tarixi süjet (tayfanın qırılması, 9 yaşlı oğlanın qalması və dişi canavar əhvalatı – *Q.K.*) müsəlman müəlliflərindən Rəşidəddinin, Xondəmirin, Əbülqazinin əsərlərində bütöv şəkildə göstərilmişdir – Ərkənə kun – yəni sərt eniş. Çox güman ki, biz burada qədim tarixi hadisənin – 93-cü ildəki məğlubiyyətdən sonra şimal hunlarının Tarbaqatay keçidindən getməsinin və onların bir hissəsinin daimi yaşamaq üçün Altayda qalmasının əksi ilə qarşılaşırıq».(3, 97)

Nəhayət, müəllif özü də əfsanənin göstərilən tarixlərə uymadığını qeyd edərək yazır: «Uyğurların və Aşina ordasının sözün həqiqi mənasında totemist olduqlarını iddia etmək böyük risqə yol vermək demək olardı. Çünki mənbələrdə onların canavara xüsusi münasibətləri barəsində heç nə deyilmir. Lakin biz burada həmin heyvana totem sitayişinin qədim izlərini görürük, öyrəndiyimiz dövrdə isə bu artıq əcdadlara sitayişə çevrilmişdir». (3, 97)

Deməli, əcdad məsələsində totem əsasdır, lakin təsvir edilən zamanda tayfanın dini görüşlərində totemizm yoxdur. Bu, o deməkdir ki, totem-əcdad məsələsi təsəvvür edildiyindən çox-çox qədim dövrlərə aiddir. «B.X. Karmışeva güman edir ki, «türklər» Orta Asiyaya gəlmə türklərin nəsillərinə aiddir və onlar, ehtimal ki, karlukların əcdadlarından da daha əvvəl gəlmişdilər». Türkütlərin Orta Asiyaya gəlmə türklərin qədim nəsilləri olması barədə B.X. Karmışevanın qənaəti daha əsaslıdır.

Bütün dəlillər göstərir ki, aşinalıların Orta Asiyaya gəlmə tarixi Altayın aborigenləşmiş türklərindən sonrakı dövrlərə aid olsa da, eradan əvvələ aiddir. Bunu: «Türklər» özbəklərdən və qırğızlardan aralı gəzibdolanır, onlarla nikaha getmirlər. Bununla bir sırada «türklər» son zamanlara qədər özlərinin köçəri heyvandarlıq vərdişlərini qoruyub saxlamışdılar» (3, 179) kimi bir sıra başqa dəlillər də təsdiq edir.

Bu fikrin daha ətraflı sübutu üçün hər şeydən əvvəl, ***türk*** sözünün meydana çıxma tarixindən başlamaq lazımdır. ***Türk*** sözü ilk dəfə e.ə.XXIV əsrdə Assur yazılarında xatırlanır. ***Turukki*** şəklində özünü göstərən bu söz və bu adı daşıyan tayfa Ön Asiyanın – Azərbaycanın çox güclü tayfalarından biri olmuşdur. Yırtıcı assurlar uzun müddət onlarla bacarmamış, məcbur olub qohumluq əlaqələrinə əl atmışlar. Şumer-akkad yazılarında ***turuk/türük*** şəkillərində dəfələrlə xatırlanmışdır:

***Aşh-şhum awili mesh Tu-ru-ki-iki***…Aşum (məğlubiyyətim) iləməz Türükü ki… (Cinayət törətmək türkə başucalığı gətirməz ki…) (5, 258) Yaxud:

***um-ma a-na-ku-ma lu Tu-ru-ku-u ki***
***sha ki-ma-ish-tu ul-la-num i-la-ku-nim***

**Umma una ki malu Türükü ki**
**Saki maistü ulanum ilə künüm**

(Türkü mal yığan hesab eləmə, günüm elə olanım ilə də xoşdur) (5, 255-256; tərcümələr Nüvədilinindir; əlavə məlumat üçün bax: 1, 88-93)

İddia etmək olmaz ki, turukkilər məhv olmuş, dişi canavar əfsanəsində göstərildiyi kimi, onların nəsli totem yolu ilə – dişi canavarın köməyi ilə xilas ola bilmişdir. Ola bilər ki, tayfanın kiçik bir qolu – Xesidə knyaz Muğanın başçılıq etdiyi türklər həqiqətən qonşulardan biri ilə toqquşmada çoxlu itki vermiş və az bir qüvvə ilə Orta Asiyaya qaça bilmişdir və aşinalılar da bunların bir qoludur. Odur ki, şübhəsiz, ***Muğan*** titulu ümumi olduğu kimi, dişi canavar əfsanəsi də təkcə aşinalılara deyil, knyaz Muğanın bütün türklərinə-hunlarına aid olmuşdur. Lakin bu da məlumdur ki, eradan əvvəlki III və II minilliklər boyu turukkilərin (turukların) əsas qüvvəsi Azərbaycan ərazisində – öz vətənində yaşamış, Azərbaycan dövlət qurumlarının tərkibində olmuşlar. Azərbaycanda daim ***türk*** sözü, ***türk*** etnik adı, bu adla yaşayan tayfa üstün olmuşdur. Hətta o dərəcədə ki, aşinalılar böyük xaqanlıq yaratsalar da, sonralar bu adı saxlaya bilməmiş, lakin keçən minilliklər ərzində Azərbaycan türk xalqı daim ***türk*** adı ilə tanınmışdır. Çünki türk bu ərazidə kökdür, əsasdır. Orta Asiyada isə, nə qədər artıb çoxalmış olsa da, gəlmədir, köçəridir, qaçqındır. Əgər bütün tayfalar Orta və Mərkəzi Asiyaya Ön Asiyadan köçmüşlərsə (bu, artıq inkaredilməz tarixi faktdır), aşinalıların Ön Asiyadan – qərbin qərbindən gələn köçərilər və qaçqınlar olduğuna heç bir şübhə ola bilməz. Xəzərin qərbində yaranmış və möhkəm kök salmış bir etnonimin təzədən Xəzərin şərqində qəflətən meydana çıxması haqqında fikir qəsdən tarixi həqiqəti görməzliyə salmaqla bağlıdır. Bunlar göstərir ki, ***türk*** etnik adının tarixi çox qədimdir və bu söz aşinalıların Çin ərazilərindən Altayın ətəklərinə qaçması ilə yaranmamış, tayfa ilə birlikdə Ön Asiyadan gəlmişdir. Deməli, Çin mənbələri Xesi ərazisində olan hun-türkləri öz etnik adı ilə deyil, dövrün tayfa başçısına Çin hakimlərinin verdikləri adla qeydə almışlar. Bu, mümkün olan təbii haldır.

Qeyd edilən fikirlərin təsdiqi üçün ***yandı, baqa, irgen, tenqri*** sözlərini və bir sıra başqa faktları da nəzərdən keçirək.

***Yandı*** sözü, yuxarıda qeyd etdiyimiz kimi, L.Qumilyov tərəfindən «qalib» mənasını bildirən bir ləqəb kimi izah edilmişdir. Əslində isə bu söz mənşə etibarilə e.ə.III minillikdə şumer dilindəki ***ensi*** sözüdür. ***Ensi*** – kahin-hökmdar deməkdir. Məsələn, e.ə. XXIII əsrdə Laqaş hakimi Uruinimkina özünü əvvəlcə ***ensi*** (kahin-hökmdar), sonra ***luqal*** (hökmdar) adlandırmışdır. (1, 61) Bu söz isə mənşə etibarilə ***En*** (göy allahının adı) sözü ilə bağlıdır. Şumerlər bu sözü bizim mağlardan almışlar. Mağların dini hakimi də ***ensi*** adlanırdı. (1, 62-63) Söz bu mənanı daha əvvəllər yalnız ***en*** şəklində ifadə etmişdir. XXIII əsrdə İkiçayarasını işğal edən Kuti hökmdarı En-Ridavazir adında ***En*** kahin-hökmdar deməkdir.(1, 157) Söz Manna türklərində ***yanzi*** şəklində qeydə alınmışdır. Mannanın Allabria vilayət hakimi ***Yanzi-Buriaş*** adını (e.ə .843) xatırlamaq kifayətdir. III Salmanasarın salnaməsində deyilir: «Mən allabrialı Yanzi-Buriaşın möhkəmləndirilmiş Şurdira şəhərini…ələ keçirdim» (6, 197); ***z >d*** keçidi ilə ***yanzi*** sözünü qədim türklərdə *yandı* kimi oxumuşlar. Bəlkə də bu səs ***dz*** səsidir – ***Adzarbadakan*** sözündə olduğu kimi. Deməli, söz Orta Asiyaya çox qədim dövrlərdə şumer–Azərbaycan tayfalarından ayrılıb gedənlər vasitəsilə aparılmışdır.

***Baq/baqa*** sözü. ***İliqyuylu Şe Moxe Şabolo-İl Külüq-şad Baqa Işbara*** adının tərcüməsi: «Ölkənin şərəfli şadı, ilahi qüdrətli xan». (3, 57) Və ya: Qara İsık xanın oğlu Şetunun hakimiyyəti ələ aması və ***İl-külüq şad Baqa Işbara xan*** titulunu qəbul etməsi. (3. S. 127) Müəllif bu ada aşağıdakı kimi izah vermişdir: *Dövlətin (elin) şərəfli* ***şadı, ilahi (Baqa, bəlkə də böyük – maqa) Işbara (qüdrətli, amansız; Çin dilində Şabolo)*** (3, 127)

***Baq*** - Azəprbaycan tayfalarının dilində çox işlənən allah adı olmuşdur. Madanın qərbindəki Musasir ərazi hakimlərindən ***Baqmaştu, Baqbartu*** adlarını yada salmaq olar. Sözün kökü – ***ba*** (allah, bəy, kahin, rəis və s.) qədim Azərbaycan tayfalarının ümumişlək sözlərindən olmuşdur. Azərbaycandakı ***Bağastan*** adlı mərkəzi vilayətə İskəndərin gəldiyi məlumdur. ***b >m*** keçidi ilə ***mağ*** sözü, ***Manna, Mada*** kimi əzəmətli toponimlər də bu kökdəndir və bunlar Orta Asiya Aşina tayfa hakiminin özünü ***Baqa*** adlandırmasının təbiiliyini, onların Ön Asiya – Azərbaycan mənşəyini güzgü kimi əks etdirir. (bax:1, 265)

Aşinalılar ***irken*** sözü işlədirdilər. Qumilyov yazır: «A.N. Kononovun «irken» (***ir –*** ər***, kin*** – çoxluq şəkilçisi) termini ətrafındakı araşdırmaları göstərir ki, «Erkin-irqin» (hərfi mənada kişilər yığnağı) müstəqil anlayışdır, başqa sözlə desək, xana, bəyə münasibətdə budun olmaq mümkündür, xalq isə bir etnos kimi «kün» adlanırdı».(3, 75) Fikrimizcə, A.N. Kononov sözün mənasını düzgün açsa da, L.Qumilyov siyasi mənasını anlaya bilməmişdir. «Kişilər yığıncağı» qədim ali şuradır, ilkin ictimai təşkilatdır. Heç şübhəsiz, bu söz şumer dilindəki ***uqken*** – «xalq yığıncağı» sözünün varisidir. (7, 53-54) O.Süleymenov da bu sözü misal gətirmişdir.(8, 101) ***Uqu/uq*** – nəsil, ailə, ana mənasındadır; ***uq-ken*** – «yığıncaq» deməkdir; ***den-es/gen-eş*** – Şura, gənəşmək, yığıncaq mənasını verir.(2,138) Rəşidəddinin əsərində «***kənkeş (gənəş)*** *bəyləri*» ifadəsi də eyni mənada – hərbi demokratiya dövrünün arxaik siyasi qurumu mənasındadır. Tədqiqatçılar bizim «Dədə Qor-

qud»da da eyni təşkilatın «inaq bəyləri» adı ilə davam etməkdə olduğunu göstərmişlər. (9, 58,263) Bunlar göstərir ki, ***irkin*** sözünü aşinalılar Ön Asiyadan gətirmişlər.

Dini görüşlərə diqqət yetirək. Türküt xalqının dini görüşlərindən «Səma kultu – ***Tenqri*** Orxon kitabələrində də qeyd olunmuşdur».(3, 93) «Ondan başlamaq lazımdır ki, tele tayfaları da türkütlər kimi, əcdad-canavar haqqında əfsanəyə malik idilər: bu fikirdə idilər ki, onlar cavan oğlandan mayalanmış qurddan doğub törəyiblər, uyğurlar isə canavara təslim olmuş qızın nəslinə mənsubluqlarını zənn edirdilər. (***Qız onunla əlaqəyə girən canavarı Səmanın təcəssümü hesab edirdi*)**. İki paralel əfsanədə kişi və qadın başlanğıclarının nisbəti diametral əksdir və bu təsadüfi xarakter daşıya bilməzdi, çünki VIII əsrin dualist dünyagörüşündə cins simvolikası müəyyənedici prinsip idi. ***Səma ata, Yer isə ana sayılırdı* v**ə Səmanı türkütlər kimi insan, yaxud uyğurlar kimi vəhşi heyvan saymaq heç də bir-birinin eyni deyildi. Zahiri oxşarlıqlarına baxmayaraq, əfsanələrin paralelliyinin özündə nəzərə çarpdırılan bir əkslik var. Çox ehtimal ki, bu, təsadüfi deyildi, çünki paleantropologiya türkütlərin və uyğurların müxtəlifliyini təsdiq edir». (3, 215)

Bu misallarda aşinalıların Ön Asiya köçəriləri olduğunu sübut edən iki mühüm dəlil vardır. Birincisi ***tenqri*** sözü ilə bağlıdır. Bizim tarixçilər bu sözün uzağı e.ə. III əsrdə qeydə alındığını göstərmişlər. (10, 31) E.ə.1700-cü ildə Nippur şəhərində tərtib edilmiş iki şumer elegiyasında bu söz «dinqir» şəklində dəfələrlə işlənmişdir. Bir nümunə: ***98. dinqir-kur-ke, sud (= KA X SU)-de mu-ra [ah(?)-be(7)] – Boqi zaqrobnoqo mira budut [proiznositğ (?)] molitvı za tebə.*** (11, 18; 1, 446)

İkinci məsələ, yəni Səmanın ata, Yerin isə ana sayılması yenə şumerlərin ilkin dini görüşləri ilə bağlıdır. Şumer əfsanəsi belədir: İlk əvvəl bütün dünya suya qərq olmuşdu. Okean sularının dərinliyində bütün varlığın «böyük anası» sayılan ilahə Nammu yaşayırdı. Nammunun bətnindən yarımkürə şəklində dağ qalxmışdı. Dağın başında «böyük ata» allah An, dənizdə – yastıvarı lövhə üzərində ilahə Ki yaşayırmış. Onlar bir-birinə bitişik imiş… Bir gün Enlil (onların–An ilə Kinin oğlu) mis bıçaqla göy qübbəsinin qırağını kəsir, An zarıya-zarıya göyə qalxır və Kidən aralanır, dünyanın əzəmətli qalaydan yarımkürə örtüyü havadan asılı qalır. (bax: 12; 1, 144) Deməli, Tanrı anlayışı da, Səma və Yer allahı məsələsi də Orta Asiyaya Ön Asiyadan keçmişdir. Aşinalıların Göy allahını kişi, Yer allahını qadın kimi təsəvvür etmələri həm onların bilavasitə şumerlərin bir qolu olduğunu təsdiq edir, həm də əks əlaqəni - şumerlərin türk olduğunu əsaslandıran bir dəlil kimi çıxış edir.

**Tayfanın adı məsələsi**. «Aşina» sözünün mənası «canavar» deməkdir. Qonşular Aşina xanlarının adı ilə «qurd» sözünü sinonim kimi işlədirdilər: Syanbilərin hücum təlimatında deyilirdi: «Bu tədbirləri görmək lazımdır**:** ***köçərilərə*** hücum etmək və ***qurdları*** qovmaq».(3, 32) Qumilyov qeyd edir ki, türk dilində **canavara *buri,*** yaxud ***kaskır***, monqol dilində isə ***şono/çino*** deyirdilər; ***«a»*** çin dilində hörmət prefiksidir. Başqa sözlə, «Aşina» - «nəcib canavar» deməkdir. Sözün çin təsirinə məruz qalmayan ərəb variantı «Şane» kimi yazıya alınmışdır.(3, 31) Eyni əfsanə (canavardan doğulma) tele tayfası haqqında da qalmışdır. «Aşina ordaları kimi, bu tayfalar da Xalxuya Sarı çayın sahillərindən gəlmişdilər Əgər belədirsə, onda canavar-əcdada münasibətdəki totemistik ünsürün eyni qaynaqdan gəldiyini güman etmək tam təbii səslənir». (3, 97) «Beləliklə, VII əsrdə Altayda iki dini sistemin – Sibir xalqları ilə bağlı animizmin, habelə türk və monqoldilli köçərilərin böyük çölün cənub ucqarlarından gətirdikləri totemistik çalarlı əcdad kultunun mövcudluğunu görürük… Çin mənbələrindəki ***Buli –* «Buri»** deməkdir. Yeri gəlmişkən, bu adın «**Şeni» (Şono)** formasındakı monqol variantı da mövcuddur». (3, 97)

Nümunələrdən aydın olur ki, ***Aşina*** sözünün əsasında duran ***Şina/Şono/Şeni/Şane*** sözünü Qumilyov monqol sözü hesab etmişdir. Lakin biz monqol lüğətlərində bu sözün izlərinə rast gəlmədik. Şübhə doğuran bir cəhət də budur ki, sözün əvvəlindəki ***a*** prefiksinin çin dilinə aid olduğu göstərilir. Monqol sözünə çin prefiksi nə üçün artırılır? Türkütlərin bu adı daşıdığı ilkin ərazilər – Xesi Şimali Çin ərazisidir və əhali monqollarla qarışıqdır. Bu ad, şübhəsiz, kənar addır. Monqol dilində ***şine –* «yeni»** deməkdir; ***şine jil*** – «yeni il». Belə olduqda bu söz türk dillərindəki «yeni doğulmuş» mənasında ***ənik*** sözünə uyğun gəlir. Ərəb dilində ***şane,*** rus dilində ***şenok*** (it balası) şəklində işlənməsi göstərir ki, bu söz kök dildən – ulu dildən gələn bir sözdür. L.Budaqov ***ənik*** (gənc heyvan, it balası, şir balası), ***ənikləmək*** (küçükləmək) sözlərini işlətmişdir.(13, I. 103) V.V.Radlov ***ənik*** sözünün Osmanlı dilində yırtıcı heyvan balası (it, canavar) mənasında işləndiyini (14, I, 733) qeyd etmiş, ***anıkmaq*** felini «böyümək» mənasında izah etmişdir (14. I, 233). Sözün kökü ***ene, ana*** şəkillərində bütün türk dillərində yayılmışdır. E.Sevortyan ilkin formanı ***ana*** hesab etmiş**,** ***ene*** formasının nisbətən sonralar ***ana*** sözündən yarandığını qeyd etmişdir. (15, 279) ***Enik*** sözü müxtəlif türk dilləri və dialektlərində ayı balası, it balası, şir balası, goreşən balası, pələng balası mənalarındadır, ***yeni*** sözünü isə M.Kaşğari «doğmaq» mənasında izah etmişdir.(15, 282)

Bunlar göstərir ki, ***şina*** sözü ***ana*** sözündəndir***;*** ***ana*** sözündən ***eni/yeni*** («doğmaq») və ***yenək/ənik*** – «doğulmuş, körpə, balaca» sözləri yaranmışdır, tatar dilində «uşaq», «körpə» mənası da qalmışdır. (15,282) Söz təbii olaraq həm insana, həm də heyvanlara aid edilmişdir. Türkləri qurd və beləliklə qurd oğlu, qurd balası maraqlandırmışdır. «Çin

tarixçiləri «türk xanı» və «qurd» anlayışlarını sinonim sayır»dılar». (3, 32) «Aşina əslən «qurd» idi. Odur ki çox qədim əlaqənin mövcudluğu şübhə doğurmur». (3, 98)

Sözün ***şina/şono*** şəkli daha çox çin dilinə aid ola bilər. Qədim türkcədə sözün əvvəlində samitin düşdüyü məqamda çin dilində ***ş*** samiti işlənmişdir: türkcə İstəmi xaqanın adı çin dilində ***Şetemi*** şəklində qeydə alınmışdır.(3, 35) ***m>n*** keçidi ilə bu sözlər şumerdəki ***ama*** (ana), ***amar*** (əmər, bala) sözləri ilə eyni köklüdür. (1, 134) ***Aşina*** sözü abidələrdə yoxdur. Aşina – knyazın adıdır və tobalıların (çinlilərin) yazısında qalmışdır. Heç şübhəsiz, knyazın adı öz dilində belə olmamışdır.

Qumilyovun düşüncəsi: «F.Ratselin Mərkəzi Asiyadakı od kultunun zərdüştiliklə əlaqəsi haqqında ehtimalı da həqiqətdən uzaqdır. Çünki burada yalnız zahiri bənzərlik var. İranda möbülan-möbüd müqəddəs oda yaxınlaşarkən sifətinə örtük taxırdı ki, nəfəsi ilə odu murdarlamasın, türkütlərdə isə od vasitəsilə bəd ruhları, yəni dünyadakı ən şər qüvvələri qorxudurdular. Məsələ burasındadır ki, İranda od dini sitayiş obyekti, türküt tayfalarında isə magiya vasitəsi idi, yəni əslində onların arasında heç bir oxşarlıq müşahidə olunmurdu». (3, 103) Atəşpərəstlik Sasanilər İranında rəsmi dini dünyagörüş idi. Türklər sasanilərdən çox-çox əvvəl Ön Asiyadan ayrılıb getmişlər. İndinin özündə də bizim xalqda oda sitayişlə yanaşı, odun vasitəsilə bəd ruhları qovma düşüncəsi də vardır. Magiya isə Azərbaycan mağları ilə bağlı yaranmış, mağların yaratdığı cadugərlik nümunəsidir. Odur ki F.Ratselin fikrini yanlış hesab etmək doğru deyildir və bunlar aşinalıların dini görüşlərinin mənşə etibarilə Ön Asiya ilə bağlı olduğunu göstərir.

Qumilyov köçəriləri, yəni sonra gələn bu türkləri «yerli», yəni daha əvvəllər gələn türklərdən fərqləndirərkən bir mühüm cəhəti də qeyd etmişdir. Türkütlərlə yerli türklər geyimlərinə görə də fərqlənmişlər. Müəllif qəbirüstü abidələri – balballarıın quruluşunu nəzərdən keçirərək yazır: «Burada mühüm etnoqrafik əlamət – baş geyimi həkk olunmuşdur. Çöldə yaşayanlar ***şişuclu***, altaylılar isə yastı girdə papaq qoyurlar» (3, 307) Çöldə yaşayanlar – aşinalılar-köçərilərdir. Müəllif hətta dəqiq hesablamalar da aparmışdır: «…bizim öyrəndiyimiz 486 balbaldan 329-u şişuclu, 157-si yastıbaşlıdır». (3.307) Bu çox maraqlı detal türkütlərin Orta Asiyaya köçmə tarixi ilə bağlı bəzi detalları izah etməyə imkan verir. E.ə. I minilliyin əvvəlində (VIII əsr) Azərbaycan ərazilərinə ayaq qoyan köçəri sakların bir qismi şişpapaq saklar idi: «Mingəçevirdə aşkara çıxarılmış üzük-möhürlərin üzərindəki təsvirlər də sübut edir ki, torpaq qəbirlərdə dəfn edilmiş fərdlər sak-skiflərdir. Üzük-möhürlərdən birinin üzərində başında şiş papaq və əynində səciyyəvi sak geyimi olan sak-tiqrahauda təsvir edilmişdir» (6, 213-214) ***Tiqrahauda*** sözünü qədim fars dilində ***tiqra*** – iti və ***hauda*** – dəbilqə, dəmir papaq sözləri ilə izah etmişlər. Əslində isə ***tiqrah*** sözü türkcə ***dikrək*** sözüdür: dik, şiş.(1, 323) Çox mürəkkəb vəziyyət yaranır: Şişpapaq türklər eramızın V-VI əsrlərində Orta Asiyadadır. E.ə. VIII əsrdə isə onlar Qara dənizin şimal sahillərindən Ön Qafqaza enmişlər. Bu zaman onların qohumları olan Troya türkləri ellinlərə məğlub olaraq, şimalda Skandinaviya, qərbdə İtaliya ərazilərinə yayılmışdı. Demək, köçərilər Orta Asiyaya e.ə.VIII əsrdən çox-çox sonralar getmişlər. Və yenə deməli, Bumın kağanın ulu babaları olan şişpapaq saklar Ön Asiyada Homer dövrünün sakinləri idilər.

Bu cəhət skif vəhşi üslubunun mənbəyinin Ön Asiya olduğuna etiraz edənlərə də cavabdır.

Türklərin Altayda artıb-çoxalması barədə göz önündə olan faktlar doğrudur, lakin bütün yuxarıdakı faktlar türkün beşiyinin Altay hesab olunması barədə fikirlərin tam yanlış olduğunu sübut edir. Altayın türk əhalisi Ön Asiya miqrantları olmaqla yanaşı, ***Altay*** adının özü də Ön Asiyadan aparılmışdır. Türklər şərqə, şimala və qərbə hərəkət edərkən əksərən öz sevimli toponimlərini də özləri ilə aparmış və yaşatmışlar. E.ə. III minilliyin əvvəllərindəki (XXVIII əsr) ***Aratta*** tayfa və dövlət adı bir qədər sonra Azərbaycanın özündə də ***Alateye*** şəklində xatırlanır (16, 67) Maraqlıdır ki, Amur çayının bir qolu Kür, digər qolu Urmu adlanır. Keçmiş Meğri rayonu ərazisindəki Nüvədi kəndi yaxınlığında Sələnc çayı, Orta Asiyada Selenqa çayı vardır. ***Kaşğar*** sözünün əsasında kas (kaşşu) tayfa adı durur. Mannanın Allabria vilayətində dağ adı kimi xatırlanan ***Kaşyar*** sözü ***y>ğ*** keçidi ilə Kaşğar dağ adının etimon forması sayılır. (17, 343) Bu dağ da kasların adı ilə bağlıdır. Kaslar isə Ön Asiyada on min ildən çox tarixi olan tayfalardandır. Orta Asiya Kaşğarının böyük adamı Mahmud Kaşğari Kaşğarın Azıx kəndində doğulmuşdur. Azıx mağarası – bəşərin 10 böyük inkişaf mərhələsini əks etdirən mağara burda, kənd ordadır. Deməli, Kaşğarın əhalisi geniş mənada bizim Azıxdan çıxmışdır. (bax: 1, 189-190) Saysız Ön Asiya – Mərkəzi Asiya eyniköklü etnonimlərini də bura əlavə etmək olar və bunların hamısında ilkinlik, qədimlik Azərbaycana məxsusdur.

Beləliklə, «qərb ölkəsinin qərbindən» gəlməsi, «türk» adını Ön Asiyadan götürməsi, daşıdıqları adlar və titullar, dini görüşləri, geyimləri də göstərir ki, Orta və Mərkəzi Asiyada eramızın birinci minilliyinin ortalarında böyük xaqanlıq yaratmış və nəhəng abidələr qoyub getmiş türklər daha qədim Azərbaycan türklərinin övladlarıdır.

## Ədəbiyyat:

1. Kazımov Q.Ş. Azərbaycan dilinin tarixi (Ən qədim dövrlərdən XIII əsrə qədər). Bakı, «Təhsil» nəşriyyatı, 2003.
2. Rəcəbli Ə. Qədim türkcə-azərbaycanca lüğət. Bakı, Azərbaycan Milli Ensiklopediyası Nəşriyyatı, 2001.
3. Qumilyov L. Qədim türklər. Bakı, Gənclik, 1993.
4. Biçurin N.Ə. Sobranie svedeniy o narodax, obitavşix v Sredney Azii v drevnie vremena, M.-L., 1950, t.I.
5. Nüvədili T.V. Əcdad. Sietl, BA., ABŞ, 1997.

6. Azərbaycan tarixi. Bakı, Elm, 1998, I c.
7. Dəkonov İ.M. İstoriə drevney peredney Azii. M., 1967.
8. Süleymanov O. Az-Ya. Bakı, 1993.
9. Kitabi-Dədə Qorqud. Bakı, Yazıçı, 1988.
10. Azərbaycan tarixi üzrə qaynaqlar. Bakı, BDU Nəşriyyatı, 1989.
11. Kramer N. Dve şumerskie gleqii. M., izd.-vo Vost. lit., 1960.
12. Xrestomatiə po istorii Drevneqo Vostoka. M., 1963.
13. Budaqov L. Sravnitelğnıy slovarğ tureüko-tatarskix nareçiy, SPb., 1869, t.1.
14. Radlov V.V. Opıt slovarə törkskix nareçiy. SPb., 1898, t.I,1.
15. Sevortən G.V. Gtimoloqiçeskiy slovarğ törkskix əzıkov. M., Nauka, 1974.
16. Azərbaycan tarixi. Ali məktəblər üçün dərslik, Bakı, Azərnəşr, 1994.
17. Y.B. Yusifov. Qədim Şərq tarixi. Bakı, BDU Nəşriyyatı, 1993.

## Ashina and Azerbaijan

### Summary

In this article, the attempts his object to establish the origin and ancestral home of the "500 Ashina families ", that came to Altai and founded Great Turkic khanate in the VI-VIII centuries. For this purpose he uses the facts contained in Lev Gumilyev's book "Ancient Turks", in comparison with the historic-linguistic materials on the Front Asia and ancient Azerbaijan .

The legend of Ashina speaks about them as the newcomers "from west of western country". The "Western country" is the western turkic khanate up to the Caspian Sea, and west of this "West" is, naturally, Azerbaijan.

Turkic governors beared a title "Mugan", and Mugan was the territory of Midian priests, northern and southern Azerbaijan.

Turkuts received the name "Turk" not at all in Altai. It is known that the tribe "turukki" lived in Azerbaijan as far back as the III century B.S.

The Turkuts put on a cap with sharp edges. One part of Azerbaijan saks was named as "Saks-klobuks" (VIII century B.S.).

The small number among the aborigenals of this territory, and their naming as resettlers and refugees also show that the Ashinas were newcomers to Altai.

The known toponyms and hydronyms - Altai, Kashgar, Kur, Urmiya, Azikh and others traces back to the Front Asia, to Azerbaijan. In this connection the Turkic historisms such as "yandi", "baga", "irgen", "tengri" and others were analysed as well. The words denoting titles and linked with the name of Allah thad used in the I millennium of AD in the Middle Asia were known from the III millennium of B.S. in the Front Asia.

## Ашина и Азербайджан

### Резюме

Исследование преследует цель установления происхождения и прародины «500 ашинских семей», пришедших на Алтай и основавших в 6-8 веках Великий тюркский каганат. Для этого использованы факты, приведенные в книге Л.Гумилева «Древние тюрки», в сравнении с историко-лингвистическими данными по Передней Азии и древнему Азербайджану.

Легенда ашинов говорит о ник как пришельцах «с запада западной страны», «Западная страна» - это западнотюркский каганат до Каспия, а запад этого «Запада», естественно, Азербайджан.

Тюркские правители носили титул «Мугань», Муганы – территория мидийских магов, северного и южного Азербайджана.

Название «тюрк» тюркиты получили вовсе не на Алтае: еще в III тысячелетии до н.э. в Азербайджане жило известное племя «турукки».

Тюркиты надевали на голову островерхние шапки. Часть азербайджанских саков назывались ортокорибанти – «саки-клъбуки» (VIII век до н.э.).

О том, что ашины были пришельцами на Алтае, красноречиво свидетельствует как малочисленнсть их среди аборигенов этого края, так именование их «переселенцами», «беженцами».

Известные топонимы и гидронимы – «Алтай», Кашгар, Кура, Урмия, Азых и др. восходят к Передней Азии, к Азербайджану.

В этой связи анализированы также тюркские историзмы типа ***янди, бага, ирген, тенгри*** и др. Эти слова, употреблявшиеся в Средней Азии, в первом тысячилетии нашей эры в качестве общественно-политических и религиозных терминов, в Передней Азии были известны уже в III тысячелетии до н.э.

biri də Ordubaddır. Burada söylənən haxıştalar indi də hafizələrdədir və gəlin köçən qızlarımız evdən çıxarkən icra olunur. Bölgədə müşahidə olunan toy mərasimi sözləri bunlardır: hə alma, şirinçay, xına gecəsi, duvaqqapma, şənbə şirnisi, sağdıc, soldıc, parça, qəçikəsdi və s. Nümunələrə də diqqət edək: Toyun bəzəyi *xonça*dır.

Naxçıvan yolu yovşan,
Halım olub pərişan.
Bir ilə kimi gəlməsən,
Qoyallar mənə *nişan*.

Qara atın qulağı, haxışta,
Gözləri şah bulağı, haxışta.
Eşidin, yar evlənir, haxışta,
Qara geysin *duvağ*ı, haxışta.

Aman, aman, amandır, haxışta,
*Baldız*ım bir yanmandır, haxışta.
Baldızımı deyirəm e, haxışta,
*Qeynana*m lap yamandı, haxışta.

**Heyvandarlıqla bağlı sözlər.** Bölgədə müşahidə olunan heyvan adları xalq yaradıcılığı nümunələrində də əks olunur:

Xiyar puluna alınan *eşşək* suda boğular.
Kor *qoyun* gecə otlayar.
*Qatır* tavlamıxı yerdən çıxarar, iki özünə vurar, bir yerə.
İlan öz əyriliyini bilməz, *dəvə* boynuna əyri deyər.
*Dayça* atlaşarsa, *at* dincələr, oğul kişiləşərsə, ata dincələr.

Bir qızıl *öküz*üm var,
Harda yatsa ot bitməz.
(od)

Bir qonağım gəldi haqdan,
Bir *quzu* kəsdim yoxdan.
Nə qonağımın dişi var,
Nə *quzu*mun sümüyü,
Qaraca köpək,qapıda yatar.
(yeni doğulmuş uşaq və əlcək)

Ağırlıqda dağ kimi,
Qolları buaq kimi.
Əyilir su içməyə,
Bağırır *oğlaq* kimi.
(mancanaq)

**Meyvə adlarını bildirən sözlər.** Meyvə adlarının işləndiyi xeyli örnəklər vardır ki, bəzilərinə diqqət edək:

Ağacda bara baxmaz,
*Heyva*ya, *nar*a baxmaz.
Gözlərim səni gözlər,
Başqa bir yara baxmaz.

Yuxarı bağ bizimdi, haxışta,
Tənəkləri *üzüm*dü, haxışta.
Mən növbəmi qurtardım, haxışta,
İndi növbə sizindı, haxışta.

**Arxaizmlər.** Ordubad şivələrində izlərini saxlayan bir sıra arxaizmlərə nəzər salaq:

*Ocaq. Ocaq* içində tutuşar. "Dədə Qorqud" dastanında ev-eşik, tayfa, yurd, nəsil mənasında bu söz müşahidə edilir: Ocağına bunun kimi övrət gəlməsün; Oğul, ocağım issiz qoma, kərəm eylə, varma.

*Aş. Aş*ın *sıyıx*lığı dənin yoxluğundandır. Göründüyü kimi, burada aş xörək, bişmiş mənasını ifadə edir. "Dədə Qorqud" dastanında da eynilə işlənmişdir: Ayğur atım boğazlayıb aşum versün! Müqayisə edərkən aş

sözünün həm "xörək", həm də "plov" anlamında nəzərdə tutulduğu aydın olur. Deməli, müasir ədəbi dilimizdə semantik daralma ilə işlənən "aş" sözü dialekt və şivələrimizdə ilkin semantikasını saxlamaqdadır.

*İrağ.* Nəinki Ordubad, bir sıra şivələrimizdə uzaq anlamında bu söz müşahidə olunur.

Əzizim, səndən *iraq,*
Düşmüşəm səndən *iraq.*
Qoy dərdin mənə gəlsin,
Tək olsun səndən *iraq*.

"Dədə Qorqud" dastanında irağ və ırağ fonetik variantında işlənmişdir: Bərə çoban, irağından, yaqınından bərü gəlgil; Gög ıraq, yer qatı.

*Al.* Bu sözə Ordubad şivələrində rəng mənasında rast gəlinir:

Mən aşiqəm, al məndən,
Yaşıl məndən, *al* məndən.
Ya dərdimə şərik ol,
Ya bu canı al məndən.

Xırmanda sana qaldı,
Sancılı sana qaldı.
Yarımın *al* dəsmalı,
Məndə nişanə qaldı.

"Dədə Qorqud" dastanında "Namərd tayın al eyləmiş" mətn-cümləsində hiylə mənanı daşıyır. Güz almasına bənzər al yanaqlım - cümləsində qırmızı anlamındadır.

*Ün.* Ordubad şivələrində bu sözə "səs" mənasında rast gəlirik.

Sürünü sürün dağa,
Duman, gəl bürün dağa.
Leylisi itmiş Məcnun,
Salıbdı bir *ün* dağa.

Bu söz "Dədə Qorqud dastanında da müşahidə olunur: Ünüm anlan bəglər, sözüm dinlən bəglər!

*Ün* sözü digər bölgələrdə qeydə alınmış nümunələrdə də işlənməkdədir:

Dağlar, səndə elim qaldı,
Dal putaxda gülüm qaldı.
Əlim çatmır, ünüm yetmir,
Bir şeyda bülbülüm qaldı (3, 88).

*Ala.* Burda ala qarğa baş çıxartmaz.

Qeynanam gəlir məscitdən, haxışta,
Tumanı *ala çit*dən, haxışta.
Qaynanamı seçmərəm, haxışta,
Qapıda gül-çiçəkdən, haxışta.

Bu nümunələrdə *ala* rəng bildirən sözdür. "Dədə Qorqud" dastanında isə "böyük" mənasını da bildirir: Ala gözlü gəlinlər gedərsə... ; Ala sayvanı gög yüzünə aşanmışdı.

*Batman.* "Dədə Qorqud" dastanında da bu sözə rast gəlirik: Hər atanda on iki *batman t*aş atardı.

Yaralıyam, yatmanam,
Dərdi *batman-batman*am.
Yüz il yüz ilə qalsa,
Mən yarımı atmanam.

Ordubadda işlənən bir söra sözlər vardır ki, onlar məhz bu regionda işlədilir:

Qar yağdı bastı məni
Yel əsdi, kəsdi məni.
Canıma bir od tüşdü,
Alovu *qarsdı* məni.

Qızıl üzüyüm laxlamaz, haxışta,
Versəm, anam saxlamaz, haxışta.
Anamı *beyman* olsun, haxışta,
Yarım qonaq saxlamaz, haxışta.

Hesab edirik ki, dil tarixinin dərindən öyrənilməsində belə araşdırmaların əhəmiyyəti böyük olacaqdır.

**Ədəbiyyat:**

1. Heydər Əliyev "Müstəqilliyimiz əbədidir". XXXIX cild, Bakı, "Azərnəşr".
2. Azərbaycan folkloru antologiyası. XXIII kitab ( Naxçıvan örnəkləri). 2-ci cild, Bakı, "Elm və təhsil", 2012, 332 səh.
3. Həsənova N. Yevlax şivələrinin leksikası. Bakı, "Elm və təhsil", 2014, 156 səh.
4. Quliyev T. Milli-mədəni irs və dil amilinə kulturoloji baxış (Naxçıvan dialektinin terminoloji leksikası nümunəsində). Bakı,"Ziya", 2014, 216 s.
5. Şirəliyev M. Azərbaycan dilinin dialektologiyasının əsasları. Bakı, 2008, 416s.
6. Zamanov N. Heydər Əliyev və Azərbaycan nitq mədəniyyəti (III kitab). Bakı, "Elm və təhsil", 2018, 520 s.

**The features of ordubad dialect’s**
**Summary**

Ordubad accents are included into the south group of our accents and dialects. The specific accent words of the region are rich and very interesting. Folklore samples - proverbs, bayats, hakhishtas, and believes which spoken in Ordubad region are remarkable with the words belong to this accent.

In the article the words belong to the accent are involved in the research. The terminology here is grouped into words, archaisms, and ceremonial expressions.

The words written in the epic "Dede Gorgud" are especially emphasized.

Literary language words are also emphasized how well these words can be crafted in the poem.

This research will be useful for watching the dictionary of the Azerbaijani language.

**Особенности ордубадского диалекта**
**Резюме**

Ордубадские акценты входят в южную группу нашего диалекта. Этот регион богат своеобразными словами с акцентом и это очень интересно. Образцы фольклора в Ордубадском районе по словам предков, в баятах, в повествованиях, в верованиях слова этого стихотворения заслуживают внимания.

Акцентные слова, включенные в статью, привлечены в исследование. Терминология здесь сгруппирована в слова, архаизмы, церемониальные выражения. Эпопея "Деде Горгуд" особенно подчеркивается. Также в литературном языке в словах подчеркивается на сколько ясно произносится акцент в языке.

Это исследование будет благоприятно для наблюдения за составлением азербайджанского языка.

**Rəyçi: dos. P.Ə.Əzizova**

**Əliyev Əli Umud oğlu**
ADPU-nun Ağcabədi filialı

# SÖZ VƏ MƏNT İQÜŞÜNCƏ

***Açar sözlər**: söz, düşüncə, ana dili, məntiqi yük*
***Keywords**: word, thought, native language, mental load, the weight of the spirit*
***Ключевые слова**: слово, мышление, родной язык, логическая нагрузка*

Düşüncənin inkişafi söz ehtiyyatının çoxluğundan, ünsiyyət vasitəsi olan dildən asılıdır. Odur ki, milli dil xəzinəmizdə elə söz və ifadələr, rəvayətlərlə bağlı bayatılar var ki, onlar çox boyük və dərin məntiqi yükə malikdir. Onların məna açımını, çözümünü və şərhini verdikcə ana dilimizin incə çalarlara kökləndiyinin şahidi oluruq.

Sözün məna anlamının müxtəlifliyi və işlənmə məqamlarının münasibliyi X-XI əsr ədəbi nəzəri fikrində də öz əksini tapmışdır. “Qabusnamə” əsərində belə bir deyim diqqəti cəlb edir: “...söz dörd cürdür: birini nə bilərlər, nə deyərlər, birini həm bilərlər, həm də deyərlər, birini deyərlər, lakin bilməzlər, birini bilərlər, lakin deməzlər. Bu dörd növ sözün hərəsinin iki üzü vardır: biri gözəl, biri çirkin”. (2, 45)

Doğrudan da maraqlıdır bu dörd cür olan sözlər hansı sözlərdir?! Birinci qrup sözlər aydındır ki, bilmədiyin sözü demək olmaz, ikinci qrup sözlər isə ümumişlək sözlərdir ki, bilərlər və deyərlər, üçüncü qrup sözlər isə dilimizin genofondunda olan və işlənmə məqamını bildiyimiz, işlətdiyimiz halda mənasını tam anlamadan, tam dərk etmədən mexaniki olaraq nitq prosesində işlətdiyimiz sözlərdir ki, belə sözlərin məna açımını məntiqi düşüncəyə və elmi araşdırmaya əsaslanaraq dəqiqləşdirmək mümkündür. Məsələn, belə sözlərdən bir neçəsinə diqqət yetirək: başına kül; başına daş; ətini yeyər,sümüyünü atmaz; dovşanı araba ilə tutarlar; ağ meydan; ağ eləmisən; əliallahı uşaq; alla vara, nə olur olsun; o qara bir daşdır, onu götürən də peşimandır, qoyan da; Araz aşığımdandır, Kür topuğumdan; onun dərdi Novruz dərdidir və s.

Nəhayət, dördüncü qrup sözlər isə deyilməsi qəbahət sayılan tabulardır ki, hamı o sözləri bilir, lakin şüurlu surətdə nitqlərində işlətmirlər.

Yuxarıda üçüncü qrup sözlərə (deyərlər, lakin bilməzlər) aid verilmiş nümunələrin məna anlamına, məntiqi yozumuna diqqət yetirək:

Deyimlər, duyumlar və yozumlar.
“Əlim dilimin qələmi” (Yusif Nəğməkar)
Əsil azmaz, coşar,
Yağ çürüməz, daşar,
Duz iylənməz, yaşar. (yəni nəmlənər)

Qoyma ağıldan ağıl olmaz,
Özgə oğlundan oğul olmaz,
Kobud qızdan gəlin olmaz,
Danalı inəkdən sağın olmaz.

Babalarımız qısa və yığcam sözlə həmişə dərin məna və fəlsəfi hikmət dolu söz hörgüsü nəqş etmişlər. Odur ki, hikmətli deyimlərə məntiqi prizmadan yanaşıb real anlam əldə etmək lazımdı. Bu baxımdan folklor dərin fəlsəfi duyuma və elmi məntiqə söykənir. Məsələn,

1.“Düz düzdə qalar” deyirlər. Əslində bu deyim düzgün məntiqi məna ifadə etmir, düz təbliğ olunmur, əyri, oğru təbliğ olunur. Bu heç də o demək deyildir ki, atalar səf demişdir. Atalar doğru demiş, biz isə səf ifadə edib, səf anlamışıq. Doğru deyim belədir:

“Düz düz də qalar”. Yəni düzə zaval yoxdur, həmişə düz olaraq qalacaqdır.

Başqa bir deyim:

2.“Yeməkdən sonra qırx tikə pendir yeyərlər” – deyiblər. Çünki pendir həzm prosesini nizamlayır. Amma elə bir adam tapmaq olmaz ki, yeməkdən sonra qırx tikə pendir yeyə bilsin, bu mümkün deyildir. Odur ki, doğru deyim belədir: “Yeməkdən sonra qırıx tikə pendir yeyərlər”.

Nümunələrdən də göründüyü kimi səhv deyim yalnış fikir formalaşdırır. Belə yalnışlıqlara elmi-bədii ədəbiyyatlarda da rast gəlirik:

3.Yük üstündə cücü var,
Cücünün qırx ucu var.
Al edib, qız aldınız,
Sizdə bəylik gücü var.

Əslində isə bu mərasim deyimini xalq belə formalaşdırmışdır:

Yük üstündə kücü var,
Kücünün qırx ucu var.
Al edib, qız aldınız,
Sizdə bəylik gücü var.

Bədii ədəbiyyatda belə bir bayatı vardır:

4. Mən Aşiq ləngəridi,
Gəmi də ləngəridi.
Çox bilib, az danışmaq,
İ gidin ləngəridi.

Amma bu bayatı rəvayətlə bağlı yaranmışdır. Kənddə kəndirbaz kəndirin üstündə ləngərsiz sinini ayaqları ilə sürüşdürə-sürüşdürə apardığına görə soruşurlar ki, kəndirbazın əlində ləngəri yoxdur, o ləngərsiz necə hərəkət edir?! Cavabında isə söylənilir ki, sini də ləngər rolunu oynayır. Bu tamaşanı seyr etmiş Sarı Aşiq bayatını belə söyləmişdir:

Mən Aşiq ləngəridi,
Sini də ləngəridi.
Çox bilib, az danışmaq
İ gidin ləngəridi.

5.”Əl tutmaq Əlidən qalıb” atalar sözü VI əsrdən sonra yaransaydı belə deməyi məqbul saymaq olardı, amma xalq ədəbiyyatının bağları daha qədim dövrlərə gedib çıxır, odur ki, “Əl tutmaq əllidən qalıb” demək daha məntiqli və məqsədəuyğundur. Bu o deməkdir ki, əli olan adam büdrəyənin əlindən tutmağı bacarmalıdır. Həmçinin iş görən zaman “əlli ol”----deyirlər, yəni cəld ol, hünərli ol kimi anlanılır. Bu baxımdan da deyim məqbul sayıla bilər ki, əl tutmaq, kömək etmək----- cəld, hünərli olandan qalıbdı.

6.”Yol böyüyün, su kiçiyindir” atalar sözü də yanlış deyimlə, məntiqsiz yanaşma ilə gəlib bizə çatmışdır. Məncə, doğru deyim belədir:

“Yol böyüyün, sus kiçiyindir” və yaxud “Böyük olan yerdə kiçik danışmaz”---demişlər.

Belə bir deyim söyləyirlər:

7.İlanı görənə nəhlət,
Görüb, öldürməyənə nəhlət,
Öldürüb, basdırmayana nəhlət.

Bu deyim yanlışdır, çünki ilanı görənə niyə nəhlət oxunur?! Görmədikdə quyruğunu tapdalayana nəhlət oxunmalıdır. Məncə, doğru deyim belədir:

İlanı görməyənə nəhlət,
Görüb, öldürməyənə nəhlət,
Öldürüb, basdırmayana nəhlət.

Çərşənbələr zamanı, hələ ondan lap əvvəl keçirilən “Xıdır-Nəbi” axşamında simvolik olaraq keçi-təkə timsalında bir uşağa buynuz taxar, onu bəzəyib mahnı oxuya-oxuya qapı-qapı gəzdirər və pay dilərdik. O mahnının sözlərindən biri belə oxunardı:

8.Oyna şumalım, oyna,
Şirin şumalım, oyna,
Nə qov yeyər, nə qarpız,
Yaxşı oynar bu donuz.

Zənnimcə, yazın, istiliyin, yaşıllığın rəmzi kimi bəzəyib ortaya çıxardığımız keçiyə-təkəyə donuz deyilməsi heç də doğru deyildir. Şərq tatixində yaşıllıq iilahəsi, ölən və dirilən allah Dumuzinin adı qeyd olunur. “Yay və qış gündönümü zamanı (22 iyun və 22 dekabr) ölən və dirilən allah Dumizinin şərəfinə də bayram ziyafəti keçirilirdi.”(10, 128). Ziyafət zamanı yaşıllıq ilahəsi Dumizinin adının səslənməsi hələ e.ə. Şumer dövründən mövcud olmuşdur. Odur ki, oynadılan donuz deyil, Dumuzdur. Doğru deyim belədir:

Oyna şumalım, oyna,
Şirin şumalım, oyna,
Nə qov yeyər, nə qarpız,
Yaxşı oynar bu Dumuz.

9. Başına kül ifadəsi ən çox qadınlara məxsus sözdür ki, işlədirlər. (Aley, başına kül...) Araşdırmaya əsasən belə qənaətə gəlmişəm ki, ən qədim zamanlarda tibb elmi inkişaf etmədiyi bir dövrdə insanlar quduzluq xəstəliyinə tutulanda onu müalicə etmək mümkün olmurmuş. Odur ki, xəstəni öldürürlərmiş, lakin doğmalarının gözü qarşısında kimisə öldürmək əzablı görünüş olduğuna görə adamı tək bacalı dama salıb qapısını bağlayıb, lazım olan suyu və yeməyi bacadan verirlərmiş. Xəstə ölənə qədər damda saxlayarmışlar. Bir gün dam üstünə kül tökən qarı bilmir ki, damda xəstə var. Qarı bilmədən külü bacanın yanına tökmək

istəyir, lakin kül bacadan damın içinə—xəstənin başına tökülür. Qarı qışqırtı səsi eşidir, baxıb görür ki, xəstə o dəqiqə öldü. Qarı gördüklərini olduğu kimi hamıya danışır. Başa düşürlər ki, qudurmuş adamın asanlıqla öldürülməsi üsulu onun başına kül tökməkdir. Odur ki, o zamandan belə bir qarğış formalaşır; "Səni görüm, qudurasan, dama qatıb, başına kül ələyib, səni öldürələr". Qısa şəkildə deyilən "başına kül" ifadəsinin mənası belədir.

10. Başına daş ifadəsi də dəfn mərasimi ilə bağlı yaranmış qarğışdır, yəni səni görüm öləsən, sənə əhlət daşı, baş daşı qoyalar.

11. Ətini yeyər, sümüyünü atmaz ifadəsi qədim dövrlərdə olan bir adətlə bağlı yaranmışdır. Qədim zamanlarda insan vəfat etdikdə meyidi xüsusi yerlərə qoyurmuşlar ki, onun ətini qurd-quş yesin. Bu proses başa çatdıqdan sonra ölü sahibi sümükləri dəfn edərmiş. Yiyəsi, sahibi olmayanın sümüyü ortalıqda qaldıqda çox böyük qəbahət sayılarmış. Odur ki, o zamandan ətini yedirdər, sümüyünü atmaz, yəni dəfn edər kimi deyilmiş fikir bu günümüzə qədər dəyişilmiş və ətini yesə də, sümüyünü atmaz şəklində gəlib çatmışdır. Bəlkə də, əti sənin, sümüyü mənim ifadəsi də bu adətlə bağlı yaranmış və deyilmişdir.

12. Dovşanı araba ilə tutarlar. Qarabağda "dovşan" ləqəbi ilə məşhur olan bir qaçaq var imiş. Bu qaçaq sovet hakimiyyəti illərində qaçaq düşmüşmüş. O, xalqa ziyan vurub, camaata sataşırmış. Gəlin aparan arabalara (o zaman gəlini araba ilə apararlarmış) hücum edər, gəlini qaçırıb özününkü edərmiş. Heç kəs onu tuta bilmədiyi üçün ona "dovşan" ləqəbi veriblərmiş. Bir gün milis işçiləri (o zaman polis milis adlanırmış) qadın paltarı və mülki paltar geyib, guya toy edib araba ilə gəlin aparan kimi özlərini göstərirlər. Bu zaman "dovşan" hücuma keçib gəlini götürmək istədikdə onu arabada tuturlar. Odur ki, xalq arasında belə bir deyim formalaşır: "Bu hökümət "dovşanı" araba ilə tutan hökumətdir". İndi isə budeyim belə işlənir ki, "dovşanı" araba ilə tutarlar.

13. Ağ meydan, ağ eləmisən, ağ yalan və s. ifadələrindəki ağ sözü doğru, həqiqət və gerçəkliklərin reallaşması mənasında işlənir. Ağ meydan xəyalları, arzuları reallaşdıran meydandır. Burada Yaz bayramı vaxtı xalq bayramı elliklə keçirirmişlər. Toy mərasimləri də hər il Novruz bayramında bu meydanda qeyd olunurmuş. Odur ki, gizli sevişən oğlan və qıza bunun dərdi "Novruz dərdidir"-----deyirmişlər. Ağ meydan ifadəsi "Kitabi-Dədə Qorqud" dastanında da işlənmişdir.

14. O, qara bir daşdır, onu götürən də peşimandır, qoyan da. Bu fikrin dəymədüşər adamlar üçün, yəni xarakteri bir anın içində yüz dəfə dəyişən adamlar üçün deyirlər. O, adamlar üçün deyirlər ki, bilmirsən, hə deyəsən yaxşı olasan yoxsa, yox deyəsən yaxşı olasan. Bu fikir Makedoniyalı İsgəndər dövründən formalaşmağa başlayıb. Belə ki, dirilik suyu axtaran İsgəndər başının dəstəsi ilə qaranlıq dünyaya daxil olur. Görürlər ki, ətraf qara daşlarla doludur. Kimi bu qara daşlardan nümunə üçün götürür, kimi əlinə alıb yerə tullayır. Işıqlı dünyaya çıxdıqda görürlər ki, götürülmüş qara daş deyil, ləldir. Ona görə də götürən də peşiman olur ki, niyə çox götürmədim, tullayanda peşiman olur ki, niyə götürmədim. Odur ki, deyirlər: o, zülmətin qara daşıdır, götürən də peşimandır, götürməyən də.

15. Araz aşığımdandır, Kür topuğumdan. Mirəli Seyidovun "Azərbaycan mifik təfəkkürünün qaynaqları" kitabında belə bir əfsanə ilə tanış oluruq: "Uzaq keçmişdə burada nəhəng adamlar yaşayırmış. Onlardan Uğuz adlı birisi Kür çayından 40-50 km aralı yaşasa da əyilib bu çaydan su içə bilərmiş. Bunun üçün o bir ayağını Sac dağına, o biri ayağını Çoban dağına qoyub döşü ilə yaylacığa söykənərək, başını Kür çayına uzadarmış. Uğuz Kürü ən dərin çay sayarmış. Kür Uğuzun topuğundan imiş". ( 3, 259.)

Məncə, Araz aşığımdandır, Kür topuğumdan ifadəsi bu əfsanə əsasında formalaşmışdır.

15 Onun dərdi Novruz dərdidir fikri eşqə düşən, sevən adamlara deyirlər. Qədim zamanlarda il boyu hazırlıq işləri görərmişlər, toy isə yazda, Novruz bayramında olarmış. Odur ki, Novruz dərdi toy ilə bağlı deyilən söz kimi başa düşülür. Başqa bir ehtimal isə "Novruz və Qəndab" dastanı ilə bağlıdır ki, Novruz eşqə mübtəla olduğu üçün eşq onun dərdi sayılır. Bu gün eşqə düçar olanlara "onun dərdi Novruz dərdidir—deyirlər.

Yuxarıda verilmiş şərhlər, izah və ehtimallar ana dilimizin çox böyük və dərin məntiqi məna yükünə, incə çalarlara malik olduğunu şərtləndirir. "Minlərlə söz—minlərlə sənəddir. Bu sənədləri oxuya bilməklə--sözün arxeoloqu olmaqla elmi daha da zənginləşdirmək, tarixi saxtalaşdırmalardan xilas etmək olar. Hər bir söz daxili "yükə"—məzmuna malikdir; sözə yaşarlılıq verən onun "bətndəki yükdür". Söz məhz öz daxili yükünün "nüvəsindəki yüklü hissəciyin" hesabına yaranmışdır". (4, 315-325.)

Bu nəticəyə gəlmək olur ki, söz bizim həyatımız, bütün varlığımızdır. Sözsüz, düşüncəsiz insan ola bilməz. Bunu XII əsrdə dərk edən, bugünümüz və gələcək nəsillər üçün bəyan edən Nizami Gəncəvi dahiyanə ustalıqla belə təsvir etmişdir:

Söz eşqin lüğətində öz canımızdır bizim,
Biz—sözük, görkəmimiz—eyvanımızdır bizim.
Düşüncələr, xəyallar min-min əsər bitirər,

Onu sözün quşları mənzilinə yetirər.
Yeniliklər törədən bu qoca kainatda
Sözdən incə, kəsərli heç nə yoxdur həyatda. (5, 47.)

İ.P.Pavlov demişdir ki, məhz söz bizi insan etdi. Odur ki, "Azərbaycan dili soy kökümüzün, adət-ənənələrimizin və tariximizin ən düzgün yaddaşıdır. O, həmişə hər yerdə xalqımızın tükənməz mənəvi sərvətlər xəzinəsi, milli qeyrəti və namusu kimi qorunmalı, doğma ana tək əzizlənməlidir". (6, 8.) Söz, dil, insan—bunları biri-birindən ayrı təsəvvür etmək mümkün deyildir. Sözsüz dil, dilsiz insan ola bilməz. Bunların üçü də məntiqi düşüncəni şərtləndirir. Dilimizin zənginliyi onun lüğət fondunda olan sözlərin çoxluğundan asılıdır.Lüğət fondumuzda yüz mindən çox söz vardır ki, bu da dilimizin varlı duruma malik olmasını təsdiqləyir.

**Ədəbiyyat:**

1. K.D.Uşinski. Seşilmiş pedaqoji əsərləri, Bakı, 1953.
2. Qabusnamə, Bakı, 2006.
3. Mirəli Seyidov. Azərbaycan mifik təfəkkürünün qaynaqları, Bakı, 1983.
4. Əjdər Fərzəli Qorqud. Dədə Qorqud sözü, Bakı, 1999.
5. Nizami Gəncəvi. Sirlər xəzinəsi, Bakı, 1981.
6. Xasay Cabbarov Mahmud oğlu. Dil quruculuğu və nitq mədəniyyəti, Bakı, 1996.
7. Nadir Abdullayev, Zabit Məmmədov. Nitq mədəniyyətinin əsasları, Bakı, 2008.
8. Yəhya Kərimov. Uşaq bağçalarında nitq inkişafı, Bakı, 1985.
9. Yəhya Kərimov. Ana dilinin tədrisi metodikası, Bakı, 2005.
10. Yusif Yusifov. Qədim Şəerq tarixi, Bakı, 2007.

**Word and logical thinking**

**Summary**

It is human nature a word, the language - the development of concepts, increase the intellectual level and the assimilation of separate sciences. So, because of vocabulary and language skills as a means of communication depends on the development of thinking.

Ivan Pavlov said that it was the word made us human. Therefore, the word, language, people - are inseparable from each other. Language without words, a man without a language can not be. All three of these concepts are the main conditions of mental thinking.

**Слово и логическое мышление**

**Резюме**

Человеку свойственно слово, язык – это развитие понятия, повышение интеллектуального уровня и усвоение отдельный наук. Значит, из-за запаса слов и знание языка, как средства общения, зависит развитие мышления.

И.П.Павлов говорил, что именно слово сделало нас людьми. Поэтому слово, язык, человек – неотделимы друг от друга. Язык без слов, человек без языка не может быть. Все эти три понятия являются главными условиями умственного мышления.

**Rəyçi: dos. S.V.Allahverdiyev**

**Qarayeva Ramilə Kamran qızı**
Azərbaycan Dillər Universiteti
ramile_qarayeva@mail.ru

# İNKARLIQ KATEQORİYASININ DİL SİSTEMİNDƏ YERİ

***Açar sözlər****: inkarlıq kateqoriyası, məntiqi inkarlıq, mononeqativ, polineqativ*
***Key words:*** *negation category, logical negation, mononegative, polynegative*
***Ключевые слова:*** *категория отрицания, логическое отрицание, мононегативность, полинегативность*

Məlumdur ki, dildə olan bir sıra kateqoriyalar universal xarakter daşıyır. Həmin kateqoriyalara əksər dillərdə mövcud olan təsdiqlik və inkarlıq, təsirlik-təsirsizlik, müəyyənlik-qeyri-müəyyənlik, modallıq və s. kateqoriyalar daxildir.

İnkarlıq universal bir kateqoriyadır. İfadə vasitələrinin zənginliyinə, əhatə dairəsinin genişliyinə görə inkarlıq kateqoriyasının qrammatik kateqoriyalar içərisində xüsusi bir yeri vardır.

Demək olar ki, inkarlıq problemi ümümi dilçiliyin mühüm problemlərindən biridir. Buna görə də müasir dilçilikdə inkarlıq kateqoriyası bir çox tədqiqatçıların diqqət mərkəzindədir. Son illərdə ayrı-ayrı dillərin materialları əsasında inkalıq kateqoriyasının mahiyyəti və onun ifadə vasitələri barədə dilçilikdə çoxlu elmi əsərlərin, monoqrafiyaların, dissertasiyaların yazılmasına baxmayaraq, hələ də bu problem haqda dilçilikdə vahid bir fikir yoxdur. Məhz buna görə də bu mövzuya bütün dövrlərdə müraciət olunub.

İlk dəfə olaraq inkarlıq məsələsi formal məntiqdə eramızdan əvvəl III əsrdən öyrənilməyə başlanmışdır. İ.N. Brodiski göstərir ki, bütün qədim hind filosofları yalnız varlığın deyil, həm də yoxluğun reallığını qəbul edir və onlar belə hesab edirlər ki, yoxluğun mövcudluğunu qəbul etmədən nə inkişaf, nə də dəyişmə prosesini anlamaq mümkündür.

Bütün reallıqlar qədim hind filosofları tərəfindən aşağıdakı kimi təsnif edilmişdir:

"mövcud olanlar - maddi aləmin reallıqları"

"mövcud olmayanlar - qeyri-real olan əşyalar, neqativ olanlar".

İnkar təkcə obyektiv əlaqələrin yoxluğu kimi dəyərləndirilməməli, həm də obyektiv əlaqələrin də daxil olduğu predmet və əlamətlərin yoxluğudur. Formal məntiq inkarı onun ifadə vasitələrindən kənarda öyrənir. Məsələn məntiq üçün "O danışmır" və "Onun danışması yalandır" eyni məzmunlu cümlədir. Göründüyü kimi, eyni məntiqi inkar müxtəlif dil vasitələri ilə ifadə edilir. Qrammatikada isə bu iki cümlə müxtəlif quruluşları ilə fərqlənir. Strukturdakı əlavə leksik vahid isə məzmuna müəyyən təsir göstərir

İnkarlıq anlayışı bir kateqoriya kimi eyni zamanda fəlsəfəyə və dilçiliyə aiddir və sonuncuda onun rolu çox əhəmiyyətlidir.

XIX əsr fransız dilinə aid yazılmış qrammatika kitablarında inkarlıq xüsusi sahə kimi öyrənilir: Braşe, Bröle, Vaqner və Pənşön, Qiyyam, Milner və başqaları inkarlığı semantik qrup kimi nəzərdən keçirirlər. XX əsr fransız dilçiliyində də inkarlıq problemi xüsusi yer tutur.

Rusiyada ilk dəfə bu məsələ xüsusi tədqiqat obyekti kimi A.A.Şahmatovun, N.A. Şıqarevskayanın, E.M. Şendelsin və başqalarının, Azərbaycanda isə S.A.Abdullayevin, A.A. Aslanovun, B.R. Məmmədovun və başqalarının tədqiqat obyekti olmuşdur.

İnkarlıq elə bir kateqoriyadır ki, onu həm məntiq, həm də qrammatika elmi öz tədqiqat obyektinə daxil edir.

B. Xəlilov inkarlığa belə tərif verir: "İnkarlıq məntiqi kateqoriya kimi obyektiv aləmə, obyektiv reallığa olan münasibəti əks etdirir. Yəni, ətraf aləmə olan münasibət, əşyaya, hadisəyə aid olan əlamət, keyfiyyət obyektiv şəkildə nəzərdən keçirilir". Məsələn "yağış yağır" ifadəsi təsdiqi, "yağış yağmır" ifadəsi isə inkarı bildirir. Məntiq elmi üçün bu ifadələrin hansı qrammatik vasitələrlə ifadə olunması, hansı morfoloji əlamətlərə malik olması mühüm deyil. Bura da əsas məqsəd hadisənin obyektiv, real olaraq təsdiq və ya inkara aid edilməsidir (3).

Məntiqi inkar ilə qrammatik inkar arasında başlıca fərq ondan ibarətdir ki, məntiqi inkar hökm formasında, qrammatik inkar isə cümlə formasında ifadə edilir. Lakin bununla belə dilçilər məntiqi inkarla qrammatik inkar arasında əlaqələrin də olduğunu bildirirlər. Məntiqi kateqoriya ilə qrammatik kateqoriya arasında əlaqə, bunların münasibəti, əsasən, dil ilə təfəkkürün münasibəti kimidir. Bu baxımdan inkarlıq semantikasını məntiqi və linqvistik inkarlığın vəhdəti kimi nəzərdən keçirmək lazımdır (6).

Bəzi dilçilər, o cümlədən E.İ.Şendels, E.Novikov və bir sıra başqa dilçilər haqlı olaraq dil kateqoriyası kimi təsdiqlik və inkarlığın məntiqi təsdiq və inkara nisbətən daha geniş ifadə sahələrinə malik olduğunu qeyd edirlər.

Dil kateqoriyası kimi inkarlıq nisbi müstəqilliyə malik olub, məntiqi kateqoriya adekvat olmayan, lakin onu da özündə ehtiva edən həcmi ilə xarakterizə edilir.

Sırf sintaktik anlamda inkarlıq kateqoriyası inkar hökmdən başqa xüsusi inkarlıq, qarşılaşdırma, istisna, subyekiv sual, qadağa, intensiv təsdiq də ifadə edir. Bəzi dilçilər, o cümlədən L.E.Kumaniçakina bir sıra nida və sual cümləsi qruluşlarında inkar əlamətli cümlənin inkarlıq ifadə etmədiyini, başqa sözlə, inkar cümləsinin təsdiq anlatdığını qeyd edir.

Rus və qazax dillərində inkarlıq kateqoriyasını tədqiq edən M.N. Lukenova təsdiqin inkar yolu ilə ifadə şəklinə diqqəti cəlb edir. O göstərir ki, məhz burada, inkarlığın rəngarəng imlpisit ifadə şəkillərində təsdiq və inkarın dialektik vəhdəti, onlar arasındakı sonuz əlaqə ifadə edir.

Dilçilikdə inkarlığın mahiyyətinə dair ayrı-ayrı fikirlər, konsepsiyalar mövcuddur. İnkarlıq haqqında olan müxtəlif konsepsiyalara nümunə olaraq inkarın psixoloji konsepsiyasını və inkarlığın modallıq konsepsiyasını misal göstərmək olar.

İnkarın psixoloji konsepsiyasının tərəfdarları inkarı insan psixikasının məhsulu hesab edirlər. Bu baxımdan onlar (O.Yespersen, Q.Paul, J.Qinneken) inkarlığı sırf subyektiv hesab edərək "insan psixikasının xalis subyektiv vəziyyəti" kimi qiymətləndirirlər. Psixoloji cərəyanın O.Yespersen, H.Funt, V.Havers kimi nümayəndələri inkarlığa həm müqavimət hissinin (le sentiment de la resistance) ifadəsi, həm də pozitif tərəfə münasibətdə qadağan, imtina, rədd düşüncəsinin (le sentiment de la defence) ifadəsi kimi baxırlar (5).

Bu konsepsiyanın tərəfdarları olduğu kimi, əleyhdarları da vardır. Məsələn S.A. Vasilyeva bu konsepsiyanı tənqid edərək, inkar anlamının ümidsizlik, müdafiə, müqavimət, təzad və s. kimi ifadələrlə bərabər tutulmasını qəbul etmir, çünki, bu və ya bu kimi digər hisslər gerçək əlaqlələr və münasibətləri ifadə etməyərək həm təsdiq, həm də inkar mühakiməsində əks oluna bilələr.

Dilçilərin bəziləri təsdiq və inkarı modallığın əsas formaları kimi qiymətləndirir. Onlar inkara obyektiv kateqoriya kimi yox, subyektiv kateqoriya kimi yanaşırlar. Məsələn İ.V. Tolstoyun fikrinə görə "inkar söyləmləri qiymətləndirmə xarekterli modal çalara malikdir. Bu cür fikirlərə bir çox dilçilərin əsərlərində rast gəlmək olar. Lakin V.N. Bondarenko inkar və modallıq arasında sıx əlaqə olduğunu və onların müxtəlif və müstəqil kateqoriya olduğunu göstərir. İnkarlıq kateqoriyasını modallıqla qarışdırmaq olmaz, çünki modallıq ifadə edən sözü və ya söz birləşməsini istər təsdiq, istərsə də inkar cümləyə daxil etsək, onun mənasına o qədər də xələl gəlməz. Buna görə də inkarlıq və modallıq V.N.Bondarenkonun da dediyi kimi, ayrı və müstəqil kateqoriyalar hesab edilir.

Mövcud dilçilik ədəbiyyatında inkarlıqla modallıq və predikativliyin əlaqəsi məsələsinə də toxunulur. Bu yönümdə inkarlıqla modallıq və predikativliyin əlaqəsi məsələsində fikir ayrılığı vardır. Əgər A.M.Peşkovski, akademik V.V.Vinoqradov, V.A.Admoni inkarlığı modal münasibətlər sahəsinə daxil edirsə, E.İ.Şendels, V.V.Quliqa, İ.V.Andreyeva və başqaları onu müstəqil qrammatik kateqoriya kimi izah edirlər.

Bir çox tədqiqatçılar isə təsdiq və inkarı mahiyyət etibarı ilə pozitiv və neqativ predikasiya təzahürləri kimi şərh edirlər.

Müasir diçilikdə bir sıra mənbələrdə təsdiq və inkar cümlələr məhz belə qarşılıqlı vəhdət və əlaqədə tədqiq olunur.

Dilçilik ədəbiyyatında inkarlığın müəyyənləşdirilməsində E.İ.Şendelsin aşağıdakı tərifi daha geniş yayılmışdır "bir dil kateqoriyası kimi inkarlıq müəyyən dil vasitələrinin köməyi ilə anlayışlar arasında neqativ əlaqələri əks etdirir"

Professor S.Abdullayevin fikrincə, geniş funksional semantik kateqoriya olan inkarlıq məfhum və fikirləri ifadə edən söz, söz birləşmələri və müəyyən pozitiv əlaqələrə uyğun gəlməməsini ifadə edir" (1).

Burada inkarlığın bütün cəhətləri semantik, sintaktik, qrammatik-leksik, hamısı bir kompleks şəkildə ifadə olunur. Beləliklə, linqivistik inkarlıq daha geniş ifadə vasitələrində öz əksini tapır. Daha doğrusu, inkarlıq semantikasının ifadəsi üçün bütün dil səviyyələrindəki ifadə əlaqələri: leksik - semantik, leksik - sintaktik, leksik - morfoloji və s. iştirak edir.

Xüsusi olaraq onu da qeyd etmək lazımdır ki, inkarlıq elementinin cümlənin hansı sahəsində reallaşması yalnız struktur faktorla deyil, eyni zamanda bir sıra kommunikativ, praqmatik, funksional-semantik və üslubi şərtlərlə də bağlı olur.

Təsdiqlik-inkarlıq kateqoriyasının ifadə təzahürləri müxtəlif dillərdə müəyyən tipoloji oxşarlıq və fərqlərlə üzə çıxır.

Bu da təsdiq və inkarın universal fəlsəfi-məntiqi strukturunu təşkil edir. Bu baxımdan inkarlıq semantikasını məntiqi və linqvistik inkarlığın vəhdəti kimi nəzərdən keçirmək lazımdır.

Təsdiqlik və inkarlıq anlayışları əks qütüblər olsalar da, həm də bir-biri ilə əlaqədar olan anlayışlardır. Təsdiqlik və inkarlığın ifadəsidə təsdiq və inkar hökmlərin xarakteri və məntiqi strukturundan asılı olduğu kimi, danışanın obyektiv mülahizələrindən də asılı ola bilir. Məhz buna görə də ünsiyyət prosesində bəzən təsdiq cümlə inkar hökmü, inkar əlamətli cümlə isə təsdiq hökmü ifadə edə bilir (1).

Dil faktları belə bir ümumiləşmə aparmağa əsas verir ki, inkarlıq kateqoriyasının ifadəsində və inkarın gerçəkləşməsində bütün dil bazası iştirak edir.

Fransız dilində inkarın ifadə vasitələrinə həsr olunmuş tədqiqat işlərində, inkarın eksplisit (aşkar) və implisit (gizli) ifadə vasitələri nəzərdən keçirilir. Fransız dilində inkarın eksplisit ifadə vasitələrinə inkar ədatı, inkar əvəzlikləri və inkar zərfləri, həmçinin inkar bağlayıcıları və inkar prefiksləri və suffiksləri tədqiqata cəlb edilir (3). Azərbaycan dilində isə bu funksiya daha çox ədatlarla, inkar şəkilçiləri və prefiksləri ilə reallaşır.

Fransız dilində inkarın implisit şəkildə ifadəsi üçün də müxtəlif vasitələrdən istifadə olunur. Müxtəlif sistemli dillər üzərində aparılan müşahidələr göstərir ki, müqayisə olunan hər iki dildə inkarlıq həm eksplisit, həm də implisit yolla ifadə olunur. Bu cəhətdən onlar oxşarlıq təşkil edir.

Fransız dili polineqativ (çox inkarlıq) dil tipinə məxsus olsa da bununla belə hər iki müqayisə olunan dildə inkar vasitələrinin bir cümlə daxilində müəyyən sayda rast gəlməsi qeydə alınır. Bəzi hallarda inkar elementinin, şəkilçilərin bir dəfədən artıq işlənməsi inkarın intensivliyi ilə bağlı olur.

Müxtəlif sistemli dillərdə hər bir dilin öz neqasiya vasitələri olsa da, onların inkarın situasiya ilə bağlı olaraq müxtəlif formalarda ifadə olunmasına imkan verir. Beləliklə, dilin polineqativ və mononeqativ qruluşlu olması neqasiya vasitələrindən deyil, neqasiyanın reallaşma strukturlarından asılıdır. Buna eyni zamanda danışanın niyyəti də təsirini göstərir.

**Ədəbiyyat:**

1. Abdullayev S. Müasir alman və azərbaycan dillərində inkarlıq kateqoriyası. Bakı, 1998.
2. Hüseynzadə M. Müasir azərbaycan dili. Bakı, 2007.
3. Xəlilov B. Müasir Azərbaycan dilinin morfologiyası. Bakı, 2000.
4. Benveniste É. Problèmes de linguistique générale, P., 1975.
5. Qinneken J. Principes de la linguistique psychologique, paris, 1907
6. Минкин Л.М. Система средств отрицания в современном французском языке и категория модальности. Самарканд, 1959.
7. В.Н. Бондаренко. Отрицание как логико-грамматическая категория. Москва, Наука, 1983.

**Locatıon ın the language system of the negation category**

**Summary**

This article is devoted refers to the locatıon in the language system of the negation category and its philosophical-logical features. At the same time, the article describes the universal nature of the negation category and research shows that fact the problem of negation is a controversial issue in linguistics. The article also mentions the mononegative and polynegative structure of the language. Relying upon theoretical opinions we appealled to the linguists of this sphere for learning

**Место категории отрицания в языковой системе**

**Резюме**

Лингвистическая категория отрицания занимает особое место среди языковых категорий. В статье рассматривается место категории отрицания в языковой системе и его философско-логические особенности. В то же время подчеркивается универсальный характер категории отрицания также полинегативная и мононегативная структура языка. В лингвистической литературе существуют разные мнения о принадлежности отрицания к какой-нибудь категории. Чтобы обосновать теоретические идеи, которые мы предлагаем мы обротились к работам некоторых ученых-лингвистов в этой отросли.

**Rəyçi: dos. T.Ə. Cəlilova**

**Салимова Фатима Гусейн гызы**
Бакинский славянский университет

# ЕВРОЛАТИНСКИЙ АСПЕКТ ЯЗЫКА АЗЕРБАЙДЖАНСКИХ МАСС-МЕДИА

***Ключевые слова:*** лексика, масс-медиа, азербайджанский язык, евролатынь, метатекст
***Açar sözlər:*** leksika, mass-media, Azərbaycan dili, avrolatın, metamətn
***Key words:*** lexis, mass media, the Azerbaijan language, eurolatin, methatext

Вторая половина XX – начало XXI века характеризуется стремительным ростом массовой коммуникации. Динамичное развитие традиционных СМИ: печати, радио, телевидения, появление новых компьютерных информационных технологий, глобализация мирового информационного пространства оказывают огромное влияние на процесс производства и распространение слова. Так, в современной Европе наблюдается процесс интернализации как медиатекстов, так и текстов, обслуживающих другие сферы человеческой деятельности. Данная тенденция, по мнению многих исследователей, может рассматриваться как новое возрождение латыни, получившее название евролатыни.

Из истории известно, что в результате оккупации Римом Египта в 30 г. до н.э. приходит конец эллинистическому миру. Римская империя становится вторым «мировым» государством, а Рим превращается из города-государства в столицу рабовладельческой империи. Тогда же латинский, как государственный язык, начинает употребляться на значительной территории Европы (от берегов Средиземного моря до Атлантического океана), в Северной Африке и в части Азии – от побережья Средиземного моря до гор Кавказа и реки Евфрат [Более подробно см.: 2].

Начиная с античности до эпохи Возрождения, латинский язык безупречно выполнял функции международного языка как в науке (в частности в медицине), так и в поэзии. Свой классический вид он обретает в I веке до н.э. («золотая латынь») и I-II веках н.э. («серебряная латынь»). Он был также языком католической религии, составлявшей основу средневековой идеологии. В период «поздней латыни» (III-V века) на латинском языке составлен перевод Библии (Ветхого и Нового Заветов), выполненный Иеронимом (347-420); этот перевод известен под названием Vulgata.

Несмотря на широкую распространенность латинского языка, в Римской империи продолжал функционировать и греческий язык. Например, он сохранялся до средних веков на юге Италии и в Сицилии, «куда его занесли греческие колонисты еще в VI-IV вв. до н.э.» [3, с. 32]. При разделении Римской империи в 395 году на Западную и Восточную в первой преимущественное употребление получил латинский язык, а во второй – греческий.

Эпоха Возрождения, установив строгую классическую норму для латинского языка, существенно ограничила развитие художественной литературы на латинском языке. Иначе обстояло дело в научной области. Здесь позиции латинского языка оказались более устойчивыми: «он сохранял свое значение и тогда, когда национальные языки Европы, заимствуя латинскую и латинизировано-греческую лексику, стали эффективными орудиями научного творчества» [1].

В период раннего средневековья (V-XI вв.) латинский выступал в качестве общего письменного языка западно-европейского общества, оставаясь при этом живым разговорным языком тех общественных групп, которые были связаны с использованием письменности, – духовенства, ученых, врачей, чиновников, юристов. Иначе, латынь служила не только для международного общения, но и для исполнения внутренних нужд письменного общения в каждой отдельной стране.

Поэтому в конце XX века с глобализацией общества стали говорить о возрождении латинского языка, в частности о таком понятии, как евролатынь.

Под термином «евролатынь» понимаются все слова и словообразовательные элементы латинского и древнегреческого происхождения, вошедшие в лексику западно-европейских языков в качестве заимствований. Грецизмы включаются в евролатынь на том основании, что они были заимствованы в западные языки преимущественно через посредство латыни. Как отмечает Михалев Б.А., «евролатынь – это не распространенный по всей Европе латинский язык, а лишь его фрагменты в виде его заимствованных лексем, морфем и правил» [4, с. 191]. Более того, евролатинизмы отличаются и от понятия интернационализмы.

Если под интернационализмами понимаются слова, общего иноязычного происхождения, существующие во многих языках с одним и тем же значением, то евролатинизмы – это слова только греко-латинского происхождения, существующие в европейских языках и имеющие не всегда одно и

то же значение в разных языках. Также интересно отметить тот факт, что «в языках народов, принявших христианство из Византии, большинство грецизмов нельзя признать евролатинизмами, так как они вошли в них непосредственно из греческого языка» [4, с. 191]. Этим объясняется непопулярность евролатыни, например, в России.

Для Азербайджана евролатынь является понятием второго или даже третьего порядка. Поскольку латинизмы проникали в азербайджанский язык опосредованно: как правило, через русский и, реже, западно-европейские языки, что обусловлено несколько причинами:

– во-первых, Азербайджан является светским государством с доминирующей религией – ислам. Латынь является основным языком католической церкви;

– во-вторых, азербайджанский язык по своей языковой принадлежности относится к тюркским языкам, тогда как латинский язык относится к италийской группе индоевропейской семьи языков (т.е. латинский и азербайджанский языки не являются родственными языками);

– в-третьих, влияние римской культуры и латинского языка на Азербайджан носит эпизодический характер, поскольку непосредственных контактов с Римом и, главное, территориальное соседство отсутствует.

Однако это не значит, что в современном азербайджанском языке отсутствуют заимствования из латинского языка.

Первые латинизмы начинают употребляться в азербайджанском языке со второй половины XIX в. Это были, в основном, термины, охватывающие разные сферы науки [Более подробно см.: 5, с. 41 и след.]. В период глобализации и компьютеризации общества количество латинизмов в азербайджанском языке увеличилось. Как правило, такие заимствования на момент вхождения в азербайджанский язык употребляются в языке масс-медиа, а затем адаптируются в литературном языке.

Согласно словарю Г. Магеррамли [6], в настоящее время в языке азербайджанских масс-медиа употребляется более 2200 лексем иноязычного происхождения, из которых чуть более 550 слов являются заимствованиями латинского происхождения. Данный факт говорит о том, что в языке современных азербайджанских медиатекстов 21% составляют латинские заимствования.

Евролатинизмы используются во всех сферах человеческой жизни: общественной жизни, политике, юриспруденции, экономики, науке и технике, медицине, военном деле, культуре и искусстве и т.д. Следовательно, можно говорить о наличии в азербайджанских масс-медиа евролатинского метаязыка.

**Литература:**

1. Боровский Я.М. Латинский язык как международный язык науки (к истории вопроса)//Проблемы международного вспомогательного языка. М., 1991, с. 70-76 (Электронный ресурс) – режим доступа: http://www.philology.ru/linguistics3/borovsky-91.htm.
2. Краткая история латинского языка и его роль в развитии мировой культуры // http://www.lingualatina.ru/kratkaya-istoriya-latinskogo-yazyka-i-ego-rol-v-razvitii-mirovoi-kultury.
3. Кузнецов С.Н. Теоретические основы интерлингвистики. М.: Изд-во Университета дружбы народов, 1987.
4. Михалев Б.А. Евролатинский аспект метаязыка немецкой грамматики // Известия Российского государственного педагогического университета им. А.И. Герцена. Общественые и гуманитарные науки: Языкознание, 2008, с. 190-199.
5. Azərbaycan ədəbi dili tarixi (sovet dövrü). Bakı: Elm, 1982.
6. Məhərrəmli Q. Mediada işlənən alınma sözlər. İzahlı lüğət. Bakı: Elm, 2008.

**Azərbaycan mass-media dilinin avrolatın aspekti**

**Xülasə**

XX əsrin sonlarından başlıyaraq Avropada latin dilinin bərpası müşahidə olunur, xüsusilə də yeni avrolatın anlayışını Avropa elmi terminologiya sisteminə daxil olunur.

Avrolatın qərbi-Avropa dillərinə keçən əsli latın və qədim yunan dili olan bütün alınma sözlər və sözdüzəldici elementlərdir.

Azərbaycan dili üçün avrolatın ikidərəcəli ya da üçüncüdərəcəli anlayışdır, çünki Azərbaycan dilinə latın alınmaları rus və qərbi Avropa dillərin vasitəsi ilə keçirdilər. XX əsrin sonunda bu cür alınmalar daha çox mass mediada işlənirlər. Belə ki, hal-hazırda Azərbycan mass-media dilində istifadə olunan 2200-dən çox olan alınmalardan 21% latın alınmalar təşkil edirlər.

**The Eurolatin aspect of the language of the Azerbaijan mass media**
**Summary**

At the end of XX century we can say about revivaling of the Latin lnguage, in particular about entry the consept "eurolatin" in Europe science terminological system.

The eurolatin is all the words and derivational elements of Latin and Ancient Greece origin, which were borrowed by West European languages.

For the Azerbaycan language the eurolatin is second or third order consept, because The Azerbaijan language borrowed latin words through Russian and West European languages. At the end of XX century such borrowing use, basicly, in the language of mass media. So, at present out of 2200 borrowings used in the Azerbaijan mass media, 21% is Latinisms.

**Рецензент: проф. С.Е.Рзаева**

# ƏDƏBİYYATŞÜNASLIQ LITERARY STUDIES

# ЛИТЕРАТУРОВЕДЕНИЕ

**Cabbarova Solmaz Rafiq qızı**
Naxçıvan Dövlət Universiteti

## MƏHƏMMƏDHÜSEYN ŞƏHRİYAR YARADICILIĞINDA VƏTƏNPƏRVƏRLİK TƏRBİYƏSİ

***Açar sözlər:*** *Vətən, ana dili, adət-ənənə, tərbiyə, ailə, dəyər.*
***Key words:*** *Homeland, mother tongue, tradition, upbringing, family, value.*
***Ключевые слова****: Родина, родной язык, традиции, воспитание, семья, ценность*

Məhəmmədhüseyn Şəhriyar İranda, Araz çayı boyunca o tay və bu taya bölünmüş Azərbaycanda və bütün türk dünyasında sevilən, XX əsrin dahilərindən biri kimi dəyərləndirilən ustadımızdır. Ana dilində və farsca yazılmış şeirləri ilə o, hələ öz sağlığında klassiklər səviyyəsinə qalxmışdır. Şəhriyar həm də xalq şairidir. Onun yazdığı əsərlərində xalq, millət təəssübkeşliyi, vətən, yurd, qardaş həsrəti, doğma dil sevgisi özünü bariz şəkildə göstərmişdir. Azərbaycanın iki hissəyə bölünməsi ilə ayrılıq həsrətində yaşayan insanların dərdinə şərik olmuş şair hər bir misrasında bunu özünəməxsus şəkildə anlatmağa çalışmışdır.

Araz düşman əlində bir qılınc tək ortanı kəsdi,
Onun övladı varsa, bil səni yada salan vardır. (1, 79 s)

"Məmməd Rahimin ikinci məktubuna cavab" adlı bu şerində şair düşmən əliylə ikiyə parçalanmış vətənini hər zaman bir olduğunu, Arazın bu tayda böyüyən övladlarının o tayın övladları da olduğunu qələmə almışdır. Bu şerində şair həmçinin Cənubi Azərbaycanda yaşayan həmvətənlərimizin vətən eşqi ilə yandıqlarını, qovuşmaq üçün səbrlərinin son həddinə yetişdiklərini aydın şəkildə göstərmişdir.

Vətənin bölünməsi ilə bir-birindən ayrı düşmüş insanlar vətən həsrətilə yanaşı həm də qardaş-bacı həsrəti çəkmişlər. Doğmalarından ayrı düşmək, bir ömür boyu onun sorağında yaşamağın çətinliyi şairin "Döyünmə-söyünmə" şerinin misralarında belə əks olunmuşdur;

Bir qərn də qardaşdan uzaqlaşmaq olurmuş?
Qardaş deyə, bir ömr soraqlaşmaq olurmuş?
Birdən də bu qardaşla qucaqlaşmaq olurmuş? (1, 94 s)

Şair həm də bu şeirində araya girən məsafələrin qardaşları yadlaşdırmayacağını, əksinə onlar arasındakı həsrəti, məhəbbəti daha da alovlandıracağını qeyd etmiş, "Yad qardaş olanmaz bizə, qardaşda yad olmaz". (1, 95 s). deyərək yadlardan qardaş olmayacağını vurğulamışdır.

Şairin yazdığı əsərlərin əksəriyyəti doğmalarına, qohum-qardaşlarına, sevdiklərinə ünvanlanmış, hər misrada onların qanı bir, canı bir eyni vətənin övladları olduğu qeyd etmişdir. Şair həmçinin bu misralarda araya girən məsafələrə, qadağalara baxmayaraq onları bir-birlərini sevməyə, qorumağa səsləmişdir.

Məhəmmədhüseyn Şəhriyar qələmə aldığı misralarında həm də göstərirdi ki, biz bir xalq olaraq hər zaman ailəmizə dəyər verir, ailə üzvlərimizə dərin sevgi hissləri bəsəyirik. Onları qorumağı, qayğılarını çəkməyi hər zaman özümüzə vəzifə bilirik. Ayrılıqlar isə bu sevgini, məsuliyyət hissini azaltmır, əksinə daha da alovlandırır. Düşmənlər biziləri cismən ayırsalar da ruhən ayırmağa gücləri yetmir.

Qardaş yenə sənsən ki, dalımda dayanıbsan,
Qardaş yata bilməzsə, uyubkən oyanıbsan. (1, 95 s).

Bu misralarda şair "qardaş" ifadəsində tək qohumluq əlaqələri ilə birləşən iki şəxsi yox, həm də bir-birindən ayrı salınmış vətənin çağırışından bəhs etmışdir. Əgər vətənin bir parçası dardadırsa digər parçası da narahatçılıq keçirir, yuxularını qatır.

Şimali Azərdaycanın müstəqillik qazanması ilə sərhədlərin açılması və həmvətənlərimizlə illər sonra yenidən qovuşmamız, insanların bir-biri ilə doğmalıqla görüşüb, qucaqlaşması, Cənubu Azərbaycanda yaşayan soydaşlarımızın çətinliklərə və təqiblərə baxmayaraq hər zaman bizi dəstəkləməsi Şəhriyarın misralarla ifadə etdiyi fikrin ən əsaslı təsdiqidir. Bu da xalq şairinin nə qədər uzaqgörən olduğunu, ən əsasıda xalqını nə qədər yaxşı tanıdığını göstərir.

Şəhriyar Azərbaycanı hər zaman müstəqilliyə və birləşməyə səsləmişdir. Azərbaycana xitabən yazdığı seirlərin hamısında şair Azərbaycanı həm ruhlandırmağa çalışmış, həm də harayına yetişə bilmədiyinə görə üsyan etmişdir. Bunu onun "Azərbaycan" şerində aydın şəkildə görmək olar.

Könlüm quşu qanad çalmaz , sənsiz bir an Azərbaycan!
Qalx ayağa ya azad ol, ya tamam yan Azərbaycan!

Yuxarıdakı misralarda şair nə qədər üsyan etsə də qəlbi daim vətəni üçün döyünmüş, vətəni üçün canından belə keçməyə hazır olduğunu demək olar ki, bütün misralarında hiss etdirmişdir. O, düşmənlərin pəncəsində olan vətəninin dərdi ilə yanmış, dünya var olduqca Azərbaycanın da var olmasını sidq ürəklə istəmişdir;

"Var olsun Azərbaycan" deyir dərdli Şəhriyar,
Var olsun bu dünyada, nə qədər ki, dünya var. (1, 386 s)

Şair hər zaman vətəninin azad olması, birləşməsi arzusunda olmuş, ömrünün sonuna qədər bu ümidlə yaşamışdır. Şimali Azərbaycandan görüşdüyü hər kəsi vətən deyə bağrına basmış Şəhriyar bunu yazdığı misralarda belə ifadə etmişdir;

Yatsın yava gözlər, hələlik bəxti oyatdım,
El arxama çatdıqda bu gün arzuma çatdım.
Qardaş, səni tapdıqda qəmi, qüssəni atdım.
Sanki Bakını, Gəncəni verdin mənə, qardaş,
Tapdm elimi, arxamı, qurban sənə, qardaş. (1, 95 s).

Məhəmmədhüseyn Şəhriyar doğma eli-obası ilə yanaşı sevimli və əvəzsiz olan dilinə - Türk dilinə də şeirlər həsr etmişdir;

Türkün dili tək istəkli dil olmaz,
Ayrı dilə qatsan bu əsil dil əsil olmaz. (1, 99 s).

"Türkin dili" şerində şair dilinə tərif deməklə yanaşı doğma dilinin qədrini bilməyib, onu yad dillərə məxsus terminlərlə bəzəməyə çalışanları tənqid atəşinə tutmuşdur. Digər bir misrada isə "Türkün məsəli, folkloru dünyada təkdir" deməklə ustad Türk mədəniyyətinin və etnopedaqogikasının qiymətsiz olduğunu vurğulamışdır. Burada həm də şairin milli mənəvi dəyərlərinə bağlılığını aydın şəkildə görmək olar.

Şair həm də şeirlərində xalqına məxsus adət-ənənələri, bayram mərasimlərini, xalqın gündəlik həyatını, yaşayış tərzini qələmə almış, etnopedaqogi materiallardan da məharətlə istifadə etmişdir.

Bayram idi, gecəquşu oxurdu,
Adaxlı qız bəy corabı toxurdu,
Hər kəs şalın bir bacadan soxurdu,
Ay nə gözəl qaydadı şal sallamaq,
Bəy şalına bayramlığın bağlamaq. (1, 413 s)

Ustad "Heydər babaya salam" poemasında şahidi olduğu bayramları,bu bayramlarda yaşadığı sevinc və həyəcanı, uşaqlıq dostlarını və qohumlarını təsvir etmiş, Azərbaycına xalqına məxsus milli dəyərləri mükəmməl bir şəkildə ifadə etmişdir. "Ey bülbül" adlı şerində isə böyüdüyü kəndi, orada yaşayan insanları unutmadığını və hər zaman onlar üçün darıxdığını, o günlərə yenidən qayıtmaq istədiyini qələmə almışdır;

Kənd uşağı, cumalaşdıq, coxuduq,
Təndir aşın içmiş idik, toxuduq,
Sözlərivi kəlmə-kəlmə oxuduq,
Qəm sazının yenə simin bağladıq,
Bir oxuduq, bir çaldıq, bir ağladıq. (1, 80 s).

Ümumiyyətlə, Şəhriyarın yaradıcılığında elə bir əsər tapmaq çətindir ki, orada insanlığa xas olan keyfiyyətlər, vətən və millət sevgisi, adət və ənənələrə bağlılıq, bütün ölkələr və zamanlar üçün müqəddəs mətləblər yüksək sənətkarlıqla ifadə edilməsin.

**Ədəbiyyat:**

1. Məhəmmədhüseyn Şəhriyar. Seçilmiş əsərləri. Bakı: "Avrasiya press", 2005, 480 s.
2. Məhəmmədhüseyn Şəhriyar. Yalan dünya. Bakı: 1993, 496 s.

**Issues of patriotic upbiringing in Mahammadhuseyn Shahriyar creativity**

**Summary**

It wassteted about creativity of M.H.Shahriyar, his love andattitude to motherland, nationand how poet expressed his longing for Azerbaijan in his works, his love for native language, importance of national traditions, family values and familyrelationships for him in the article. In the article as well as struggle of people's poet for the unity of Azerbaijan separated into two parts by enemies, inseparable tierconnecting nations though they life separately were dealt.

**Элементы патриотизма в творчестве Махаммадхусейна Шахрияратема**

**Резюме**

В статье раскрыта патриотическая тематика в творчестве Махаммадхусейна Шахрияра. Тема Родины, привязанности к национальным корням очень важна для автора. Через все его творчество красной нитью проходит тема страданий по Азербайджану, привязанность к национальным традициям, семейным обычаям и духовным ценностям народа. Его поэзия – это призыв и страдания по поводу единения разделенного врагами Азербайджана. Каждая строчка его поэтического наследия – это ода разорванным родственным отношения, людей, оказавшихся по разные стороны границы.

**Rəyçi: dos. S.Həsənli**

**Abbaslı Türkan Qoca qızı**
Bakı Avrasiya Universiteti

# "ABİDOS GƏLİNİ" POEMASINDA SƏLİM ROMANTİK QƏHRƏMAN KİMİ

***Açar sözlər:*** *romantik, intiqam, azadlıq, Səlim, Şərq*
***Key words:*** *romantic, revenge, freedom, Selim, East*
***Ключевые слова****: романтик, месть, свобода, Селим, Восток*

## Giriş

Bayronun dünyagörüşündəki ziddiyyətlər- fərdiyyətçilik, ümidsizlik, ekzotikaya aludəçiliklə yanaşı, üsyankar ruh, azadpərvərlik, məzlum xalqlara rəğbət hissi yaradıcılığının əsas xüsusiyyətləri olmuş, yaratdığı obrazlarda da öz əksini tapmışdır. Bayron şəxsiyyətə çox önəm vermiş, buna əsasəndə az sayda obrazlar yaradaraq əsərin bütün anlamını həmin şəxsiyyətlər vasitəsilə ifadə etmişdir. Bayronun yaratdığı əsas qəhrəmanlar tək mübarizə aparır, sonda elə bu mübarizədə öldürülürdülər. Buna görə də, bu qəhrəmanlar ədəbiyyatda "Bayronik qəhrəman" adlandırılırdı. "Abidos gəlini" əsərinin "Bayronik qəhrəman"ı Səlim idi. Şair bu poemasında Səlimin nitqinə daha çox yer vermişdir. Əsərdəki əsas hadisələr- azadlıq mübarizəsi, intiqamın alınması, sevgiliyə qovuşmaq istəyi bütün bunlar hamısı Səlimin ətrafında cərayan edirdi. İngilis, bir xristian olmasına baxmayaraq, Bayronun yaratdığı bu qəhrəman əsl müsəlman, bir türk idi. Hətta daha dərindən araşdırsaq Səlim ərəb mənşəli addır. Lüğətlərdə bu adın mənası : "Səlim- (ərəb) sağlam, bütöv, tam (1,212)" kimi göstərilmişdir.

Onun digər qəhrəmanları kimi Səlim də təkbaşına vuruşur, mübarizə aparır, həyatın ən çətin sınaqlarından çıxış yolunu şəxsi azadlığında görürdü. Elə bu səbəbdən də Cəfər Səlimin şəxsi azadlığını əlindən alaraq onu gücsüzləşdirməyə çalışırdı. Lakin Səlim Harun vasitəsilə öz azadlığına nail olur. Bayron azadlığı yenidən doğulma ilə bərbər tuturdu. Əgər insan azad deyilsə o heç yaşamamışdır.

Azadlıq! Mən sevirəm həyatım qədər onu,
Heç dil deyə bilərmi ürəyin duyduğunu(2,82-83)

### 1. Səlimin bir romantik qəhrəman kimi xarakterik xüsusiyyətləri

Digər poemalarında olduğu kimi "Abidos gəlini" əsərində də qəhrəman azadlığı, məhəbbəti uğrunda mübarizə aparırdı. Onun nakam ölümü müharibələrin heç vaxt xoşbəxt sonla bitməyəcəyinin göstəricisi idi. Əsərin birinci hissəsində göstərildiyi kimi Səlim müharibə tərəfdarı olmamış, heç vaxt əlinə qılınc alıb döyüşlərdə iştirak etməmişdir. Onun döyüşlərdən bu qədər kənar gəzməsi Cəfər paşanı qəzəbləndirir, hətta o buna görə Səlimi təhqir edirdi.

Bizi məğlub etdi xristianlar,
Qeyrətin olsaydı sən bunu anlar,
Oğul, heç olmasa, yalnız bir kərə,
Sən də yollanardın o döyüşlərə. (2,56)

Eyni motivə biz Azərbaycan ədəbiyyatında Hüseyn Cavidin "İblis" faciəsində də rast gəlirik. Əsərlərin qələmə alınması arasında bir əsrdən çox fərq olması onlar arasında dərin uçurum yaratmamışdır. Hər iki əsərin müharibələr zamanı yazılması və müəlliflərin ikisinində romantizm cərəyanının nümayəndəsi olması, əsərlər arasında da bəzi eyni motivlərin aşkarlanmasına səbəb olmuşdur. "İblis" mənzum faciənin əsas qəhrəmanı Arif müharibəni, onun səbəb olduğu fəlakətləri pisləyir. Elə bu vəziyyəti də İblisin onu qurban seçməsinə səbəb olur. Hətta o yer üzündəki bu dəhşətləri görməmək üçün Tanrıdan onu göylərə qaldırmasını diləyir.

En, gəl bana, yaxud bəni yüksəklərə qaldır,
Gəzdir qonağında;
Yerlərdə süründüm, yetişir, göylərə qaldır,
Dindir qucağında,
Qaldır bəni, ta görməyim insandakı zülmi,
Baq, yer üzü inlər.(3,9)

Hər iki obraz öz sevgilisinin başqasıyla evləndirilməsinin qarşısını almaq üçün silahlarından istifadə edirlər. Səlimin mübarizəsində tək sevgi hissi deyil, həmçinin intiqam hissi də ona dəstək verirdi. Lakin Arif obrazını silaha sarılmağa vadar edən İblisin hiylələri olmuşdur. İbn Yəminin Rənayla evlənmək istəyi müharibəni pisləyən Arifin mübarizəyə başlamasıyla nəticələndi. O bu mübarizədə İblisə uyaraq qardaşı Vasifi və Xavəri qətlə yetirir.(bax:3,7-104)

"Abidos gəlini" poemasında da Cəfər qızı Züleyxanı Qara Osmanla evləndirmək istəyir. Buna qəzəblənən Səlim atasının qatilinə qarşı döyüşmək üçün piratların dəstəsinə qoşulur. O bu mübarizədə öz

canından və Züleyxadan olur. Bu da Bayron yaradıcılığının özünəməxsus xüsusiyyətlərindən hesab olunur. (bax:2, 53-95).

"Abidos gəlini" poemasında Səlimə kömək edən, onun keçmişini, atasının qatilini ona tanıtdıran şəxs Harun olmuşdur. Səlim Harunun nəsihətləri, köməkliyi ilə həqiqəti öyrənmişdir. "İblis" faciəsində isə Xavərin babası İxtiyar şeyx Arifi şeytanın hiylələrinə uymamağa, qəlbindəki kini, nifrəti yox etməyə çağırırdı.

Yüz, bin deyil İblisə uyan... həp bəşəriyyət
Etmiş bu gün ev yıqmağa, qan içməyə adət.
Arif! Unut, oğlum, unut artıq, bəni dinlə,
Sən kəndini məhv eyləyəcəksin bu gedişlə. (3,11)

"Şərq poemaları"na daxil edilmiş " Korinfin mühasirəsi" əsərində də " Abidos gəlini" poemasındakı kimi nakam məhəbbət, xristianlar və müsəlmanlar arasında gedən mübarizələr, gənc qəhrəmanın ölümü kimi motivlər əsas yer tutur. "Korinfin mühasirəsi" əsərinin qəhrəmanı Alp dinini dəyişib müsəlman olaraq xristianlara qarşı vuruşmuşdur. O da Səlim kimi bu mübarizədə qələbə qazana bilməmiş. Öz sevgilisinin atasına qarşı silah qaldırmış və düşmənin uzaqdan açdığı atəş nəticəsində öldürülmüşdür.

İnadla döyüşən son dəstələrin
Sığıncaq tapdığı yaxın kilsədən,
Naqafil açılan məchul bir atəş
Alpın düz beynini oynatdı birdən
Aldığı yaranı baxıb görməyə
Hətta bir göz belə tapmamış macal,
Alp birdən fırlanıb sərildi yerə
Qaldı düşən kimi o cürə bihal.(2,129-130)

Hər iki qəhrəmanın mübarizəsi düşmən zərbəsiylə bitsə də Səlimin aldığı güllə tək onun düşməninin deyil, öz doğma əmisinin silahından atılmışdı. Hər iki əsəri sonu faci ilə bitir. Şair bunula müharibələrin tək Səlimi, yaxud Alpı deyil, insanlığın sonunu gətirəcəyini ifadə etmişdir. Bayron "Korinfin mühasirəsi" əsərində kilsədə xristianların və müsəlmanın birgə ölüm səhnəsini təsvir etməklə savaşın dinə baxmayaraq, müsəlmanı və ya xristianı seçmədən insanlığı məhv etdiyini göstərməyə çalışmışdı.

Qala guruldadı!
Orda nə varsa
Qəndil, qüllə, mehrab, müqəddəs kasa,
Qalib dülbəndlilər və xaçpərəstlər,
Ölənlər, qalanlar, sağlar, şikəstlər-
Hər şey kül olaraq sovruldu göyə! (2,134)

Hər iki obrazın mübarizəsi yarımçıq qaldığı kimi onların məhəbbətidə nakam olmuşdu. Həm Səlim həm də Alp sevdiyi qıza qovuşa bilmir. Hər iki aşiqin məşuqu özündən əvvəl öldürülür. Bütün bunlarında səbəbkarı həmin qadınların atası olmuşdur. Cəfər qızı Züleyxanın ölümünə bais olduğu üçün azda olsa peşman olsada, şair peşmançılığın fayda verməyəcəyini göstərməyə çalışmışdır.

Sən indi nahaq yerə tutulmusan bu dərdə.
Sən indi nahaq yerə başına kül tökürsən,
Nahaq yerə əyilir, sən belə diz çökürsən.
Nahaq yerə, ey Cəfər,sən saçını didirsən,
O qanlı əllərini özündən gizlədirsən. (2, 93)

"Korinfin mühasirəsi"ndə Minotti ( Alpın qatili) isə öz qızının ölümündə peşman olmur. Bütün bunlara baxmayaraq yenə müharibəyə davam edirdi.

Səlimin apardığı azadlıq mübarizəsi bəzi tədqiqatçıların onu Bayronun prototipi adlandırmağa səbəb olmuşdu. Bura təkcə onun azadlıq mübarizəsi deyil, həmçinin Züleyxaya olan sevgisi də aid edilirdi. Səlimlə Züleyxanın sevgisi bacı qardaş sevgisindən fərqli idi. Bu hal eyni ilə Bayronun həyatında da yer alırdı. Onun bacısı Avqustaya olan münasibəti də bacı qardaş sevgisindən daha artıq idi. Tədqiqatlara görə elə əsərin ilk variantında da Züleyxa Səlimin əmisi qızı yox bacısı olmuşdur. Bunun cəmiyyət tərəfindən düzgün qəbul edilmədiyi üçün Bayron əsərdə dəyişikliklər edərək onu Səlimin əmisi qızı kimi göstərmişdir. " Original version, Selim and Zuleika were brother and sister, but due to criticism he changed the relationship to cousins. In fact, he made many changes in the verses after the first publication" (4) – Original variantda Səlim və Züleyxa bacı- qardaş olmuşdur, lakin lazımi tənqidlərə görə o bu əlaqəni əmi oğlu, əmi qızına dəyişdirmişdir. Faktdır ki, birinci dəfə çap olunduqdan sonra o misralarda çox dəyişikliklər etmişdir.

2. **Şərq və qərb ədəbiyyatında məhəbbət motivi**

İslam dininə zidd olan bu məhəbbət motivini bəzi şərq yazıçıları da öz əsərlərində ifadə etmişdir. Lakin bu sevgiyə olan mənfi münasibət əsərdə də öz əksini tapmışdır. Süleyman Sani Axundov "Eşq və İntiqam" əsərində bu motivdən istifadə etmişdir. Əsərdə Çingiz Zöhrə xanıma aşiq olur. "Abidos gəlini"

poemasından fərqli olaraq burada onlar bacı- qardaş olduqlarını bilmirlər. Çünki, Çingizi anası Həcər xanım körpə ikən Yasəmən xanıma vermişdir. Çingiz Zöhrə ilə evlənmək istədikdə bu sirrin üstü açılır və onlar həqiqəti eşitdikdə bu faciəyə səbəb olur.

Çingiz. "Əlvida, ey ümidsiz xəyalım. Eşqin uğrunda Çingiz canını fəda edir…( Cəld tapançanı çıxarıb özünü öldürür)" (5,226)

Səlimdən fərqli olaraq Çingiz Zöhrənin bacısı olduğunu öyrəndikdə ona qarşı olan sevgisinə görə özünü ölümə məhhkum edir. " Abidos gəlini" poemasında Səlim Züleyxanın bacısı yox əmisi qızı olduğunu öyrəndikdə bu ona olan münasibətində heç bir fərq yaratmır. Çünki Səlim onu bacısı bildiyi halda da dərin məhəbbətlə sevirdi. (Bax: 5,174-226) Lakin bu vəziyyət Çingiz üçün qəbul edilməz idi, ona görə də o intihar edir.

Hər iki əsərin sonu faciə ilə bitir. Səlim və Çingiz arasındakı fərqlərdən biri də Səlimin ölümünün düşmən əliylə, Çingizin ölümünün isə öz istəyi ilə olması idi.

Atasının öldüyünü sanan Çingiz də eyni ilə Səlim kimi silaha sarılıb onun intiqamını almağa çalışır. Çingiz bu mübarizəsində qalib gəlsə də Səlim öz intiqamını ala bilmir və Cəfər tərəfindən də öldürülür. Səlimin də Çingizin də dinlədiyi, məsləhət aldığı bir şəxs vardır. Əvvəldə qeyd etdiyim kimi Səlimə Harun, Çingizə isə Piri baba köməklik göstərirdi. Qəhrəmanların uşaqlıqdan bəri bilmədikləri sirlərinin üstünü də elə bu şəxslər açır.

Harun Cəfərin hərəmxanasının xidmətçisi, Piri baba isə meşə qarovulçusu idi. Onlar daim gənclərin yanında olub ona məsləhətlər vermişlər. Hər iki müəllif sadə insanın qüdrətini, vəzifənin düşüncəyə təsir etmədiyini ifadə etməyə çalışmışdılar. (bax:2, 53-95)

Çingizdə Səlim də digər bir şəxsi öz atası sanmış, onun himayəsi altında böyümüşdür. Əlimərdan Çingizi öz oğlu bilmiş, onu da özü kimi qəhrəman yetişdirmişdir. Bundan fərqli olaraq Cəfər oğlu olmadığını bildiyi halda Səlimi öz nəzarətində saxlamaq üçün böyütmüşdür.

"Eşq və İntiqam" əsərində Əlimərdan, "Abidos gəlini" poemasında isə Abdulla döyüşlərdə iştirakı ilə, xeyirxah əməlləri ilə insanlar arasında ad- san qazanmışdı. Onların hər ikisi oğulları üçün bir nümunə idi.

**Ədəbiyyat:**

1. Paşayev A, Bəşirova A. Azərbaycan şəxs adlarının izahlı lüğəti. Bakı: Mütərcim, 2011, 340 səh
2. Corc.Q.B.Seçilmiş əsərləri. Bakı: Şərq-Qərb,2006, 224 səh
3.Cavid H. Seçilmiş əsərləri. Beş cilddə.IIIcild. Bakı: Lider nəşriyyatı, 2005, 304 səh
4.https://readytogoebooks.com/LB-AbyP51.html
5. Axundov S.S. Seçilmiş əsərləri. Bakı: Şərq- Qərb, 2005, 448səh

**Selim as a romantic hero in the "Bride of Abydos" poem**

**Summary**

Selim is one of the main heroes of the Byron's "Bride of Abydos" poem, that Byron is a prominent representative of English romanticism. In my article "Selim as a romantic hero in the "Bride of Abydos"", I tired to talk about the characteristic features of that image and its struggle for freedom. Selim is Turkish hero of English literature. According to some researchers, Selim is the prototype of Byron. Selim's love for Zuleika was identified with the attitude of the Byron to his step sister. Selim's struggle for freedom doesn't continue till the end like many heroes created by the Byron. He is killed by his uncle's weapon. The speech of Selim prevails in this work. All the events occur around Selim. He fights for both his love and father's revenge. Some of the motifs in the work are also reflected in Eastern literature. Selim is equalized with many characters that created by the Byron. Therefore, these heroes in his creativity are known as "Byronic hero" in literature.

**Селим как романтический герой в поэме «Абидосская невеста»**

**Резюме**

В поэме знаменитого английского писателя Байрона «Абидосская невеста» Селим – это главный герой. В статье раскрыты характерные особенности этого образа, описана его борьба за свободу. В английской литературе Селим - герой турецкого народа. Большинство ученых утверждают, что Селим – прототип самого Байрона. Любовь к Зулейке приравнивались любви Байрона к своей сестре. Как большинство героев Байрона Селим тоже не способен бороться до конца. Его убивает собственный дядя. Повествование ведется от лица Салима. Все события в поэме происходят вокруг Салима. Кроме восточных мотивов в поэме имеются мотивы, характерные для западноевропейской культуре.

**Rəyçi: prof.K.Əliyev**

# BEYNƏLXALQ MÜNASİBƏTLƏR

# INTERNATIONAL RELATIONS

# МЕЖДУНАРОДНЫЕ ОТНОШЕНИЯ

**Əmirov Hüseyn Baloğlan oğlu**
Bakı Avrasiya Universiteti

## CƏNUBİ QAFQAZ REGİONUNUN GEOSTRATEJİ DƏYƏRİ

***Açar sözlər***: *Cənubi Qafqaz, Xəzər regionu, Azərbaycan,geostrategiya*
***Key words:*** *South Caucasus, Caspian region, Azerbaijan, geostrategy*
***Ключевые слова*** *: Южный Кавказ, Каспийский регион, Азербайджан, геостратегия*

Şimali sərhədində "Kuban" və "Kuma" çayları, cənubunda isə Türkiyə və İran yerləşən Qafqazın şərqində Xəzər dənizi qərbində isə Azov dənizi və Qara dəniz yerləşməkdədir (1, s.1).

Qafqaz tarixən ən qədim xalqların yaşadığı və qədim sivilizasiyaların formalaşdığı Anadolu yaylası, İran yaylası, Ural dağları ilə həmsərhəddir.

Ərəb səyyahlarının "dillər dağı" olaraq adlandırdığı Qafqaz iki regiona bölünür: Şimali və Cənubi Qafqaz. Şimali Qafqaz bölgəsi yüksək dağlarla, Cənubi Qafqaz isə əsasən düzənliklərlə əhatə olunmuşdur. Qafqaz arxası , Zaqafqaziya, Maveray Qafqaz, Qafqaz ardı kimi tanınan Cənubi Qafqaz kiçik Qafqaz dağları ilə əhatələnmiş, təsərüfat üçün əlverişli olan bir yerdə yerləşir. (2, s. 9 ).

Tarixən Cənubi Qafqaz ən qədim təsərüfat ənənələrinin və əkinçilik vərdişlərinin formalaşdığı regiondur. Cənubi Qafqaza 3 dövlət daxildir: Azərbaycan Respublikası, Gürcüstan Respublikası və Ermənistan Respublikası.

### Regionunun geostrateji dəyəri

Region coğrafi baxımdan Asiya qitəsində yerləşsə də, siyasi baxımdan Avropaya( Şərqi Avropaya ) aid edilir. Bölgə Asiya ilə Avropanın kəsişmə nöqtəsində yerləşməsi nəticəsində mühüm geostrateji yollardan birinə çevrilmişdir. Şərqdən Qərbə, Qərbdən Şərqə, Şimaldan Cənuba, Cənubdan Şimala keçən əsas yolların mərkəzində yerləşir. Tarixən mövcud olmuş Böyük ipək yolunun əsas qolu olan İran qolu Cənubi Qafqazdan keçməklə Uzaq Şərqlə Avropanı birləşdiridi. Bu yol tarixən böyük dövlətlərin regiona olan marağını artırmışdır. Hazırda bu yolun bərpa edilməsinə çalışılır. Bu yol dünya ticarətinin əsas mərkəzlərindən olan Çinin və digər ölkələrinin ixrac məhsullarının digər ölkələrə çıxışını təmin edir. Böyük ipək yolu regionun inkişafı üçün geniş perspektivlər vəd edir.

Hazırda Böyük ipək yolunun yenidən canlandırılması üçün aparılan əsas işlərdən biri də TRASEKA layihəsinin həyata keçirilməsidir.

TRASEKA layihəsi haqqında layihənin rəsmi səhifəsində belə qeyd edilir:

TRASEKA - Avropa-Qafqaz-Asiya nəqliyyat dəhlizi - Bir sözlə, İpək Yolunu yenidən canlandırmaq üçün çoxşaxəli nəqliyyat üçün formalaşmış və inkişaf etdirilən şərq-qərb koridorudur. (3)

TRASEKA Qara dəniz, Qafqaz və Orta Asiyadakı beynəlxalq nəqliyyatın inkişaf etdirilməsi və siyasi-iqtisadi əlaqələr, ticarət və nəqliyyat əlaqələrini inkişaf etdirməyi nəzərdə tutan hökumətlərarası bir proqramdır. Proqramın təməli 1993-cü ildə Brüsseldə Avropa Komissiyası, Ermənistan, Azərbaycan, Gürcüstan, Qazaxıstan, Qırğızıstan, Tacikistan, Türkmənistan və Özbəkistanın iştirakı ilə keçirilən konfransda qoyulmuşdur (4).

Qafqazın siyasi cəhətdən əsas müəyyənləşdirici əlamətlərdən biri də etnik cəhətdən müxtəlifliyidir. Tarixən region müxtəlif xalqların köç etdiyi, məskunlaşdığı və yaşadığı ərazilərdən biri olmuşdur. Bu regiona etnik cəhətdən rəngarənglik versə də, regionun təhlükəsizliyi baxımından müəyyən problemlər də yaratmışdır.

Hazırda regionda olan üç dövlətin etnik cəhətdən vəziyyəti belədir:

Azərbaycan- Əhalinin sayı 2018-ci il sentyabr ayının 1-i 9.95 mln. nəfərə çatmışdır. Əhalinin 91.6%-ni azərbaycanlılar, 2%-ni ləzgilər, 1.3%-ni ruslar, 1.3 %-ni ermənilər, 2,4 faizini digər xalqlar təşkil edir. (5).

Gürcüstan- Əhalinin sayı 2018-ci ilin yanvar ayına görə 3.73mln nəfər təşkil edir. Əhalinin tərkibi: gürcülər 87.6 faiz, azərbaycanlılar 6,2 faiz, ermənilər 3,9 faiz, ruslar 1,2 faiz, digərləri 1 faiz təşkil edir (6)

Ermənistan- Əhalinin sayı 2018-ci ilin yanvar ayına görə 3.1 mln nəfər təşkil edir. Əhalinin tərkibi: ermənilər 98,1 faiz, Kürdlər (yezidi) 1,1 faiz, digərləri 0,7 faiz təşkil edir (7).

Statistikadan da göründüyü kimi Cənubi Qafqazın əsas xalqı azərbaycanlılardır. Tarixən yerli türk xalqı olan azərbaycan türkləri bu ərazidə yaşamışdır. Sonrakı dövrlərdə baş verən türk axınları zamanı bu ərazilərdə daha da möhkəmlənmiş və burada dövlət quraraq, millət olaraq formalaşmışdır.

Cənubi Qafqazın ikinci böyük xalqı gürcülərdir. Gürcülər tarixən bu regionda yaşamış və müxtəlif dövlətlər qurmuşlar.

Cənubi Qafqazda yaşayan və etnik sayına görə üçüncü yerdə duran xalq ermənilərdir. Ermənilərin bir etnik kimi burada yaşaması Çar Rusiyası zamanında onların bu regiona köçürülməsi ilə bağlıdır.

## Nəticə

Cənubi Qafqazın etnik cəhətdən müxtəlifliyi zaman-zaman regionda müəyyən gərginliklərə, toqquşmalara və münaqişələrə səbəb olmuşdur. Həmçinin regionun etnik qrupları tarixən xarici dövlətlər tərəfindən region dövlətlərinə təsir və təzyiq mexanizmi olaraq istifadə edilmişdir. Hazırda da regionda etnik toqquşmalar və münaqişələr vardır. Bunlara misal olaraq “Dağlıq Qarabağ”, “Abxaziya”, “Osetiya” və s. münaqişələri göstərmək olar.

Böyük dövlətlərin Cənubi Qafqazda üstünlük əldə etmək istəklərinin əsas səbəblərindən biri də regionun enerji ehtiyatlarıdır. Region Yaxın və Orta Şərq və Sibirdən sonra ən çox neft və təbii qaz ehtiyyatlarına sahib olan Xəzər hövzəsinin sahilində yerləşir. Regionun enerji ehtiyyatlarının və istehsalının demək olar ki hamısı Azərbaycanın payına düşür.

Region karbohidrogen ehtiyyatları olmaqla bərabər, həm də Xəzər hövzəsi karbohidrogen ehtiyyatlarının Avropaya daşınması baxımından önəmi rol oynayır. Hazırda həyata keçirilən bir sıra enerji layihələri nəticəsində təkcə Cənubi Qafqazın deyil, həmçinin Mərkəzi Asiyanın da karbohidrogen ehtiyyatlarının əsax ixracatçısı olan Avropa bazarlarına daşınması nəzərdə tutulur.

Böyük enerji layihələri qonşu dövlət olan Rusiyanın təhdidi ilə qarşılaşsa da regionun inkişafı baxımından çox önəmlidir.

Türkiyənin bu regionun enerji ehtiyyatlarına ehtiyacı böyükdür. Bu enerji layihələri nəticəsində Türkiyə öz enerji ehtiyacını təmin etməklə bərabər, həm də əsas ixracatçı ölkə rolunu oynayır.

## Ədəbiyyat:

1. P. Mustafa. Kafkasya ve Azerbaycanın Dünü-Bugünü-Yarını. İstanbul: Harp Akademileri Basım Evi, 1995, 152 səh.s. 1.
2. Y. Alaeddin, Kafkasyada Siyasi Gelişmeler: Etnik Düğümden Küresel Kördüğüme, Ankara: Lalezar Kitabevi, 2006, 419 səh. s. 9.
3. TRACECA rəsmi saytı http://www.traceca.org.tr
4. Türkiyə XİN rəsmi saytı http://www.mfa.gov.tr/avrupa-kafkasya-asya-ulastirma-koridoru.tr.mfa
5. AR Statistika komitəsi rəsmi saytı https://www.stat.gov.az/source/demoqraphy/
6. GR Statistika Şöbəsinin rəsmi saytı http://geostat.ge/index.php?action=page&p_id=473&lang=eng
7. ER Statistika komitəsi rəsmi saytı https://www.armstat.am/file/doc/99504343.pdf

## Geostrategic significance of the South Caucasian region

**Summary**

The article discusses the geostrategic position of the South Caucasus region. The article reflects the factors that increase the significance of the South Caucasus. The main focus is on the projects related to the South Caucasus. The TRASEKA project is being investigated as an international project. Geostrategic and economic aspects of this project have been studied. The ethnic diversity of the South Caucasus has also been analyzed in the article. Problems caused by ethnic diversity are also discussed in the article.

**Геостратегическое значение Южно-Кавказского региона**

**Резюме**

В статье рассматривается геостратегическое положение региона Южного Кавказа. В статье отражены факторы, повышающие значимость Южного Кавказа. Основное внимание уделяется проектам на Южном Кавказе. Проект TRASEKA исследуется как международный проект. Были изучены геостратегические и экономические аспекты этого проекта. В статье также было проанализировано этническое разнообразие Южного Кавказа. В статье также рассматриваются проблемы, вызванные по причине этнического разнообразия.

**Rəyci: s.f.d. C.X. Cahangirli**

**Abdullazadə Mirnihad Nazim oğlu**
Bakı Avrasiya Universiteti

# DÜNYA ENERJİ EHTİYATLARININ TƏSNİFATI VƏ COĞRAFİYASI

***Açar sözlər:*** *Enerji resursları, Reserv ehtiyatları, Enerji istehlakı, Enerji tələbatı, Təbii yanacaq*
***Key words:*** *Energy resources, Reservoirs, Energy consumption, Energy demand, Natural fuel*
***Ключевые слова:*** *Энергетические ресурсы, Водоемы, Потребление энергии, Спрос на энергию, природное топливо*

Enerji ehtiyatlarına sahib olmaq, enerji istehsal edə bilmək və əldə edilən enerjini bazarlara çıxara bilmək üçün lazım olan nəqliyyat yollarına nəzarət edə bilmək hazırki dövrdə dövlərin xarici siyasət strategiyalarında üstünlük verdikləri məsələlər arasındadır. Enerji istehsalında ən böyük paya sahib olan əsas üç resurslar sırası ilə neft, kömür və təbii qazdır. Dünya üzrə istehlak edilən enerji resurslarının yayılma arealına baxıldıqda, istehlakın 2/3-dən çoxunun kömür, neft və təbii qaz kimi tükənə bilən hidrokarbon ehtiyatlarından əldə edildiyini görürük.

Enerji istehlakının artımına səbəb olan əsas ünsürlərdən biri insan nüfuzunun və gəlirlərin artımıdır. Son dövrlərdə nüfuz artmının xüsusilə qeyri-qərb ölkələrində olması və bu ölkələrin sürətlə sənayeləşmə və urbanizasiyalaşma proseduruna girmələri neft və təbii qaz kimi əsas enerji resurslarına tələbatda böyük artımlara səbəb olmuşdur. Bu vəziyyətin də təbii nəticəsi olaraq enerji ilə bağlı rəqabət və gərginliklərin yaşandığı bölgələr çox vaxt bu ölkələrin mövcud olduğu regionlara doğru istiqamətlənməkdədir. Belə regionlardan Qafqaz, Yaxın Şərq və Qərbi Afrika öndə gəlir.

**Fosil yanacaq ehtiyatlarının və istehlakının ümumi mənzərəsi.**

Neftə sahib olmaq, son bir əsrdir dövlətlərin xarici siyasətlərinə təsir edən enerji məsələlərinin başında gəlməkdədir. 2014-cü ilin sonunda dünyada sübut olunmuş neft rezervi 1 trilyon 700 milyon barel olaraq hesablanmışdır (1). Bu miqdar hazırki istehlak tezliyi nəzərə alındıqda 52,5 illik ehtiyacı qarşılaya biləcək. Mövcud rezerv ehtiyatlarında ən böyük paya sahib ölkələr 17 milyard barel ilə Venesuela və 15 milyard barel ilə Səudiyyə Ərəbistandır. Bu iki ölkənin toplam rezerv ehtiyatları dünyanın ümumi rezerv ehtiyatlarının üçdə birinə bərabərdir (2). Neft ehtiyatlarının dünya ölkələri üzrə paylanması qarşıdakı dövrlərdə qlobal enerji siyasətində hansı ölkələrin adlarının daha çox hallana bilməsi ilə yanaşı, qlobal iqtisadiyyatın əsas müzakirə mövzularını da müəyyənləşdirəcəkdir. Belə ki, son dövrlərdə neft siyasəti istehsalçı ölkələrlə istehlakçı ölkələr arasında siyasi rəqabətdə vacib bir strategiya amilə çevrilmiş, neft qiymətlərinin yüksəlməsi və ya düşməsi rəqib ölkədən yararlanmağın vasitəsi olmuşdur.

Neft İxrac Edən Ölkələr Birliyi (OPEC) üzvü olan dövlətlər dünya neft ehtiyatlarının 71,6%-nə sahibdir. Hazırki dövrdə neft ehtiyatlarının regionlar üzrə yayılma arealına baxdıqda, Yaxın Şərq regionu 48,5% payla dünya neft ehtiyatlarının hardasa yarısına sahib olduğunu deyə bilərik. Yaxın Şərqdən sonra ikinci sırada 19,8%-lik rezerv miqdarı ilə Orta və Cənubi Amerika gəlməkdədir. Bu sıralamanı 13,3%-lik pay ilə Şimali Amerika izləməkdədir. Bunlara əlavə olaraq qlobal neft rezerv ehtiyatlarında Afrika 7,6%, Rusiya 7,2%, Asiya 2,8% və Avropa 0,82%-lik paya sahibdir (4). Bu rezerv sıralamasını neftlə bağlı rəqabətin hansı coğrafi regionlarda yaşanacağını göstərən b4ir göstərici kimi diqqətə ala bilərik. Lakin enerji siyasətinin gedişatı ilə bağlı təkbaşına informasiya verməyə qadir olmayan bu sıralama istehlak rəqəmləri əlavə olunduqdan sonra daha aydın anlaşılır.

Qlobal neft istehlakı böyüyən iqtisadiyyatların bir parçası olaraq günlük 840.000 barelə qədər artmışdır. Bu artış İqtisadi Əməkdaşlıq və İnkişaf Təşkilatından (OECD) kənarda qalan ölkələrdə, xüsusilə də inkişaf etməkdə olan ölkələrdə baş vermişdir. Bu müddət ərzində, Çin ümumi ortalamanın altında olan bir artış yaşamış olsa da, yenə də istehlakdakı artışın ən böyük səbəblərindən biridir. İstehlakdakı digər ən böyük artış Səudiyyə Ərəbistanı, Braziliya və

Hindistanda baş vermişdir. Eyni zamanda, OECD ölkələrinin neft istehlakı isə 1,2% nisbətində düşərək dünya miqyasında səkkizinci sıraya geriləmişdir. Neft istehlakı nisbətində ən böyük düşüş Yaponiyada baş vermiş, onun ardından isə İtaliya Meksika və Fransanın da neft istehlakında azalma müşahidə olunmuşdur. Bu tendensiya həmin ölkələrdəki iqtisadi krizislər və qənaət tədbirləri olaraq başa düşülə biləcəyi kimi, bu ölkələrin alternativ enerji qaynaqlarına yönəldiyini göstərən işarə kimi də başa düşülə bilər.

Bu isteklak azalmaları səbəbindən son bir neçə il ərzində neft ticarəti 0,9%-lik nisbətlə orta faiz göstəricilərindən də aşağı böyümə sərgiləmişdir. Çin və OECD üzvü olmayan digər ölkələrin iqtisadiyyatları idxalını artırdığı halda, özünün neft quyularını istismara verən ABŞ-ın isə neft idxalı azalmışdır. Hazırda Çin bu sahədə ABŞ-ı qabaqlayaraq dünyanın ən böyük neft idxal edən ölkəsinə çevrilmişdir.

Sənayenin təbii qaz, günəş enerjisi və başqa fərqli qaynaqlara yönəlməsi səbəbindən, hazırki dövrdə neft daha çox nəqliyyat və daşınma sektoru tərəfindən tələb olunmaqdadır. Bununla yanaşı, gələcək illərdə günəş enerjisindən daha sıx istifadəsi ilə nəqliyyat və nəqliyyatda istifadə olunan enerji miqdarının azalması gözlənilir. Dünyadakı təbii qazın istismarının artması, onu istifadəsi baxımından dünyada neftdən sonra ikinci yerdə duran enerji resursu halına gətirmişdir.

Təbii qaz istehsalında dəyişkən tendensiya istehsalçı ölkələrin reytinqində əhəmiyyətli dəyişikliklərə səbəb olur. Məsələn, son zamanlarda İsrail Şərqi Aralıq dənizindəki Tamar bölgəsindən bazara 5 milyon kubmetrdən çox təbii qaz çıxararaq təbii qaz istehsal edən ölkələrdən birinə çevrildi. Digər tərəfdən, 2014-cü ildə Fransa təbii qaz istehsalını dayandıraraq, istehsalçı ölkə olmaqdan çıxdı.

Təbii qaz istehlakına baxıldıqda, ilk 10 istehlakçı ölkənin ABŞ, Rusiya, Çin, İran, Yaponiya, Səudiyyə Ərəbistanı, Kanada, Almaniya, İtaliya və Hindistan olduğunu görürük. Xüsusilə, qeyri-OECD ölkələrində təbii qaz idxalı artmışdır. Yaxın Şərqdə idxal 41,1% artarkən, Asiya və OECD üzvü olmayan Amerika qitəsi ölkələrində artım təxminən 9% təşkil etmişdir (8). Bundan əlavə, Şimali və Cənubi Amerika və Avropada bu nisbət sabit qalmışdır. İsti hava kimi mövsümi amillərlə yanaşı, qlobal durğunluğun səbəb olduğu ehtiyatlı siyasi fəaliyyət də təbii qaz istehlakına öz təsirini göstərmişdir.

Son illərdə inkişaf etməkdə olan ölkələrin enerji tələbatının Qərb ölkələrinin tələbatından olduqca yüksək olduğu müşahidə olunur. Bunun əsas səbəbi inkişaf etməkdə olan ölkələrin enerjiyə olan asılılığı və bir çox Asiya ölkəsinin təbii qazın istifadəsinə qoyduğu məhdudlaşmalardır. Təbii qaz tələbatının artımının ən vacib səbəbi İran və Çində təbii qazın istifadəsinin artmasıdır. İnkişaf etməkdə olan ölkələrdə təbii qaz tələbatının artmasının əsas səbəbi elektrik enerjisinin istehsalına olan tələbatın artmasıdır. OECD üzv ölkələrində elektrik enerjisi istehsalı üçün təbii qaz tələbatı əhəmiyyətli dərəcədə azaldı.Bu düşüşdə elektrik enerjisi istehsalında bərpa olunan enerji mənbələrinə meylin artmasıyla yanaşı, Avropa ölkələrinin siyasi böhran dövründə, Ukrayna böhranında olduğu kimi, zərər çəkməmək üçün alternativ mənbələrə yönəlmələri faktoru təsirli olmuşdur.

Son 10 il ərzində əsas enerji mənbəyi kimi kömür istehlakı 30% azalıb. Bunun ən vacib səbəbi son illər neftin əsas enerji istehlakı mənbəyi halına gəldiyi faktıdır. Digər tərəfdən, inkişaf etməkdə olan ölkələrdə kömür istehlakı 1,1% artmışdır, lakin bu, 1998-ci ildən bu yana ən zəif artımdır (4). Avropada kömür istifadəsində 6.5% azalma OECD ölkələrinin kömür istifadəsinin azalması ilə əlaqədardır. Qlobal istehlakda kömürün payının azalmasına ən böyük töhfə Çin və Ukraynadan gəldi. Digər tərəfdən, kömürün qlobal istehlakdakı payında azalma yaşandığı bu dövrdə, Hindistan və Avstraliyada kömür istehsalı artmışdır. Kömürdəki bu mütənasib dəyişikliklər, yaxın illərdə ətraf mühitin təzyiqləri ilə birlikdə, kömür istifadəsinin azalmasının davam edəcəyini və ölkələrin öz kömür ehtiyatları ilə kifayətlənmək məcburiyyətində qalacağını göstərir. Ancaq Türkiyə kimi böyük nisbətdə kömür potensialı olan ölkələr, daha ucuz enerji qaynaqları tapa bilmədikləri müddətcə əllərindəki kömür qaynaqlarını inkişaf etdirməyi davam etdirəcəklər.

**Qeyri-ənənəvi enerji mənbələrinin dünya enerji balansında yeri.**

Qlobal nüvə enerjisi istehsalı 1.8% nisbətində digər enerji mənbələrindən daha çox artım göstərərək 2009-cu ildən bəri ilk dəfə qlobal bir bazar payı əldə etmiş oldu (7). Nüvə enerjisinin inkişaf etdiyi ölkələr arasında Şimali Koreya, Çin və Fransa ilk sırada gələn ölkələrdir. Yaponiya, Böyük Britaniya və Belçikada isə nüvə istehsalında düşüş yaşanmışdır.

Qlobal hidroelektrik istehsalına, yəni su enerjisindən elektrik enerjisi istehsalına baxdığımızda, biz 2%-lik artım göstəricisini görürük. Çinin hidroelektrik istehsalı 15,7% artmışdır və bu nisbət qlobal istehsalda xalis artımın böyük bir hissəsini təşkil etmişdir. Nəticədə, hidroelektrik enerji istehsalının qlobal əsas enerji istehlakının 6,8% -ni təşkil etdiyini görürük.

Digər tərəfdən, xüsusilə elektrik enerjisi istehsalında istifadə olunan və insanlığın gələcəyi üçün vacib olan külək və günəş kimi təbii qaynaqlar olan bərpa olunan enerji mənbələrinin istifadəsi davamlı olaraq artır. Bu artım qlobal enerji istehlakının 3% -ni və enerji istehsalının 6% -ni təşkil edir. Son beş ildə elektrik enerjisi istehsalında istifadə olunan bərpa olunan enerjinin ən böyük artımı Çində qeydə alınıb. Külək enerjisi, son 10 ildə Afrika, cənub və mərkəzi Amerika istisna olmaqla, bütün bölgələrdə ortalamanın altında bir artış sərgiləmişdir . 2014-cü ildəki günəş enerjisi istehsalına baxdıqda, 38,2%-lik yüksək artım göstəricisi görürük. Qlobal bioyanacaq istehsalında isə 7,4%-lik, orta göstəricilərdən aşağı, artım müşahidə olunub.

Bu gün enerji istehlakının artdığı bölgələr keçmişdəkindən fərqlənir. Bunun əsas səbəbi inkişaf etməkdə olan ölkələrdən gələn enerji tələbinin dəyişkən strukturudır. 2035-ci ilə qədər qlobal enerji istehlakının 37% artması gözlənilir. Bu artımın demək olar ki, hamısı (96%) qeyri-OECD ölkələrindən, yəni qeyri-Qərb inkişaf etməkdə olan ölkələrindən, xüsusən də Çin və Hindistandan gəlir.

Hazırda toplam enerji istehlakının 3% -nə bərabər olan bərpa olunan enerji (bioyanacaq daxil olmaqla) istehlakının 2035-ci ilədək tələb olunan enerjinin 8% -ni qarşılaması gözlənilir (3). Günəş, külək, geotermal, biokütlə, dalğa və hidroelektrik kimi bərpa olunan enerji mənbələrinə investisiyalar gündən-günə artmaqdadır. 2015-ci il bərpa olunan enerji investisiyalarında rekord il olmuşdur. 2016 BP Enerji Statistikası Hesabatına (2) görə, elektrik enerjisi istehsalında istifadə edilən bərpa olunan enerji 15,2% artarkən, bərpa olunan enerji ehtiyatları da qlobal istehsalın 6,7% -ni təşkil etmişdir. Son illərdə dünya enerji istehlakında bərpa olunan enerjinin payı əhəmiyyətli dərəcədə artmış və 2,8% -ə çatmışdır. Son bir neçə il ərzində qlobal elektrik istehsalı əsasən bərpa olunan enerji ilə qarşılanıb.

2035-ci ildə dünyanın qlobal maye yanacaq istehsalının 75% -i ABŞ, Rusiya və Səudiyyə Ərəbistanı tərəfindən veriləcək, bu müddətdə OPEC ölkələrinin də qlobal maye yanacaq bazarının 40%-ni təşkil edəcəyi təxmin edilir. Bu da, həmin ölkələrin dünya enerji siyasətində prioritet olacağına dair fərziyyəni gücləndirir.

**Nəticə**

Əhəmiyyəti getdikcə artan enerji beynəlxalq sistemdə ölkələrin rifahı və inkişafı baxımından son zamanlarda ən stratejik vasitələrdən birinə çevrilmişdir. Bu gün dünya rəhbərliyi ilə enerji resursları arasında birbaşa əlaqə mövcuddur. Dünya müharibəsindən sonra dünyadakı münaqişələrin aydın səbəblərindən əlavə, arxa fonda inkişaf etmiş dövlətlərin enerji mənbələrinə malik olmaq və ya enerji ötürücü marşrutlarını idarə etmək arzusu hiss olunmaqdadır. İnsanların ehtiyacları və inkişafı baxımından rolu nəzərə alınarkən, dövlətlər və silahlı qeyri-dövlət aktorları arasında siyasi böhranların enerji resurslarının mövcud olduğu bölgələrdə cəmləşdiyi müşahidə olunur. Neft və təbii qaz siyasi dəyər daşıdığına görə siyasi münaqişələrin əsas səbəbi olmuşdur. Ümumilikdə, fosil yanacaqlar dünya enerji mənzərəsindəki yerlərini bərpa olunan enerjiyə verməkdədir. 2014-cü ildə bərpa olunan resurslar dünyanın yeni enerji investisiyalarının demək olar ki, yarısını təşkil etmişdir. 2030-cu ildə bərpa olunan enerjinin kömürü keçərək elektrik enerjisinin istehsalında aparıcı rol oynayacağı proqnozlaşdırılır. World Economic Outlook / WEO 2015 məlumatlarına görə, 2040-cı ildə xüsusilə Hindistan, Çin, Afrika, Yaxın Şərq və Cənub-Şərqi Asiyadan qaynaqlanaraq qlobal enerji istifadəsinin üçdə bir artması gözlənilir.

## Ədəbiyyat:

1. Annual Energy Outlook 2015 with projections to 2040, U.S. Energy Information Administration, DOE/ EIA- 0383 (2015), aprel, 2015.
2. "BP Energy Outlook 2016 edition Outlook to 2035", http://www.bp.com/content/dam/bp/pdf/energy-economics/energy-outlook-2016/bp-energy-outlook-2016.pdf
3. "BP Energy Outlook 2035 Country and Regional Insights-Global", http://www.bp.com/en/global/corporate/energy-economics/statistical-review-of-world-energy/downloads.html
4. "Energy Efficiency Market Report 2015", http://www.iea.org/publications/freepublications/publication/energy-efficiency-market-report-2015-.html
5. James D. Hamilton, Historical Oil Shocks, Department of Economics University of California, San Diego, February 2011, http://econweb.ucsd.edu/~jhamilton/oil_history.pdf
6. "Key Natural Gas Trends, Excerpt Gas Natural Gas Information (2015)", International Energy Agency, https://www.iea.org/
7. "Technology Roadmap Nuclear Energy (2015)", Nuclear Energy Agency&International Energy Agency, https://www.iea.org/media/freepublications/technologyroadmaps/TechnologyRoadmapNuclearEnergy.pdf
8. "World Energy Outlook 2015", International Energy Agency, http://www.worldenergyoutlook.org/weo2015/

## Classification and geography of world energy resources.

**Summary**

Energy, which is a first-rate factor for the welfare and development of countries, has recently become one of the most strategic instruments in the international system. The energy policy focuses on issues such as safe delivery of energy resources to international markets in the near-term policy, while delivering supply and pricing, while reducing revival and political power in the long-term policy plan. The author describes the world of energy resources, the changing of the energy needs of the states, the use of resources. In the upcoming decades, despite the uncertainty about oil and natural gas reserves, it has been highlighted in various analytical and comparisons that the issues such as finding, producing and supplying new reserves will continue to be a major problem affecting international relations.

## Классификация и география мировых энергетических ресурсов

**Резюме**

Энергия, которая является важнейшим фактором благосостояния и развития стран, в последнее время стала одним из самых стратегических инструментов в международной системе. Энергетическая политика фокусируется на таких вопросах, как безопасная доставка энергоресурсов на международные рынки в рамках краткосрочной политики, при этом обеспечивая поставки и ценообразование, одновременно снижая возрождение и политическую власть в долгосрочном плане политики. Автор описывает мир энергоресурсов, изменение энергетических потребностей государств, использование ресурсов. В последующие десятилетия, несмотря на неопределенность в отношении запасов нефти и природного газа, в различных аналитических и сравнительных работах подчеркивалось, что такие вопросы, как поиск, добыча и поставка новых запасов, будут по-прежнему оставаться серьезной проблемой, влияющей на международные отношения.

**Rəyçi: s.f.d. A.M. Əliyeva**

**Əmirov Hüseyn Baloğlan oğlu**
Bakı Avrasiya Universiteti

# TAP VƏ TANAP LAYİHƏLƏRİ VƏ TÜRKİYƏ CÜMHURİYYƏTİ

***Açar sözlər***: *Cənub Qaz Dəhlizi, TAP, TANAP, Azərbaycan, Türkiyə*
***Key words***: *Southern Gas Corridor, TAP, TANAP, Azerbaijan, Turkey*
***Ключевые слова***: *Южный газовый коридор, ТАП, ТАНАП, Азербайджан, Турция*

3500 km uzunluğunda olan Cənub Qaz Dəhlizi(CQD) boru xətti 3 hissədən ibarətdir:
1. Cənubi Qafqaz Boru xətti;
2. Trans Anadolu boru kəməri;
3. Trans Adriatik boru kəməri. (1)

CQD Azərbaycanın Şahdəniz II yatağından çıxan qazın Türkiyə vasitəsilə Avropaya daşınmasını nəsərdə tutan bir layihədir. Xəzər hövzəsindən Avropaya doğru uzanan CQD Avropa ölkələrinin təbii qaz asılılığının aradan qaldırılması və enerji təhlükəsizliyi baxımından çox mühüm bir layihədir.

2018-ci ilin 29 mayında CQD-nın rəsmi açılışı oldu. Azərbaycanın enerji siyasətinin möhtəşəm uğuru olan CQD Azərbaycanın 1994-cü ildən həyata keçirdiyi enerji siyasətinin məntiqi nəticələrindən biri və həm uğurlu davamıdır. Açılı mərasimində çıxış edən Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev çıxış edərək qeyd edib ki, "Cənub Qaz Dəhlizi Azərbaycanın liderliyi ilə həyata keçirilən, tarixi əhəmiyyətə malik, xalqımızın firəvan gələcəyini təmin edən, regionda, Avropada təhlükəsizliyin, əməkdaşlığın möhkəmlənməsinə xidmət göstərən qlobal layihədir." (2)

CQD Avropa ölkələri qədər Türkiyənin də maraqları baxımından vacib bir layihədir. BTC, BTƏ layihələrində Türkiyə sadəcə tranzit ölkə olduğu halda CQD-da Türkiyə layihənin hər sahəsində iştirak etməkdədir. TPAO CQD layihəsində 19 faizlik paya sahibdir. CQD-nun ilk hissəsini təşkil edən Cənubi Qafqaz Boru kəməri layihəsində də TPAO 19 faizlik paya sahibdir. Beləliklə Türkiyə həm birbaşa olaraq təbii qaz istehsal edĞcəyi, həm də istehsal etdiyi təbii qazı öz boru xətləri vasitəsilə daşıya biləcəyi deməkdir. Hesablamalara əsasən Türkiyə Şahdəniz sahəsindən 2044-cü ilə qədər 28 milyard dollar gəlir əldə edəcəkdir. Türkiyənin 2045-ci ilə qədər boru xəttindən 27 milyard dollar gəlir əldə edəcəyi gözlənilir. (3)

İndi isə CQD-nin hissələri olan TAP və TANAP layihələrinə nəzər salaq.

## 1.Trans Adriatik boru kəməri (TAP)

Dünya ölkələrinin xarici siyasətində enerji siyasəti xüsusi yer tutur. Avropa birliyi ölkələri də artan enerji tələbatını ödəmək üçün öz enerji ehtiyyatları məhdud olduğu üçün müxtəlif qaynaqlar və bu qaynaqlara çıxış yolları axtarmaqdadır. AB ölkələrində enerji istehlakını araşdırdıqda neft və kömürə nisbətən təbii qaza tələbat daha çoxdur. Təbii qaz idxalı baxımından İttifaq ölkələri Rusiyadan asılıdır. Rusiya ilə son illərdə Gürcüstanda, Krımda yaranan müəyyən problemlər nəzərə alaraq Avropa dövlətləri təbii qaz baxımından çeşidliliyi artırmaq istəməkdədir. Bu məqsədlə bir sıra enerji layihələri həyata keçirilməkdədir. Bu layihələrdən biri də TAP layihəsidir.

TAP boru kəmər layihəsi Yunanıstan-Türkiyə sərhəddindən Yunanıstan, Albaniya və Adriatik dənizindən keçməklə İtaliyaya uzanan və "Snam Rete Gas" şəbəkəsinə birləşən qaz boru kəmərinin layihələndirilməsindən, tikintisindən və istismarından ibarətdir. TAP layihəsi Azərbaycanın təbii qaz ehtiyyatlarının Avropa bazarlarına daşınması üçün ən qısa və birbaşa yol olaraq seçilmişdir. TAP boru kəmərinin Yunanıstanda yerləşən hissəsi 550 kilometr uzunluğa malikdir. TAP boru kəmərinin Albaniyada yerləşən hissəsi Korça bölgəsində Yunanıstanla sərhəddə 215 kilometr uzunluğa malikdir. Adriatik dənizində isə Albaniya sərhəddindən dənizin dibilə İtaliya sahilinə doğru 105 kilometrdir. Boru kəmərinin 8 kilometri isə İtaliya ərazisində yerləşir.

Layihənin sərmayədarları SOCAR, Snam, BP, Fluxys, Enagas və Axpo şirkətləridir. Layihənin inşasına 2016-cı ildə başlanmışdır və TAP rəsmi saytının 2019-cu ilin yanvar ayının sonuna əsasən verdiyi məlumata görə hazırda layihənin 85.2 faizi tamamlanmışdır. TAP-ın ilkin periodda daşıma gücü 10 milyard kubmetr olaraq hesablanmışdır. Gələcəkdə iki əlavə kompressor stansiyası quraşdırılmaqla ötümə gücünü iki qat, yəni 20 milyard kubmetrədək artırmaq mümkündür. Layihə keçdiyi yerlərin ətraf mühitinə və sosial həyatına minimum mənfi təsir etməklə həyata keçirilməkdədir. (4)

TAP Xəzər regionu neftinin Avropaya daşınmasını nəzərdə tutan Cnub Qaz Dəhlizi layihəsinin Avropaya bağlantısını təşkil edir. İtaliya vasitəsilə TAP ilə bir çox Mərkəzi və Qərbi Avropa ölkələri öz

enerji ehtiyaclarının bir hissəsini təmin edirlər. TAP layihəsi həm tranzit ölkələr, həm ixracatçı, həm də idxalatçı ğlkələr üçün mühüm əhəmiyyətə malikdir.

TAP layihəsi ilə Azərbaycan qazı ilk dəfə birbaşa olaraq Avropa bazarlarına çıxarılacaqdır. Bu Azərbaycan üçün iqtisadi və siyasi baxımdan çox əhəmiyyətlidir. TAP layihəsi Azərbaycan üçün dünya enerji bazarlarına çıxış imkanıdır. TAP vasitəsilə xüsusilə İtaliya və Yunaıstanla eyni zamanda birbaşa ticarət əlaqələrini genişləndirməkdədir. TAP layihəsi Avropa ölkələrinin enerji idxalının şaxələndirilməsində vacib bir layihədir.

**2. Trans Anadolu boru kəməri (TANAP)**

TANAP layihəsinin Türkiyə üçün xüsusiliyi TANAP-ın rəsmi saytında belə yazılır: "Türkiyənin gücünə güc qatacaq layihə". Türkiyə ilə Azərbaycan bu günə qədər müvəffəqiyyətlə həyata keçirdikləri layihəyə daha birini əlavə etdilər: TANAP. (5)

TANAP layihəsi nəinki Şahdəniz yatağından, eyni zamanda Azərbaycan ərazisindəki digər yataqlardan da hasil ediləcək qazın nəqli potensialına görə əhəmiyyətli iqtisadi və siyasi dəyərə malikdir. TANAP-ın təməlqoyma mərasimi 17 mart 2015-ci il tarixində keçirilmişdir. Uzunluğu 1804 kilometr olan boru kəmərinin ilkin nəql qabiliyyəti 16,2 milyard kubmetrdir. İllik nəql qabiliyyəti 30,7 milyard kubmetrədək artırıla bilər. (6)

26 iyun 2012-ci ildə "Azərbaycan Respublikası hökuməti və Türkiyə Respublikası hökuməti arasında Trans Anadolu təbii qaz boru kəməri sisteminə dair" Saziş imzalanmış və hər iki dövlətin qanunverici orqanları sazişi ratifikasiya etmişlər. (7)

7 milyard dollar dəyərində olan bu anlaşmaya əsasən Şahdəniz II yatağından çıxarılan 16 milyard kubmetr qazın Türkiyəyə çatdırılması nəzərdə tutulur. Bu qazın 6 milyard dolları ölkənin daxili tələbatını ödəmək üçün, 10 milyard kubmetri isə Türkiyə üzərindən Avropa bazarına çıxarmaq üçün nəzərdə tutulur. İmza mərasimindən sonra hər iki dövlətin başçıları çıxış etmişlər. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev qeyd edib ki, TANAP yalnız Türkiyə-Azərbaycan layihəsidir və iki ölkənin gücü, maddi və texniki imkanları ilə icra olunacaqdır. Həmçinin qeyd edib ki, "Bu kəmər yüzilliklər boyu maraqlarımızı təmin edəcəkdir." Türkiyənin Baş naziri Recep Tayyip Erdoğan imzalanma mərasimindən sonra qeyd edib ki, "Bu layihə Türkiyə ilə Azərbaycan arasındakı strateji əlaqələri dərinləşdirməklə yanaşı, Azərbaycanla Avropa arasında Türkiyə üzərindən "təbii bir bağ" təmin edəcəkdir." (8)

2018-ci il iyunun 12-də Türkiyənin Əskişəhər şəhərində TANAP layihəsinin açılış mərasimi keçirilmişdir.

Açılışda Azərbaycan prezidenti İlham Əliyev, Türkiyə prezidenti Rəcəb Tayyib Ərdoğan, Ukrayna prezidenti Pyotr Poroşenko, Serbiya prezidenti Aleksandr Vuçiç, Bolqarıstanın baş naziri Boyko Borisov, Şimali Kipr lideri Mustafa Akıncı, BP şirkətinin baş icraçı direktoru Robert Dadli, müxtəlif ölkələrdən nazirlər, enerji şirkətlərinin rəhbərləri iştirak edib. Azərbaycan Respublikasının prezidenti amılış mərasimində çıxışında qeyd edib ki, "TANAP yeddi ölkəni, bir çox şirkətləri birləşdirir. Cənub Qaz Dəhlizinin ayrılmaz hissəsi olan TANAP bu gün və gələcəkdə enerji təhlükəsizliyi məsələlərinin həlli üçün əvəzolunmaz infrastruktur layihəsidir... Əgər işimizin əvvəlində - 2000-ci illərin əvvəllərində Azərbaycan-Gürcüstan-Türkiyə üçtərəfli əməkdaşlıq formatı yaranmışdısa, bu gün 7 ölkə bu layihədə iştirak edir. Daha üç ölkə bizim gələcək tərəfdaşlarımız kimi bu layihədə iştirak edəcəkdir." Türkiyənin prezidenti Rəcəb Tayyib Ərdoğan isə TANAP layihəsinin açılışının bölgə üçün mühüm bir addım adlandırıb. O qeyd edib ki, "Cənub Qaz Dəhlizi layihəsinin bel sümüyü olan və enerjinin "İpək yolu" adlandırılan TANAP-ın açılışı reallaşdırılır. ...Layihənin gerçəkləşməsi Türkiyə ilə Azərbaycan arasında qarşılıqlı etimada söykənən əlaqələr sayəsində mümkün olub." (9)

**Nəticə**

TAP layihəsi Türkiyənin bölgədə Avropa dövlətləri ilə əlaqələrini sıxlaşdıran, onun Avropa üçün əhəmiyyətini artıran bir layihədir. TAP layihəsi Türkiyənin Cənubi Qafqaz üçün əhəmiyyətini artıran bir layihədir. Türkiyə bu layihə ilə mühüm iqtisadi gəlirlər əldə etməklə bərabər Cənubi Qafqazda nüfuz uğrunda rəqabətdə də mühüm bir üstünlük əldə etməkdədir.

Türkiyə dünyanın ən çox enerji ehtiyyatlarının toplandığı Orta Şərq və Xəzər hövzəsindən Avropaya neft və təbii qazın daşınması üçün strateji baxımdan ən vacib yollardan birinin üzərində yerləşir. Bu istiqamətdə həyata keçirilən layihələrdən biri də Türkiyənin də iştirak etdiyi və Cənub Qaz Dəhlizi layihəsinin Türkiyə hissəsini təşkil edən TANAP layihəsidir.TANAP təbii qaz idxalını ən çox Rusiyadan təmin edən Türkiyəyə alternativ bir yol yaratmaqla bərabər, eyni zamanda enerji təhlükəsizliyi, sabit qaz ilə təmin ediməsi baxımından da vacib bir layihədir.

работать в коллективе и команде, эффективно общаться с коллегами, руководством и потребителями; брать на себя ответственность за работу всех членов команды и результат выполненных задач, самостоятельно определять задачи профессионального и личностного роста.

Интенсивное использование информационных технологий, глобализация рынка услуг в индустрии гостеприимства, требуют от менеджеров способность к постоянному взаимодействию, участия и ответственности в решении профессиональных задач, выработке творческого мышления и поликультурном диалога. Учитывая это, практическое применение профессиональных компетенций, заложенных в образовательной программе по подготовке будущих менеджеров СКД для индустрии гостеприимства в Украине, будет эффективным при условии формирования у соискателей высшего образования партисипативный культуры.

Особую роль в подготовке будущих менеджеров СКД для индустрии гостеприимства в нынешней ситуации, играет формирование важных профессиональных компетенции специалистов, содержание образовательных программ и их эффективная реализация. Формирование у будущих менеджеров СКД для индустрии гостеприимства партисипативный культуры, внедрение сопутствующих методов и технологий ее реализации в образовательном процессе, способное, по нашему мнению, отвечать инновационной политике и долгосрочным перспективам развития системы образования и страны в целом.

Выводы Таким образом, сущность профессиональной подготовки будущих менеджеров СКД для индустрии гостеприимства в условиях уровневого образования заключается в формировании личности, обладающей профессионально ориентированными знаниями, умениями и навыками и планирует достичь вершин профессионализма в индустрии гостеприимства. Определены структурные компоненты готовности будущих менеджеров СКД к профессиональной деятельности в индустрии гостеприимства, к которым отнесены: мотивационный, когнитивный, деятельностный, личностный и здоровьясберегающий.

Подводя итог, следует отметить, что подготовка менеджеров СКД для индустрии гостеприимства должна быть ориентирована на новые тенденции кадровой политики в гостиничном бизнесе и потребности профессионального сообщества. Нельзя надеяться на успешность результатов в любой деятельности без наличия у современного специалиста таких значимых профессиональных и личностных качеств, как готовность и способность взаимодействовать в коллективном и индивидуальном труде, творчески мыслить, активно выражать свою жизненную позицию. Именно поэтому, по нашему мнению, наличие партисипативный культуры у менеджеров гостиничного сервиса является основой профессиональной подготовки будущего менеджера СКД для индустрии гостеприимства.

**Литература:**

1. Бурлаєнко Т. І. Nauczanie poprzez grę w kształtowaniu kompetencji ekonomicznej przyszłych menedżerów oświaty», ROCZNIK POLSKO-UKRAIŃSKI XVIII, за редакцією проф., доктора хабілітованого Kazimierza RĘDZIŃSKIEGO, Akademii im. Jana Długosza w Częstochowie, стор. 389-399.

2. Волкова В.В. Формування професійної спрямованості студентів – менеджерів на початковому етапі навчання (на матеріалі англійської мови) : дис. на здобуття наукового ступеня канд. пед. наук : спец. 13.00.01. Київ., 2000. 205 с.

3. Европейский гостиничный маркетинг : [учеб. пособ.]. Москва : Финансы и статистика, 2003. 224 с.

4. Зінківський Ю., Мірських Г. Компетентнісний підхід під час підготовки фахівців у вищих технічних навчальних закладах. Вища освіта України. 2008. № 4. С. 29–36.

5. Культура цільового управління в національній системі освіті: гуманістичний контекст (колективна монографія) / О. Л. Ануфрієва, Т. І. Бурлаєнко, Г. А. Дмитренко [та ін.]; за заг. ред. Г. А. Дмитренка, В. В. Олійника. Луцьк, видавництво «Вежа-Друк», 2017. 412 с.

6. Пясецкая И. Ш. Роль формирования партисипативной культуры в профессиональной подготовке будущих менеджеров гостиничного сервиса [Текст] // Инновационные педагогические технологии: материалы II Междунар. науч. конф. (г. Казань, май 2015 г.). Казань: Бук, 2015. С. 175-178. [Електронний ресурс]. URL: https://moluch.ru/conf/ped/archive/150/7935/.

7. Уокер Дж. Р. Управление гостеприимством. Вводный курс : [учебник для студентов вузов, обучающихся по специальности 061122 «Гостиничный и туристический бізнес» и специальностям сервиса 230000]; пер. с англ. В.Н. Егорова. Москва : ЮНИТИ- ДАНА, 2006. 880 с.

8. Фоменко Н.А. Педагогіка вищої школи: методологія, стан-дартизація туристської освіти : [навч. посіб. для студентів вищих на-вчальних закладів]. Київ : Слово, 2005. 216 с.

9. Bakhmat N.V., Dudka T.Y., Liubarets V.V. Multimedia education technologies usage as the condition for quality training of the managers of socio-cultural activity. nformation Technologies and Learning Tools. Vol 64, No 2 (2018). URL: https://journal.iitta.gov.ua/index.php/itlt/article/view/2027.

10.EURHODIP: European Diploms and Degrees [Електронний ресурс]. URL: http://direction.vatel-group.com/Joomla1/.

11.Walsh K. [Електронный ресурс] // Веб-сайт Cor-nell School of Hotel Administration. URL: http://hotelschool. cornell.edu.

12.Wilson J.A. Defensive Routines and Theorњs-in-use of hotel managers: an Fction science study : A Dissertation for the degree Doctor of Philosophy / Jacqueline Acenith Wilson. University of Georgia, 2001. 225 p

**Qonaqpərvərlik sənayesi üçün sosiomədəniyyət fəaliyyətin gələcək menecerlərin hazirlanmasi metodikasinin xüsusiyyətləri**

**Xülasə**

Məqalədə qonaqpərvərlik sənayesi üçün gələcək menecerlərin sosial-mədəni fəaliyyətlərin peşə hazırlığı aspektləri müzakirə olunur. Bir tərəfdən, iqtisadiyyatın qloballaşma tendensiyalarına və cəmiyyətin və onun mənəvi sahəsinin inkişafına, digər tərəfdən isə sosial-mədəni fəaliyyətin gələcək menecerləri üçün təlim prosesinin qaydasını və məzmununu tənzimləyən tənzimləyici sənədlər əsasında qonaqpərvərlik sənayesi üçün sosial-mədəni fəaliyyət meneceri hazırlığının məzmununa müasir tələbləri təhlil etmişdir qonaqpərvərlik sənayesi üçün.

**Features of the domestic method of preparing future social and cultural managers for the hospitality industry**

**Summary**

The article discusses aspects of professional training of future managers of socio-cultural activities for the hospitality industry. Analyzed the modern requirements for the content of the preparation of the manager of socio-cultural activities for the hospitality industry, due, on the one hand, to the trends of globalization of the economy and the development of society and its spiritual sphere, and on the other, the regulatory documents governing the order and content of the educational process for future managers of socio-cultural activities for the hospitality industry.

**Kərimli Əli Mübariz oğlu**
Bakı Mühəndislik Universiteti

# VİTSE-PREZİDENTLİK İNSTİTİTUNUN NƏZƏRİ ƏSASLARI

***Açar sözlər:*** *prezident, siyaət, dövlət, idarəçilik*
***Key words:*** *president, president, government, government*
***Ключевые слова:*** *президент, президент, правительство, правительство*

Vitse-prezidentlik institutu funksiya və öhdəliklərin bölgüsü zərurətini əmələ gətirir və sahələr üzrə idarəçilikdə rahatlığı şərtləndirir. Öhdəliklər iyerarxiyası dövlət başçısı postunun möhkəmləndirilməsini səciyyələndirir.

Vitse-prezidentlik institutunun fəlsəfəsi ali mərhələdə siyasi kollegiallıqdan təşkil edilmişdir. Qərarların qəbul edilməsi və icra edilməsi zamanı çox tərkibli mövqelərin varlığını səciyyələndirir. Dövlətin strateji idarəçiliyində çoxsahəli və çoxistiqamətliliyi əsaslandırır. İdarəçilikdə strateji məzmunlu kompleksliliyi yaradır.

Hökumətdə vitse-prezident prezidentin ölümü, istefası və ya qeyri-potensialı ilə bağlı başlıca məsuliyyətini Prezidentin yerinə yetirməkdir. Prezident müavinləri prezidentlə birgə prezidentin seçkisindən sonra müstəqil olaraq seçilmiş yoldaşları və ya nadir hallarda seçilirlər.

Çoxşaxəli nəzarət və tapşırıqlar, göstərişlər sistemi, strukturu formalaşır. Dövlət rəhbərinin səlahiyyətlərinin rəhbər-köməkçilər arasında bölüşdürülməsi dövlət rəhbəri postunun möhkəmləndirilməsini və ətraf qurşaqlar sisteminin yaradılmasını özündə ehtiva edir. Dövlət rəhbəri postunun gücləndirilməsi özlüyündə dövlətin idarəçilik sisteminin gücləndirilməsini əks etdirir.

Vitse-prezidentlik institutu da dövlət başçısının yardımçı-rəhbərlər şəbəkəsindən təşkil edilmişdir. Bu şəbəkə idarəçiliyin yuxarı mərhələsində idarəetmənin şaquli və üfüqi istiqamətdə xətləri artırır. Yuxarıdan-aşağıya və aşağıdan-yuxarıya nəzarət mexanizmisi üzrə piramidalarını yaradır.

Analiz

Nəzarət cəmiyyətdə baş verən proseslər haqqında lazımi, hərtərəfli məlumatlar almaq üçün mühüm kanallardan biridir. O cəmiyyətin bütün bölmələrinin normal funksiya göstərməsi, xalqın maraqlarına necə əməl edilməsi haqqında obyektiv mühakimə yürütməyə kömək edir. Nəzarətin düzgün təşkili hər bir məmurun konstitusiya, qanunlar və digər normativ aktlara əməl etməsini təmin edir. Qəbul olunmuş qərarların həyata keçməsi üçün təşkilati iş aparılır. Yaranmış problemlərin həlli üçün praktiki addımlar atılır[5, s.12].

Elmi ədəbiyyatda nəzarət problemlərinə az diqqət yetirilir. Nazarətetməyə sistemli baxış hüquq elminin təhqiqat obyektinə çevrilməmişdir. Hüquqşünas alimlərin nəzarətin ümumi nəzəriyyəsini zənginləşdirmək üçün hüquq elm sahələrinin və dövlət hüquq nəzəriyyəsinin təhlili ümumiləşdirmə və sintez etməklə prinsipial metodologiyasına, prinsiplərinə, strukturuna, sisteminə və nəzəri anlayışlarına tətbiqi məsələlərinə baxmaları zamanın tələbidir. Nəzarət problemlərinə sistemli baxış müxtəlif elm sahələrinin tədqiqat obyektinə çevrilməlidir.

Məlumdur ki, bütün nəzarət növləri, o cümlədən dövlət nəzarəti sosial nəzarətin müxtəlif təzahürləridir. Sosial sözü insanların həyat və münasibətləri ilə əlaqədar olmaqla cəmiyyətə xasdır. Sosial nəzarət Sovetlər dövründə "sosial" sözündən yaranmış "sosialist" nəzarətindən fərqli idi.

Bu fərq sosialist nəzarətinin sinfi–sosial xarakterli olmasında, yəni nəzarətin yeni və ali növü olmaqla sosialist cəmiyyətində qulluq etməsində idi. Bu keyfiyyətdə xalq nəzarəti çıxış edirdi. Sosial nəzarətin xarakteri ictimai münasibətlərin hakimliyi ilə müəyyən olunur və öz növbəsində sosial sistemin fəaliyyət göstərməsinə və inkişafına ciddi təsir göstərir.

Sosial mexanizmin köməyi ilə cəmiyyət və onun bölmələrinin (qruplar,təşkilatlar) sosial sistemin funksiya göstərməsinə ziyan gətirən pozuntularına müəyyən məhdudiyyətlər qoyulur. Bu məhdudiyyətlərin keyfiyyətində hüquqi və mənəvi normalar, adətlər və ənənələr durur[3, s.41].

Cəmiyyətin dinamik inkiaşfı sosial nəzarətin daim dəyişdirilməsinə, yeni şəraitə və məqsədlərə uyğunlaşmasına şərait yaradır. Sosial nəzarət mexanizmin mahiyyətinə cəmiyyətin sosial idarəetmənin fəaliyyət prinsiplərinin, funksiyaların, forma, metod və vasitələrin nəzarətin hüquqi aspektlərini araşdırmaqla nail olmaq olar. Sosial nəzarət sistemi mürəkkəb olmaqla nəzarət subyektlərinə görə cəmiyyət, dövlət, ayrı–ayrı dövlət orqanları, ictimai təşkilatlar, əmək kollektivləri, vətəndaşlar daxildir.

Sosial nəzarət cəmiyyətin idarə olunmasında sosial-siyasi mexanizmin təkmilləşdirilməsində, qarşıda duran sosial və iqtisadi məsələlərin müvəffəqiyyətli həllində mühum vasitə olur. Sosial nəzarətin düzgun qurulmaması bir tərəfdən idarəetmə sistemini kövrək vəziyyətə gətirir, müxtəlif antisosial formaların yayılması ilə insanların davranış normalarının tələblərindən kənara çıxmaları, digər tərəfdən ictimai həyatın bütün sahələrində durğunluğa səbəb olur.

Ümumiyyətlə sosial nəzarətə sosial, hüquqi və idarəetmə aspektlərində baxılır. Sosial aspektdə nəzarətə, qoyulmuş çərçivədə norma və meyarların köməyi ilə insan davranışının müəyyən xüsusiyyətlərinin təhlili kimi baxılır. Sosial nəzarət insan davranışının bu çərçivədən kənara çıxmasına qadağa qoyur. Sosial nəzarət cəmiyyətin, dovlətin və onun orqanlarının, ictimai təşkilatların və kollektivlərin və başqa sosial təsisatların mühüm funksiyası, vətəndaşların subyektiv hüquqlarıdır[2, s.13].

Hüquqi aspektdə nəzarətə cəmiyyət və idarəetmə fəaliyyətinin tənzimlənməsini təmin edən funksiya kimi baxılır. Sosial nəzarətin inkişafının mühüm istiqaməti onun hüquqla üzvi bağlılığıdır. Hüquq insanların davranışının tənzimləmə vasitəsi kimi çıxış edir. Əgər hüquq dövlətin və xalqın iradəsini qanunla ifadə edirsə, nəzarət insanların davranışının bu iradəyə uyğunluğunu aşkar və təmin etmək rolunu oynayır. Əgər sosial norma davranışın miqyasıdırsa, nəzarət insanların davranışının bu miqyasa uyğunluğunu aşkar etmək üçündür.

Bir sıra ölkələrdə iki və ya daha çox vitse-prezident var - İranın 12 vitse-prezidentinin həddindən artıq həssas bir işi olsa da, vitse-prezidentləri olan bir çox hökumət bu vəzifədə bir nəfərdir. Başçı olmadıqda, ölür, istefa edir və ya vəzifələrini yerinə yetirə bilməyəcəksə, vitse-prezident ümumiyyətlə prezident olacaqdır. Bir çox başçılıq sistemində vitse-prezident gündə gündəmdə olan siyasi hakimiyyətə malik deyil, hələ də kabinetin mühüm üzvü hesab olunur. Amerika Birləşmiş Ştatlarının bir neçə vitse-prezidentləri Senatın sədri vəzifəsini tuturlar; Məsələn, Argentina, ABŞ və Uruqvay bu vəziyyətdədir. Başçı köməkçisi bəzən prezidentin bəzi mərasim vəzifələrini, məsələn, faktiki prezidentin iştirak etmək üçün çox məşğul ola biləcəyi funksiyalara və tədbirlərə qoşulmağı nəzərdə tutur; ABŞ-ın vitse-prezidenti, məsələn, prezident adından dünya liderlərinin cənazələrini tez-tez ziyarət edir. Parlamentdə və ya yarı prezidentlik sistemlərində bir Başçı Prezident Hindistanda və Namibiyada olduğu kimi bir baş nazirlə birlikdə ola bilər, amma hər iki qurumun eyni vaxtda olması nadirdir.

Vitse-prezidentlik institutunun fəlsəfi mahiyyətini bu cür ümumiləşdirmək olar:

*- dövlətin ali idarəçiliyinin münbitləşdirilməsi və çoxfunksionallığı;*

*- piramidal idarəçiliyin ali, mərkəzi və aşağı mərhələləri arasında bağlılığın daha da artması;*

*- dövlət başçısı səlahiyyətlərinin icra bölgüsünün çoxalması və təkrarən mexanizmləşməsi;*

*- fikirlərin çoxluğu hesabına ali dövlət idarəçiliyinin zənginləşməsi və komponentlərin qarşılıqlı əsaslandırılması;*

*- dövlət başçısı səlahiyyətlərinin bölgüsü və səlahiyyətlər və funksiyalar üzrə tarazlığın çoxalması;*

*- çoxvektorluluq hesabına ali dövlət idarəçiliyinin təkmilləşdirilməsi;*

*- dövlət başçısı ilə hakimiyyət növləri arasında koordinasiyanın möhkəmləndirilməsi, əlaqələrin çoxaspektliliyindən sadəliyə keçidlər etməsi;*

*- dövlət hakimiyyətinin növləri arasında ali səviyyədə bağlılığın möhkəmlənməsi;*

*- dövlət başçısı postunun daha dayanıqlı olması və səlahiyyətlərinin çoxvektorlu əsaslarla daha da gücləndirilməsi;*

*- ali dövlət idarəçiliyi sistemində harmoniyanın, simmetriyanın möhkəmləndirilməsi;*

*- dövlət hakimiyyəti üzərində nəzarət vasitələrinin artması;*

*- ali dövlət idarəçiliyi üçün təşkilati funksiyaların artması və siyasi sistemdə komponentlərin çoxalması;*

*- ali dövlət idarəçiliyi üzrə müasir zolağın, qurşağın formalaşması;*

*- dövlətin ali pilləsində vasitəçiliyin və nümayəndəçiliyin çoxalması;*

*- ali dövlət idarəçiliyində paylanma hesabına dövlət idarəçiliyinin inkişaf etməsi;*

*- ali dövlət idarəçiliyində sistemin təşəkkülü və dövlət başçısı postunun institutlaşması və tərkib komponentlərə ayrılması, bu nöqteyi-nəzərdən da strukturlaşması;*

*- ali mərhələdə dövlət siyasətinin primitiv olması və strateji xətlərin artması;*

*- ali mərhələdən aşağıya doğru piramidal pilləkənin güclənməsi;*

*- ali idarəçilikdə qərarların təsdiqində kollegiallığın artması və ali postun sistemləşməsi və.s.*

Prezident üsul idarəsinə sahib olan dövlətlərdə prezident hakimiyyətlərin başçısı və dövlətin başçısıdır. Bu 3 hakimiyyət növlərinin təşəkkül etməsində prezidentin dövlət başçısı kimi təyinedici (siyasəti), təsdiqedici (siyasət istiqamətlərini və hüquqi normaları), təqdimedici (strukturların təşəkkülü və

vəzifələrlə əlaqədar) səlahiyyətləri vardır. Dövlət rəhbəri hakimiyyətdən hesabat istəyir və xalq qarşısında hakimiyyətin işi ilə əlaqədar yekun hesabat verir. Dövlət rəhbəri xalqa xidmətlə xalq qarşısında vasitəçi rolunu daşıyır. Xalqın sifarişlərini hakimiyyətlərə verir və görülən işlərlə əlaqədar hesabat istəyir.

Dövlət rəhbərinin konstitusion səlahiyyətlər hesabına təyin etdiyi dövlət idarəçiliyi hakimiyyət qolları ilə icra edilir. Prezident bilavsitə icra hakimiyyətinin lideridir. Hakimiyyətin növləri piramidal strukturun zirvəsində dövlət başçısı postunda birləşir. Hakimiyyət qolları idarəetməni sahələrə bölür. Dövlət idarəçiliyində səlahiyyət bölgüləri sahələr üzrə şaxələnir.

Rəhbərlik hakimiyyətlərin özlərində və aralarında pilləvari qaydada idarəçiliklə, nizamlayıcıqla, normalar yaratmaqla təşkil edilir. Piramidal sistemdə olan piramidalar tabeçilik ilə aşağıdan yuxarıya doğru təşəkkül edir. Forma olaraq tam və yığcam olur. Tabeçilik və pilləvari tapşırıqlar prinsipi trayektorik xətləri, cızıqları yaradır. Dövlət başçısının və hakimiyyət qollarının qəbullandıqları hüquqi sənədlər və onlara riayət etmək özü piramidalar sistemini ərsəyə gətirir. Daxili piramidalar xarici görünüşcə bütöv piramidanın təşəkkülünü təmin edir.

Dövlət rəhbərinin konstitusion səlahiyyətləri vardır. Həmin səlahiyyətlər hakimiyyətin 3 növünü təşkil edir. Dövlət başçısı öz idarəçiliyini bu 3 istiqamətə yönəldir. Sözügedən 3 istiqamət üzrə nəzarət böyüyür, müşahidələr çoxalır. Bunlar normalar sisteminin təşəkkülündə və normaların icra edilməsində özünü biruzə verir.

Vitse-prezidentlik elmi cəhətdən 2 əsas istiqaməti müəyyən edə bilir:

I Dövlət rəhbərinin bəzi məqamlarda əvəz edilməsi, səlahiyyətlərinin icrasını təşkil etmək;

II Səlahiyyətlərin rəhbər-köməkçilər kimi bölünməsini həyata keçirmək. Anlayışın elmi əsaslarından aydın olur ki, vitse-prezidentlər prezidentin öz funksiyasını yerinə yetirə bilmədiyi zaman onun funksiya səlahiyyətlərini yerinə yetirən şəxslərlə yanaşı, konstitusion səlahiyyətlərinin təmin edilməsi üzrə yardımçı rəhbər kəslərdir. Bu yanaşma anlayışın təyinatı funksiyasını əsaslandırır.

Elmi cəhətdən irəli gələrək, vitse-prezidentlərin təyin edilmiş hüquqi statusları ilə əlaqədar bu cür nəticəyə gəlmək olar:

– I Vitse-prezident – dövlət rəhbərinin icra hakimiyyətinə əsasən səlahiyyətli köməkçisi – bu qola başçılıq edən kəs;

– Vitse-prezident – dövlət rəhbərinin qanunverici hakimiyyət üzrə səlahiyyətli rəhbər yardımçısı;

– Vitse-prezident – dövlət rəhbərinin məhkəmə hakimiyyəti üzrə səlahiyyətli rəhbər yardımçısı;

– Vitse-prezident – dövlət rəhbəri ilə xalq arasında əlaqələrdə funksional rəhbər yardımçısı. İctimai vəzifəyə malik və siyasi-ideoloji işlərə başçılıq edən kəs.

Beləliklə, yuxarıda qeyd edilənlər göstərir ki, Azərbaycanda nəzarətin həqiqətən effektiv olması, onun inkişaf etmiş ölkələrin səviyyəsinə uyğunlaşması məqsədilə çox mühim və sərt dəyişikliklər aparılmalıdır.

İlk olaraq ölkədə nəzarətlə bağlı elmi əsaslara dayanan və formalaşan nailiyyətlər, habelə beynəlxalq elm, bu istiqamətdə təcrübənin uğuru, müasir Azərbaycan cəmiyyətinin xüsusiyyətləri, tarixi irs və ilkin mövqelər, konstitusion və hüquqi normalar nəzərə alınmaqla nəzarətdə islahatların və onun inkişafının, nəzarət sisteminin təkminləşdirilməsinin konsepsiyasının işlənib hazırlanması lazımdır. Oda qeyd olunmalıdır ki, həmin konsepsiyada və orda qeyd olunmuş fikirlər dövlət səviyyəsində vacib akt olduğundan, bu baxımdan mühim dövlət qərarları qəbul edilməlidir [3, 145].

Fikrimizcə, nəzarət perspektivi üçün müxtəlif sektorlar üzrə maliyyə nəzarəti haqqında Azərbaycan Respublikasının Qanununun qəbul edilməsi zəruridir. Qanunda dövlət nəzarəti və dövlət nəzarəti sistemi anlayışları verilməlidir. Hüquqiəsasda planauyğun nəzarət işi apara biləcək nəzarətin əlaqələndirici orqan məsələsi dəhəll edilməlidir.

## Ədəbiyyat:

1. According to The Economist, on the website LinkedIn, the title of vice-president grew 426% faster than website membership growth, from 2005 to 2009

2. B.M.Marume, R. R. Jubenkanda, C. W. Namusi, Administrative Control and Evaluation, International Journal of Science and Research (USR), 1074-1083, 2012.

3. Benjamin Ginsberg. The Fall of the Faculty: The Rise of the All-Administrative University and Why It Matters (2011). Oxford University Press.

4. J.D.Teece, Business Strategy and Innovation, Long Range Planning, Volume 43, Issues 2–3, April, June 2010, 172–194.

5. J.Thompson, A.Arthur, Strategic Management; McGraw-Hill Irwin, Tosun, Kemal; İşletme Yönetimi; İstanbul, 2014

6. K.Fişek, Yönetim, Ankara Üniv.Siyasal Bil.Fak.Yay.No:387, 11-ci baskı, Ankara; 2015.
7. Kamil Ufuk Bilgin, Kamu Yönetiminde *Yönetsel İletişim*, Çağdaş Yerel Yönetimler, 5/2, 2006, 25-35.
8. M.Şimşek, Ç.Şerif, Yönetim ve Organizasyon,Eğitim Kitabevi, Konya, 2011.

**Theoretical foundations of the Vice-Presidential Institute**

**Summary**

In order to strengthen the role of the state in the political sphere, issues of setting up a strong regulatory legal basis of control, its contemporary methodological, methodological and material, technical support, as well as controlling structures with high qualifications, reliable personnel, should be solved and real actions should be taken in this respect. The problems of social security of the surveillance system, the stimulation of workers in the state control, and the provision of their physical protection, should be solved in their turn. For example, the high level of salaries paid by supervisors ensures that they are independent and that they operate efficiently.

There is a philosophical and scientific explanation of Vice Presidential Thinking. The philosophy of understanding consists of its depth and complexity, as well as its simplicity. The vice-president institute's philosophical notion has two basic lines: formation of diversity in political governance at the highest levels; Deepening and diversifying higher governance Both vertical and horizontal hierarchy are both simplified and multicolored. Both lines create unity & ensure integrity Integrity ensures firmness. At the highest level, the head of government is separated from the point of view of the task and unites with a new governing spirit.

The single pyramid of public administration consists of pyramids. In this regard, the vice president also plays the role of a shocking supporter that creates new pyramids from the combination of existing pyramids in public administration. Thanks to the vice president, the number of pyramids combining in the peak increases and grows in the same form. The vice-president creates new pyramidal lines and forms large volumes of inner pyramids. In addition to the philosophical essence of the vice-president institute, there are scientific foundations, conceptual, scientifically-constructive forms. Scientific forms also form the content of the components of the concept.

**Теоретические основы института вице-президента**

**Резюме**

В целях усиления роли государства в политической сфере должны быть решены вопросы создания прочной нормативно-правовой базы контроля, его современной методологической, методической и материально-технической поддержки, а также контролирующих структур с высокой квалификацией, надежных кадров, и должны быть предприняты реальные действия в этом направлении. Проблемы социальной защиты системы наблюдения, стимулирования работников государственного контроля и обеспечения их физической защиты должны решаться в свою очередь. Например, высокий уровень заработной платы, выплачиваемой супервайзерами, обеспечивает их независимость и эффективную работу. Существует философское и научное объяснение вице-президентского мышления. Философия понимания состоит в ее глубине и сложности, а также в ее простоте. Философское понятие института вице-президента имеет две основные линии: формирование разнообразия в политическом управлении на высших уровнях; Углубление и диверсификация высшего управления Как вертикальная, так и горизонтальная иерархия являются как упрощенными, так и многоцветными. Обе линии создают единство и обеспечивают целостность Честность гарантирует твердость. На высшем уровне глава правительства отделен с точки зрения поставленной задачи и объединяется с новым руководящим духом.

Единая пирамида государственного управления состоит из пирамид. В этом отношении вице-президент также играет роль шокирующего сторонника, который создает новые пирамиды из комбинации существующих пирамид в государственном управлении. Благодаря вице-президенту число пирамид, объединяющихся в пике, увеличивается и растет в форме. Вице-президент создает новые пирамидальные линии и формирует большие объемы внутренних пирамид. Помимо философской сущности института вице-президента, существуют научные основы, концептуальные, научно-конструктивные формы. Научные формы также формируют содержание компонентов концепции.

**Rəyçi: dos. M.Yolçuyev**

# PEDAQOGİKA PEDAQOGY ПЕДАГОГИКА

**Məmmədov Şahkərəm Mirzəməmməd oğlu**
Bakı Slavyan Universiteti
sahkerem_59@mail.ru

## KİÇİK YAŞLI MƏKTƏBLİ İBTİDAİ TƏHSİLİN SUBYEKTİ KİMİ

***Açar sözlər:*** *kiçik məktəb yaşı dövrü, ibtidai təhsil, təlim fəaliyyəti, motivasiya*
***Key words:*** *the period of primary school age, primary education, learning activities, motivation*
***Ключевые слова:*** *период младшего школьного возраста, начальное образование, учебная деятельность, мотивация*

Məktəbə qədəm qoymaq uşağın həyatında çox vacib hadisədir. Bu onun həyatında tamamilə yeni bir mərhələnin – məktəb həyatının başlanğıcıdır. Bu başlanğıc uşağın cəmiyyətdə yeni ictimai vəzifə – şagird vəzifəsinin tutmasına imkan yaradır. 6 yaşlı uşağa onu əhatə edən insanların gözündə yeni bir yaş dövrünə keçməsi çox cəlbedici və maraqlı təsir bağışlayır. Düzdü, məktəbə hazırlıq dövründə uşağı məktəbli forması, rəngarəng çantalar, qəşəng qələm, qələmqabları və bu kimi zahiri atributlar daha çox cəlb edir. Bu atributlar uşaqların məktəbəqədər dövrdə qazandıqları biliklərlə birgə yeni şərait, yeni dostların qazanılması, şagirdlərin öz idrak imkanlarını sərgiləməsi, ətraf aləmin dərk edilməsi və dünyagörüşünü genişləndirməsi kimi tələbatlarının formalaşmasına şərait yaradır.

Uşağın yeni ictimai status qazanması növbəti yaş dövründə (kiçik məktəb yaşı dövrü) psixoloji dəyişikliklərinin yaranmasına və təlim fəaliyyətinin dərk olunmasına zəmin yaratmış olur. Uşağın şagird adını qazanması böyüklərlə yeni qeyri-situativ şəxsi ünsiyyət formasına keçid kimi də başa düşülür. Uşaqlar böyük həyəcan və həvəslə böyüklər aləminin hörmətli nümayəndəsi olan müəllimlə görüşü gözləyirlər. Əgər uşaq müəllimin hərəkətlərinə etalon (nümunə) kimi baxırsa, onu özünə nümunə kimi qəbul edirsə, onun peşə keyfiyyətlərini qəbul edirsə, bu, uşağın məktəb mühitinə münasibətlərini asanlaşdırır və onun şagird kimi mövqeyini realizə etməsinə şərait yaratmış olur.

İ.Y.Kulaqina yazır: “Təlimin sinif-dərs sistemi uşağın yalnız müəllimlə xüsusi münasibətini deyil, həmçinin digər uşaqlarla özünəməxsus münasibətlərini müəyyənləşdirir.Təlim fəaliyyəti mahiyyətcə kollektiv fəaliyyət hesab edilir. Şagirdlər birgə təlim fəaliyyətini yerinə yetirərək bir-biri ilə işgüzar ünsiyyətə, qarşılıqlı münasibətlərə alışırlar”. *(*7, s.108.)

Şagird təlim prosesində iştirak edən insanlarla yeni münasibət qurduqca, təhsilin ictimai əhəmiyyətini başa düşür və ətraf aləmi dərk etməyə başlayır. Uşaqlarda bu zaman yeni dəyərlər sistemi formalaşır və onlar üçün əvvəlki həvəsləndirici oyunlar öz sövqedici marağını itirir, əvəzinə isə ətraf mühitdəki əşya və hadisələri qavramaq üçün idarki maraqlar yaranır (1).

Oyun kiçikyaşlı məktəblinin həyatında artıq əsas yeri tutmur, onun yerini uşağın gələcək inkişafını təmin edə biləcək təlim fəaliyyəti tutur. Yavaş-yavaş uşaq oyunlara az vaxt ayırır, oyunların məzmununu məktəblə bağlı hadisələr təşkil edir. Oyunda tərəf müqabili isə sinif yoldaşları olur. Beləliklə, kiçikyaşlı məktəblinin əsas tələbatı yaxşı şagird kimi seçilmək istəyi olur.

Uşaqların yeni ictimai rola – şagird roluna yiyələnmələri onlarda emosional hisslərin və şəxsiyyətə aid keyfiyyətlərin inkişafına əsaslı surətdə təsir edir ki, bu da ictimai təəssuratlar diapazonunun genişlənməsinə səbəb olur.

Şagirdin ictimai əhəmiyyətli vəzifəsinin dəyərləndirməsi onun daxili hisslərinin inkişafına və xarakterinin formalaşmasına səbəb olur. Bu zaman kiçikyaşlı məktəblilərin duyğu hissələri daha da güclənir. Bu da onlarda əxlaq normaları və mənəvi düşüncəni formalaşdırır (4;5).

Şagirdin məktəb mühitinə daxil olması müsbət psixoloji dəyişikliklərə səbəb olur və hərəkətlərini düzgün istiqamətləndirməsinə şərait yaradır. Nəticədə davranışda uşaqlıq əlamətləri itir. Uşaq etdiyi hərəkətlərin nəticəsini əvvəlcədən nəzərə almağı bacarır, öz hisslərini ətrafdakılardan gizlətməyi bacarmağı öyrənir. Öz təlim fəaliyyətinin əhəmiyyətini və öz ictimai rolunu anlamaqla uşaq məktəbli mövqeyində olduğunu duyur. Yeni bilik və bacarıqalr qazandığı zaman səyi və əməyinin böyüklər tərəfindən dəyərləndirilməsi arzusu təlim fəaliyyətinin uşaq üçün daha ciddi xarakter almasına səbəb olur.

Təlim fəaliyyəti ictimai xarakter kəsb edir. Şagirdin təlim fəaliyyətinin nəticələri əhatəsindəki yaşlı insanlar və yaşıdları tərəfindən qiymətləndirilir. Onların şagirdə münasibəti bilavasitə təhsildəki müvəffəqiyyətindən asılı olur. Təlim prosesində şagird tədricən daha mürəkkəb – borc, məsuliyyət, öhdəçilik, təhsildə icbarilik və bu kimi sosial motivləri mənimsəyir.

Təlim fəaliyyəti – mürəkkəb, səciyyəvi xüsusiyyətlərə malik fəaliyyət növü olub, şagirdin əmək fəaliyyətinin başlanğıcı hesab edilir. Təlim prosesi yalnız kiçik məktəb yaş dövrü ilə bitmir, insan həyatının uzun bir dövrünü əhatə edir. Təlim fəaliyyəti bütün şagirdlərə aid olan nümunələr, normalar, qayda və qanunlara riayət etmək və bu kimi vasitələrlə səciyyələnir. Onun əsas məqsədi şagirdlər tərəfindən elmi anlayışlar sisteminin mənimsənilməsi, onların tətbiqi, geniş təlim məsələlərinin həlli üçün lazım olan məlumatların əldə olunmasına və onlardan istifadə etmək üsullarının öyrənilməsidir. Təlim fəaliyyəti ibtidai sinif şagirdlərini, həmçinin psixoloji cəhətdən formalaşdırır. Kiçikyaşlı məktəblilərin yeni səciyyəvi psixoloji xüsusiyyətləri bunlardır:

- sərbəstlik – məqsədin müstəqil olaraq müəyyənləşdirilməsi, davranış və fəaliyyətini ona uyğunlaşdırması ;
- hərəkətləri planlı qurmaq – hərəkətləri öz ağlı ilə yerinə yetirmək bacarığı, qurulan bütün əməliyyatların dərk edilməsi, əməliyyatların həllində alınan nəticələrin proqnozlaşdırılması;
- refleksiya – davranış və fəaliyyətin dərk edilməsi və onların təkmilləşdirilməsi imkanlarının yaradılması;
- empatiya – başqalarını duymaq və qəbul etmək istəyinin olması.

V.İ.Maksakovanın dediyi kimi: “Kiçikyaşlılar məktəb yollarının başlanğıcında ən xoşbəxt insanlardır.” Çünki bu dövrdə uşaqlığın əsas tələbatı, böyük olmaq arzusu ilk dəfə ciddi, çətin, maraqlı, ictimai əhəmiyyətli bir dövrün başlanması ilə, daha doğrusu təlim fəaliyyətində öz həllini tapır. Məhz təlim fəaliyyəti şagirdin əsas məşğuliyyətinə çevrilir, vaxtını alır, əvvəlki fəaliyyət növləri ilə (oyun, ünsiyyət və s.) əlaqələnir, şagirdin yeni həyatını mənalandırır və ətrafdakıların maraqlı mövzusuna çevrilir (9, s.9).

V.İ.Maksakova eyni zamanda qeyd edir ki, məktəbə getməyə başlayan uşaq özünün digərlərindən fərqləndiyini başa düşür. Belə ki, özündən kiçiklərdən məktəbli olması, özündən bir neçə yaş böyüklərdən təhsilə yenicə başlaması ilə fərqləndiyini anlayır. Yuxarı sinif şagirdləriilə onları doğmalaşdıran fakt isə onların eyni vaxtda və ya eyni zamanda eyni məktəbdə oxumalarıdır (9, s.9).

Ümumi təhsilin başlanğıcı uşaq üçün çox çətin dövr hesab edilir. Çünki yeni ictimai vəziyyət, fərqli psixoloji yanaşmalar, fərqli yaşam tərzi böyük məsuliyyət tələb edir. Məktəbli adını qazandığı gündən uşaq daha müstəqil, məsuliyyətli olmalı və özünü idarə edə bilməyi, yorğunluğa, sıxıntıya sinə gərməyi bacarmağa öyrəşməlidir. Bundan əlavə uşaqlarda həm məktəbdə, həm də evdə yeni, ciddi, heç də asan olmayan öhdəçilikləri və məşğuliyyətləri yaranır. Bütün bunlar onun yeni ictimai rolu daşıması ilə əlaqədardır. Bu məsuliyyəti mənimsədikcə şagird tədricən təhsil mühitinin subyektinə çevrilir.

Kiçikyaşlı məktəblilərin organizmdə inkişafı sürətlə gedir və bu, onların sümük- dayaq-əzələ sistemində özünü göstərir. Uşaqların boyu, çəkisi, eləcə də bədən mütənasibliyi dəyişir.

Kiçik məktəb yaş dövründə uşaqlarda fizioloji proseslər də dəyişir, əsasən beyin yarımkürəciklərinin qabığının yetişməsi başa çatır ki, bu da uşağa sistemli təhsilə başlamağa imkan verir. Baş beyinin düzgün quruluşu, onun strukturları arasında əlaqə, uşağın psixi və psixoloji durumuna müsbət təsir göstərir ki, bu da şagird kimi məktəb təhsilinə uğurlu yiyələnməsini təmin edir. Eyni zamanda uşaqlarda psixi proseslərin gedişi ilə dəyişir. Yaddaş sərbəstləşir, qeyri-sərbəst yaddaş da əvvəlki illərə nisbətən daha məhsuldar olur. Yaddaşın həcmi və tutumu hiss ediləcək dərəcədə artır. Düzdü, hələki mexaniki yaddasaxlama üstünlük təşkil edir, amma düşüncəli yaddasaxlama meyli getdikcə güclənir.

Kiçikyaşlı məktəblilərin qavrama qabiliyyətlərinin təhlili onların beyninin müxtəlif səslər, rəng çalarları, əşya və hadisələrin xüsusiyyətlərinə reaksiya verən hissəsinin formalaşdığını bildirir ki, bu da uşaqların müşahidəçilik qabiliyyətlərini gücləndirir. Kiçikyaşlı məktəblilərin qavrama imkanlarını psixoloq A.A.Lyublinskaya belə xarakterizə etmişdir: “Qavrama uşaqların müşahidə qabiliyyətlərinin mükəmməlləşməsinə rəğmən məqsədyönlü və idarəolunan prosesə çevrilir. Qazanılmış təcrübə nəticəsində 6-9 yaşlı uşaqlar əşyaları, şəkilləri asanlıqla tanıyırlar. Hətta tanış olmayan mexanizmlər, bitkilər, işarələri də məktəblilər hansı əşya qrupuna aid olduğunu anlayırlar.” (8, s.173-174.)

Kiçikyaşlı məktəblilərin diqqəti də tədricən mütəşəkkilləşməyə başlayır, diapazonu genişlənir, uşaqlarda diqqətin davamlı və dayanıqlığı çox olmasa da paylanması və ötürülməsi vərdişləri inkişaf edir.

Kiçikyaşlı məktəblilərin təfəkkürü praktik təsəvvürlərdən əyani təsəvvürlərə, sonra mücərrəd və dərketməyə keçməklə inkişaf edir.

Bu dövrdə şagirdlər gördükləri, eşitdikləri, müşahidə etdiklərini aydın başa düşür və mənimsəyirlər, başqa sözlə, obyekt və ya hadisələri dərk etməyə maraq göstərirlər. Təhsil aldığı dövrdə uşaqlar daha çox

düşünülmüş hərəkətlər nümayiş etdirir, onlarda məntiqi analiz və sintez qabiliyyətləri inkişaf edir, öz təsüratları ilə bölüşməyi bacarır, müşahidə etdiklərini müqayisə etmək, yoldaşlarının davranış hərəkətlərinə tənqidi yanaşmaq bacarığı özünü biruzə verir. Bütün bunlar alınan məlumatların artan həcmini düzənləməyə, təlim fəaliyyətini mürəkkəb üsullarını mənimsəməyə imkan verir. Bəzi uşaqlar (xüsusilə qızlar) öz təlim fəaliyyətinin ictiami xaraktrtini başa düşür və digərlərini də öyrənməyə çalışırlar. Buna görə də öyrəndikləri materialları öz yoldaşlarına izah etməyə can atırlar.

Sistemli təlim fəaliyyətində yaddaş və təfəkkürün təsiri ilə kiçikyaşlı məktəblilərdə təsəvvürlər yaranır. Şagirdlər mütəmadi öz davranış və hərəkətlərinin nəticəsini təhlil edir, gələcək faəliyyətlərini planlaşdıra bilirlər. A.A.Lyublinskaya qeyd etmişdir ki, uşaqların təsəvvürləri başqalarını təqlid etməyin və öz fəallıqlarının nəticəsində diffuz (məktəbəqədər yaşlılarda) və fraqment formadan zəngin yaradıcı, məntiqi formaya keçir və onlar öz fəaliyyətlərini yaradıcılıq təxəyyüllərinin formalaşmasına yönəldirlər (fərdi və ya qrup halında). Kiçikyaşlı məktəblilər müxtəlif yaradıcı layihələrin qurulmasına fəal surətdə qoşulurlar (8, s.232). Tədqiqatçıların fikrinə görə bu dövrün əsas xüsusiyyətlərindən biri də nitqin sürətlə inkişaf etməsidir. Müəllimin köməyi ilə kiçikyaşlı məktəblilərdə qulaq asmaq, oxumaq və yazmaq kimi qabiliyyətlər inkişaf edir. Bu, qabiliyyətlərin yaranmasında mərkəzi sinir sisteminin inkişafı, böyük beyin yarımkürələrinin funksiyasının və beynin yarımkürəcikləri arasındakı əlaqələrin yaxşılaşması nəticəsində baş verir. Nitqin kommunikativ (ünsiyyət) və siqnifikativ (semantik) (əşya, hərəkət və hadisələri adlandırma) funksiyaları əhəmiyyətli dərəcədə artır. Nitqin fəal inkişaf etməsi uşağın hiss və duyğularını gücləndirir, inkişafın yeni mərhələsinə - ətraf aləmdə baş verənlərin məntiqlə əlaqələndirmək və sözlə ifadə etmək mərhələsinə keçidi təmin etmiş olur.

A.A.Lyublinskaya qeyd etmişdir ki, ətraf aləmdəki əşya və hadisələrin hərtərəfli analizi və eyni zamanda onların qrup və kateqoriyalar üzrə sintezi vasitəsi kimi nitq uşaqların əqli fəaliyyətinin yüksək inkişafını təmin edır. Beləliklə, nitqə malik olmaq kiçikyaşlı məktəbli üçün ətraf aləmi və gerçəklikləri, eləcə də özünü bu aləmdə dərk etmək üçün yeni üfüqlər açmış olur (8, s.300).

Təlim fəaliyyəti zamanı uşaqların koqnitiv fəaliyyət sahəsinin inkişafı, bu sahəyə rəmzi işarələrin fəal daxil edilməsi nəticəsində ətraf gerçəkliklərin və obyektlərin mücərrəd təsəvvürlərini dərk etmək mümkün olur. Müəllimin verdiyi tapşırıqların həlli vasitəsilə uşaqlar buna bənzər digər idrakı məsələləri də həll edirlər. Təlimin məzmunu və xarakteri uşaqların dünyanı dərk etməsində məntiqi-söz, fikiryürütmə səviyyəsinin inkişafını stimullaşdırır. Artıq ikinci sinifdən təlim bədii təsəvvürlərdə deyil, məntiqi modellər, sxemlərlə zənginləşir ki, bu da şagirdlərə həyatın mürəkkəb qanunauyğunluqlarını başa düşməyə yol açır. Belə təlim şagirdlərin hələ kiçik məktəb yaş dövründə nəzəri təfəkkürünün inkişafı üçün əsas yaratmış olur. Nəzəri təfəkkürün inkişafı şagirdə ətraf aləmi dərk etmək üçün əşya və hadisələrin yalnız xarici əlamətlərini deyil, daxili, gizli xassə və xüsusiyyətlərini də qavramağa imkan yaradır.

Kiçik məktəb yaşı dövrünün motivasiya dairəsi kifayət qədər mürəkkəbdir. L.İ.Bojoviç və D.B.Elkoninin tədqiqatlarına əsaslanaraq deyə bilərik ki, təlim fəaliyyətinin sosial motivləri (təlimin ictimai funksiyası) təhsildə daha çox əhmiyyət kəsb edir. Bu motivlər şagirdin çox da tanış olmadığı və yenicə qədəm qoyduğu təlim fəaliyyətinə müsbət münasibətini formalaşdırır (1;12).

Eyni zamanda uşaqlarda yüksək qiymət almaq motivləri, oyun motivləri və öyrənmə motivləri də formalaşdırmağa başlayır. Öyrənmə motivləri daha çox müvəffəqiyyətlə oxuyan uşaqlarda üstünlük təşkil edir. Bəzən məktəbə getmək həvəsi uşaqda sırf zahiri xarakter daşıyır. Başqa sözlə onlarda rəngarəng məktəb ləvazimatları, çantalar cəlbediciliyi ilə həvəs yaradır. Daha sonra isə onlarda digər motivlər yaranır, o cümlədən öyrənmə motivi formalaşır.

*Maraq* – Bir sıra alimlərin fikrinə görə kiçikyaşlı məktəblilərin maraqları dəyişkən, azömürlü, situativ, səthi olur. Kiçikyaşlı məktəblilərdə intuitiv formada biliklərə əsaslanan idraki maraqlar özünü daha aydın biruzə verir (3;8).

Təlim maraqları dinamik və çox vaxt idraki maraqlarla paralel mövcud olur. V.İ.Maksakovanın fikrincə birinci sinifdə uşağı təlim prosesinin özü, böyüklər tərəfindən təlim fəaliyyətinin təqdir edilməsi, aldığı qiymət, ikinci sinifdə - təlimin məzmunu və fəaliyyətinin nəticələri, üçüncü və dördüncü siniflərdə isə təhsil aldığı müddətdə öz müstəqilliyi və yaradıcıllıq imkanlarının nümayişi daha çox maraqlandırır (9, s.9). Doğrudan da, bu dövrdə yüksək həyəcan, iradi keyfiyyətlərin zəifliyi işin nəticəsinə marağı azaldır. Kişikyaşlı məktəblilərin motivləri sırasında fərdi motivlər – müvəffəqiyyət və nüfuz motivləri böyük yer tutur.

*İradə* - yuxarıda deyildiyi kimi kiçikyaşlı məktəblilərin hiss-həyəcanları daha güclü olduğundan onların iradəsi hələ dayanıqlı, möhkəm olmur. Onların iradəsi əsasən, bu və ya digər formada ciddi, dözümlü, intizamlı olmaq cəhdlərində böyüklərin tələblərinə riayət etməkdə, eləcə də şəxsi fikirlərində təzahür edir (3).

Bu yönümdə qızlar oğlanları qabaqlayırlar, böyüklərə bənzəmək istəyi bu işdə onlara kömək edir. Oğlanların iradəsinin inkişafına onlarda fiziki enerjinin çoxluğu mane olur.

Kiçikyaşlı məktəblilərə xas olan əlamətlərdən biri də həyata, dünyaya emosional münasibət bəsləməkdir. Lakin bəzən coşqun, çətin idarə olunan hisslər tədricən uşağın davranışını müəyyənləşdirən, biliklərinə, təfəkkürünə və iradəsinə əsaslanan düşünülmüş dəqiq hisslərə çevrilir. Belə uşaqların emosional aləmi dəyişkən və ziddiyyətli olur. Onlar özünün və digərlərinin hiss və emosyalarını çətin qəbul edir və başa düşürlər.

*Münasibətlər* – Müəllimi ilə münasibətlər, ilk növbədə kiçikyaşlı məktəblinin təlimdə uğuru və uğursuzluğunu müəyyən edir. Belə ki, bu yaşda uşağın şəxsi yüksəlişi, müvəffəqiyyəti üçün şəraitin yaradılması, ona təlim fəaliyyətində uğur gətirən, eləcə də həmyaşıdları və böyüklərlə düzgün münasibətlər qurmağa imkan verə bilən müəllim himayəsinin olması vacibdir. Bu yaşda "öyrənmək" şagird həyatının məğzini, mənasını təşkil etdiyi üçün onun özü haqqında təsəvvürləri təlim fəaliyyətinin nəticələrinin başqaları tərəfindən qiymətləndirilməsindən asılı olur.

Kiçikyaşlı məktəblinin özünə münasibətini hörmət adlandırmaq olar, belə ki, bu yaşda şagird böyüklərin sırasına tədricən qəbul edilir. O çətin və əhatəsindəkilər üçün lazımi işlə məşğul olur, məktəblinin heç də asan olmayan intizam qaydalarına riayət edən, yüksək mənəvi keyfiyyətlərə malik (xeyirxahlıq, dürüstlük, səxavətlilik) olmağa çalışır, yalnız insanların deyil, heyvanların, bütövlükdə təbiətin sədaqətli dostu, böyükləein inamlı köməkçisinə çevrilir. Düzdür, biz şagirdin ideallaşdırılmış obrazından söz açdıq ki, bu uşağa özünü həqiqi dəyərindən artıq qiymətləndirməsinə əsas verir. Lakin unutmaq olmaz ki, özünü həqiqi dəyərindən artıq qiymətləndirmə uşağın hərtərəfli inkişafında əsas şərt və səmərəli həyat tərzi üçün təməl ola bilər. Təlim fəaliyyətinin kollektiv xarakterli olması ilə bağlı məktəblinin özünüqiymətləndirməsi, sabitliyi və mühitə uyğunluğu da artır. İbtidai məktəb dövründə şagirdin özünüqiymətləndirməsi situativ və dəqiq olaraq qalır, amma tədricən özünün və sinif yoldaşlarının imkan və təlimdə nəticələrini qiymətləndirmək qabiliyyəti inkişaf edir. Bu zaman kiçikyaşlı məktəblinin özünüqiymətləndirməsi müəllimin qiymətindən asılı olur. Uşağın sinif yoldaşları və valideynləri məhz müəllimin onu qiymətləndirməsinə əsaslanırlar və şagirdin mənəvi keyfiyyətlərinin inkişafına təkan verirlər.

Kiçikyaşlı məktəblinin həyatında əsas yeri sinif tutur. Şagird sinfi fiziki şəxslərin birliyi, sonra psixoloji məkan, bütövlükdə isə məktəb təmsilçiləri kimi qəbul edir. Kiçikyaşlı şagirdin məktəbdə rahatlığı ilk illərdə məktəbin nailiyyətlərindən, özünün, müəllimin həmyaşıdları və böyüklərin onu dəyərləndirilməsindən asılıdır.

Kiçikyaşlı məktəbli böyüdükcə pedaqoji təsirlərin obyektindən təlim fəaliyyətinin subyektinə çevrilir. O, müstəqil olaraq təlimdə məqsədini müəyyənləşdirir və nəzərdə tutduğu nəticələrin arzuedilən sonluğunu qabaqcadan görməyə çalışır və öz idrakı maraq və istəklərini bu baxımdan formalaşdırır.

Kiçikyaşlı məktəbli artıq özünü ictimai əhəmiyyətli, düşünülmüş və nəzarətə tabe olan hərəkətlərlə təlimin subyekt kimi göstərməyə hazırdır. H.F. Qolovanova qeyd edir ki, bu ənənələrin əsasını şagirdin ictimai fəaliyyətin məqsədini, onun motivlərini və dəyərini anlamaq cəhdi təşkil edir (2, s.115).

Refleksiv təfəkkürlü və cəmiyyətin müstəqil üzvü kimi müəyyən həyat tərzinə malik olması, ictimai təcrübəyə yiyələnməsi kiçikyaşlı məktəblilərin sosiallaşmasının, təlimin subyektinə çevrilməsinin ilkin şərtlərini müəyyənləşdirməyə imkan verir. (Refleksiyanın elementləri, insan və əşyalar aləmini dərk etmək üçün təfəkkürün fəallığı, insanların fəaliyyətinə münasibət, dünya və bu dünyada öz yeri haqqında təsəvvürlərin formalaşdırılması, ictimai əhəmiyyətli dəyərlər və tələbatlarının aşkarlanması) (2, s.129).

Belə hesab edirik ki, məhz kiçik məktəb yaş dövründə əxlaq tərbiyəsinin bünövrəsi qoyulur. İlk vaxtlarda şagirdlərə hadisələrin, hərəkətlərin dəyərləndirilməsində valideynlər və müəllimlər köməklik göstərirlər. Yaş artdıqca zaman keçdikcə bu işlərdə və mənəvi baxışların formalaşmasında böyüklərin müdaxiləsi tədricən azalır. Əxlaq normaları və davranış qaydalarının mənimsənilməsində və başa düşülməsində şagirdlərin həmyaşıdları da fəallıq göstərirlər. Səmimilik, inam hissi, dərketmə, qavrama və bu kimi səciyyəvi qabiliyyətlər kiçik məktəb yaş dövrü mənəvi dəyərlərin formalaşması üçün senzitiv dövr hesab edilir. Məhz bu dövrdə uşağın ictimai təcrübəsi korrektə olunur və əlavə mənəvi keyfiyyətlərlə zənginləşir.

Son illər cəmiyyətdə baş verən sosial-iqtisadi dəyişikliklər uşaqların inkişafında da dəyişikliklərə zəmin yaratmışdır. Müasir dövrdə kiçikyaşlı məktəblilər əvvəlki dövrün uyğun yaşlı şagirdlərindən bir sıra xüsusiyyətləri ilə fərqlənirlər. Belə ki, müasir dövrün məktəbliləri daha müstəqil və azaddırlar. Ailə dəyərlərinə münasibətin, uşaqların tərbiyəsində ailənin rolunun dəyişməsi, uşaqların ünsiyyət dairəsinin genişlənməsi, ətraf aləmin sürətli dərk etmələri şagirdlərin ictimai təcrübəsini mükəmməlləşdirir, lakin əvvəlki illərdə olan dəyərlər o qədər də gözlənilmir. Bu dövrdə uşaqlar hər şeyə tənqidi yanaşır, dərslərdə aldıqları məlumatlarla kifayətlənmir, onlara səthi yanaşırlar. Şagirdlərin bir çoxu, xüsusilə oğlanlar, aldıqları

məlumatları dəyişdirməyə, öz münasibətlərini bildirməyə, artırmağa, müşahidə və təəssüratlarını bölüşməyə çalışırlar. Hətta bəzən müəllimləri və sinif yoldaşlarının fikirləri ilə razılaşmaya da bilirlər. Bu müasir dövrdə informasiya bolluğundan, uşaqların müstəqilliyi, kompleksizliyi və fikir azadlığından irəli gəlir.

Müasir dövrdə oğlan və qızlar arasında fərq aydın biruzə verilir. Bu dövr uşaqlar öz cinsini dəqiq bilir və bunu əks cinsə sübut etməyə səy göstərirlər. Uşaqların hansı cinsə mənsubiyyəti kiçikyaşlı məktəblilərin təhsili və tərbiyəsinin təşkilində çox vacibdir.

Müasir uşaqlarda ətraf aləmdəki obyektləri, müxtəlif texniki yenilikləri (komputer, qadgetler və s.) dərk etmək, onları öyrənmək, onlarla işləmək bacarığı daha tez yaranır. Heç təcrübəsi olmayan uşaqlar belə onlara tanış olmayan əşyaları daha tez, surətli öyrənir və çəkinmədən istifadə edirlər. Bu işdə onlar valideynlərini də qabaqlayırlar.

Uşağı məhz ibtidai təhsil müddətində gələcək həyata hazırlamaq daha da mükəmməlləşməyə həvəsləndirmək, maraq yaratmaq və istiqamətləndirmək lazımdır. Bu göstərişlər ibtidai təhsil üzrə dövlət standartlarında açıqlanmışdır. Standartlara görə və təlim fəaliyyəti bilik və bacarıqlara, idraki maraqlara yiyələnməklə gələcək həyata təhsilə hazırlığın mütəşəkkil formalaşdırılmasıdır. Təlim fəaliyyətində bu amillər tədricən insanın ümumi və vacib qabiliyyətlərin, yaranmasına səbəb olur özünütəhsil tələbatlarını formalaşdırır. Təlim prosesində yaranmış uğur və təcrübə uşaqlarda öyrənmə tələbatının inkişafını stimullaşdırır və təhsilin yeni forma və məzmununa keçidi təmin edir ki, bu da fasiləsiz təhsilə yol açmış olur.

Fasiləsiz təhsilin təmin olunması insanın fəaliyyət və davranış prosesində subyektivə çevrilməsi ilə mümkündür. Məhz fasiləsiz təhsil sistemində şagirdin pedaqoji təsirlərin obyektindən pedaqoji prosesin subyektinə çevrilməsi məqsədyönlü və uğurla həyata keçirilə bilər. Bu isə hər bir şagirdin fərdi özünüifadəsi ilə müşayət olunan pedaqoji prosesdə baş tuta bilər.

Məktəbə ilk qədəm basan kiçikyaşlı məktəbli əvvəlcə pedaqoji fəaliyyətin obyekti olur, daha sonra isə o, düzgün təşkil olunmuş pedaqoji prosesin subyektinə çevrilir. Bu yaşda şagirdlərin pedaqoji təsirlərin subyektinə çevrilməsi uzun və mürəkkəb bir yol keçməli olur. L.A.Matveyeva qeyd etmişdir ki, bu yolun mürəkkəbliyi onunla əlaqədardır ki, pedaqoji təsirlər xarici təsir olub bilavasitə şagirdin şəxsi fəallığından çox asılıdır.

1980-cı illərin sonunda L.A.Matveyeva və başqaları pedaqoji prosesin subyektinə çevrilməsində şagirdin aşağıdakı xüsusiyyətlərini müəyyənləşdirmişlər:

- davranış və fəaliyyətin ictimai və şəxsi əhəmiyyətli məqsədini müstəqil olaraq müəyyənləşdirmək, nəticələri proqnozlaşdırmaq bacarığının olması;
- məqsədə çatmağın üsul və vasitələrinin müəyyənləşdirilməsi;
- öz fəaliyyətində uğurlu, real, fəal addımlar atması;
- pedaqoji prosesin predmetinin müəyyənləşdirməsi, münasibətlərin xarakteri və özündə baş verən dəyişiklikləri dərindən və tam olaraq dərk edə bilməsi;
- baş verən dəyişikliklərin qoyulmuş məqsədlərlə uyğunluğunu dəyərləndirməsi, fəaliyyət və davranışında vacib düzəlişləri edə bilməsi.

Kiçikyaşlı məktəbli təlim-tərbiyə prosesində yalnız öz mövqeyini bildikdə, müəyyən xaraktikə malik olduqda, öz hərəkətlərində təqlidə deyil, sərbəstliyə nail olduqda başqa sözlə, nə etdiyini və nə üçün etdiyini bildikdə pedaqoji prosesin subyektinə çevrilə bilir.

Pedaqoji prosesin obyektindən subyektinə çevrilməyin vacibliyini nəzərə alan L.A.Matveyeva bu prosesin yollarını diqqətə çatdırmışdır:

1) Hər bir şagirdin illik proqrama uyğun tədris olunan fənlər üzrə bilikləri mənimsəməsi təmin edilməlidir. Bu biliklərin nəzəri və praktik xarakter daşıması vacibdir;
2) Şagirdlərin əqli qabiliyyətlərə yiyələnməsinə zəmin yaradılmalıdır;
3) Kiçikyaşlı məktəblilərdə idrak prosesinin əsasını təşkil edən ümumi əqli bacarıqlar formalaşdırılmalı, məsələn, analiz, sintez, müqayisə, ümumiləşdirmə, təsnif etmə və s. və bu əqli bacarıqlar bütün fənlərin tədrisində həyata keçirilməlidir;
4) Kiçikyaşlı məktəblinin pedaqoji prosesin subyektinə çevrilməsi yollarından biri onların təhsildəki yeniliklərin qəbul etməsidir;
5) Təlim fəaliyyətini dərk etmək, verilən tapşırıqların yerinə yetirilməsində müstəqil olmaq, tapşırığın konkret məqsədini (cədvəli doldurmaq, buraxılmış hərfləri yerinə qoymaq) başa düşməklə yanaşı, şagird onun ümumi vəzifələrini də (əməliyyatlar sistemini düzgün başa düşmək, qaydaları bilmək və s.) bilməli və yerinə yetirməlidir (12, s.16).

Beləliklə, kiçikyaşlı məktəbli böyüklərin köməyi ilə tədricən məqsədini müəyyənləşdirir, müstəqil ictimai təcrübə və şəxsi inkişafına yönəlmiş fəaliyyətini reallaşdırmaq qabiliyyətinə yiyələnir. Bu isə onun qazandığı bilik, bacarıq və vərdişlərdən, eləcə də bu istiqamətdə fəaliyyətinin motivasiyasından asılıdır.

Bütün bunları nəzərə alaraq, kiçikyaşlı məktəblinin təlim prosesində pedaqoji təsirlərin obyektindən subyektinə keçməsi yollarını bilmək, buna əsaslanaraq pedaqoji fəaliyyətini həyata keçirmək müəllimə fasiləsiz təhsilin ilk pilləsi olan ibtidai təhsildə qarşıya qoyulan məqsədlərə çatmağa imkan verir. Şairdlərin bu məqsədlərdən doğan vəzifələrini isə V.İ.Maksakова belə təsvir etmişdir:

1) Tərbiyənin təbii-mədəni vəzifələri:

- uşaq psixikasının düzgün yönəldilməsi (uşağın dünyada seçilən fərd olması təsəvvürünün yaradılması “Mən=dünya” formulasının “Mən və dünya” formulasına çevrilməsi; yəni uşağın dünya ilə bilavasitə əlaqəsinin izah edilməsi);
- uşaqlarda psixoloji yeniliklərin, psixi proseslərin sərbəstləşməsi, maraqlı işlə məşğul olması, fiziki və psixi cəhətlərə uzun müddət dözməsi, öz fəaliyyəti, davranış və münasibətlərinin məqsədini dərindən anlaması, öz planları üzrə hərəkət etməsi, əqli fəaliyyət üsullarını kamilləşdirməsi (məsələn, sıra və oxşarlığa görə yadda saxlamaq) və s. həyata keçirilməsi.

2) Tərbiyənin ictimai-mədəni vəzifələri:

- uşağın məktəb həyatına psixoloji uyğunlaşması;
- özünüidarə, davranışı tənzimləmə və zamanla uzlaşmaq üsullarına sahib olması;
- məktəb həyatını dərk etməsi;
- özünürealizə etməyin əsas forması olan öyrənmə və elmi düşüncəyə sahib olması;
- məktəbəqədər, məktəb və məktəbdənkənar dövrlərdə əldə olunan biliklərin sistemləşdirilməsi.

3) Tərbiyənin ictimai-psixoloji vəzifələri:

- özünün və digərlərinin fəaliyyətini dəyərləndirməsi;
- müəllimə biliklərin əsas daşıyıcısı kimi münasibətin formalaşması;
- böyüklərlə işgüzar ünsiyyət qabiliyyətinin mükəmməlləşdirilməsi;
- yaşla əlaqədar yaranan xudpəsəndliyə son qoyması;
- həmyaşıdları ilə səmərəli qarşılıqlı əlaqələr yaratmaq bacarığının kamilləşdirilməsi və onlarla bir qrupda ola bilməsi;

yaşa uyğun ziddiyyətləri həll edə bilməsi (bu ziddiyyətlər arasında əsas yeri “uşaq” və “şagird” mövqeləri arasında olan ziddiyyət tutur) (10, s.10-11).

Kiçikyaşlı məktəblinin pedaqoji prosesin subyektinə çevrilməsinin göstəricilərindən biri onun öyrənməyə düzgün yanaşmasıdır. Müstəqilliyə və azad seçimə əsaslanan, yaradıcı təxəyyül və təfəkkürü inkişaf etdirən təlim prosesi tədricən şagirdin mövqeyini dəyişir. Belə ki, şagirdin müəllimin köməkçisi roluna, fəaliyyətinin tədqiqatçısı, yaradıcısı və təşkilatçısı rolları da əlavə olunur. Bu prosesdə ibtidai sinif şagirdinin inkişafına təkan verən yeni üsul və vasitələrin tapılması ilə xüsusi yaradıcı bir mövqe formalaşdırmağa başlayır, şagird artıq müəllimin verdiyi hazır nümunə və tapşırıqları kor-koranə qəbul etmir. O, təlim prosesində fəal iştirak edərək, təlim tapşırığını qəbul edir, onun həlli yollarını təhlil edir, fərziyələr irəli sürür, səhvlərinin səbəblərini araşdırır, müstəqil olaraq məsələlər fikirləşir, öz uğurları, nailiyyətləri və səhvlərinə cavabdeh olur. Bu işdə şagirdin müstəqillik və azadlıq hissi təlimi daha məhsuldar, uğurlu və müvəffəqiyyətli edir. Kiçik yaşlı məktəblinin təlim fəaliyyətində yaradıcı mövqeyi onun verilən tapşırıqlara qeyri-standart (fərqli), variativ, şəxsi impovizasiyası (yanaşması) ilə daha çox məsələ həll etməsi, müstəqil olaraq yeni məzmunlu tapşırıqlar yerinə yetirməsi, müəllimin tapşırıqlarına fərqli münasibət göstərməsi, bir sözlə yüksək fərdi inkişafını sərgiləməsi vasitəsi ilə bəlli olur (6, s.65-68).

Özünü idrak fəaliyyətinin subyekti kimi qəbul etməsi kiçikyaşlı məktəblinin motivasiya təlabatlarının əsasını təşkil edir. Bu isə onun təlimdə yaradıcı mövqeyi ilə əlaqədar inkişaf səviyyəsini əks etdirir və təhsilini növbəti pillədə davam etməyə hazır olduğunu sübut edir.

**Ədəbiyyat:**

1. Божович Л.И. Проблема развития мотивационной сферы ребенка / Под ред. Л. И. Божович и Л. В. Благонадежиной // Изучение мотивации поведения детей и подростков. М., 1972.

2. Голованова Н.Ф. Социализация младщего школьника как педагогическая проблема. – СПб.,1997.

3. Давыдов В.В. Теория развивающего обучения. – М.: Интор, 1996.

4. Кольберг Л. Очерки нравственного развития: вып. I. Философия нравственного развития. Нью-Йорк: Harper & Row, 1981.

5. Колберг Л. Очерки нравственного развития. Вып. II. Психология нравственного развития. Нью-Йорк: Harper & Row, 1984.

6. Котова С. А. Творческая позиция младшего школьника как показатель готовности к обучению в средней школе // Ребенок в современном мире. Детство и творчество /Материалы VII

международной конференции "Ребенок в современном мире. Детство и творчество", Санкт-Петербург, 19-21 апреля 2000 г. - Санкт-Петербург, 2000. С. 65-68.)

7. Кулагина И.Ю. Возрастная психология. Развитие ребенка от рождения до 17 лет. 3-е изд. – М.: Изд-во УРАО,1997.

8. Люблинская А.А. Детская психология. - М.:«Просвещение»,1971.

9. Максакова В.И. Органияация воспитания младших школьников:метод. Пособие для учителя. - М.:Владос, 2003.

10. Максакова В.И. Теоретические основы и методика воспитания младших школьников. - М.:Владос, 2006.

11. Матвеева Л.А. Развитие младшего школьника как субъекта учебной деятельности и нравственного поведения СПб.: Изд.-во РГПУ им.Герцена , 1989.

12. Эльконин Д. Б. Мышление младшего школьника. - М.: Педагогика, 1951. - (Очерки психологии детей).

**Junior student as a subject of primary education**

**Summary**

With the transition of the child to a new age stage, namely the formation of a younger schoolchild stimulates psychological changes and awareness of cognitive activity. In the field of cognitive activity, he enters into new relationships with people associated with this process. As a result, he begins to realize the social nature of learning. At this stage, the process of forming a system of values begins, and games that attract them earlier at this stage begin to lose their significance. These interests are replaced by the desire to learn new subject world and events.

The younger student begins to realize the social significance of their own activities. And this in turn develops its sensual world and contributes to the formation of character. All of this serves as a motivating factor for the younger student.

**Младший школьник как субъект начального образования**

**Резюме**

С переходом ребенка на новый возрастной этап, а именно становление младшим школьником стимулирует психологические изменения и осознание им познавательной деятельности. В сфере познавательной деятельности он вступает в новые отношения с людьми, связанными с этим процессом. В результате он начинает осознавать общественный характер обучения. На этом этапе начинается процесс формирования системы ценностей, а привлекающие их ранее игры на этом этапе начинают терять свою значимость. Эти интересы заменяются стремлением познать новый предметный мир и события.

Младший школьник начинает осознавать общественную значимость собственной деятельности. А это в свою очередь развивает его чувственный мир и способствует формированию характера. Все это служит для младшего школьника мотивирующим фактором.

**Rəyçi: dos. Ş.Ağakişiyeva**

**Əhmədli Ayşən İntiqam qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
ayshen.ehmed@bk.ru

# MƏKTƏBƏQƏDƏR YAŞLI UŞAQLARDA ƏXLAQ TƏRBİYƏSİNİN YOLLARI VƏ ƏSAS VƏZİFƏLƏRİ

***Açar sözlər:*** *tərbiyə, əxlaq, davranış, uşaq, norma*
***Key words:*** *upbringing, morals, behavior, child, norm*
***Ключевые слова:*** *воспитание, нравственность, поведение, ребенок, норма*

Tədqiqatlar göstərir ki, məktəbəqədər yaşlı uşaqların əxlaqi davranışlarında şüur həlledici qüvvəyə malik olduğunda şüur çox vaxt uşağın pis rəftara yol verməsindən sonra fəaliyyətə başlıyır. Uşağın nəyin pis, nəyin yaxşı olması haqqında təsəvvürləri onun təcrübəsi, həyəcanları ilə sıx əlaqəlidir. Uşağın müşahidə etdiyi faktlar, obrazlı təəssüratlar və s. ilə bağlı olan hərşey əsasən ona anlaşıqlı olur. Uşaq üçün xarakterik olan təfəkkür konkretliyi bununla izah edir. Respublikamızda 1998-ci ildə qəbul edilən "Məktəbəqədər müəssilərdə tərbiyə və təlim proqramı"nda uşaqların əxlaq tərbiyəsinə verilən tələblər xeyli təkmilləşdirilmiş, uşaqlarda milliyin, insanpərvərliyin, qarşılıqlı xeyirxahlıq münasibətlərinin, kollektivçiliyin əsası üzrə tərbiyə işinin məzmunu dəqiqləşdirilmiş, onlarda yüksək mənəvi keyfiyyətlərin formalaşması üçün normaların məzmunu konkretləşdirilmiş, uşaqların və aparılan işlərin qrupdan-qrupa zənginləşməsi, inkişafı nəzərə alınmışdır.

Uşaqların əxlaq tərbiyəsi və mədəni davranış normaları hər bir yaş qrupu üzrə aşağdakı kimi aparılır. Kiçik qrupda: 1) uşaqlara öz qrup tərbiyəçisi ilə salamlaşmağı və sağollaşmağı, təşəkkür bildirən sözləri, böyüklərin suallarına cavab verməyi öyrətmək; 2) uşaq bağçasında, küçədə, evdə mədəni davranış qaydalarına riayət etməyi öyrətmək, təmizlikdən, qayda-qanundan zövq almaq arzusu oyatmaq, böyüklərin tapşırığına diqqətli olmağı və onların tapşırıqlarını səylə yerinə yetirməyi öyrətmək. Orta qrupda: 1) uşaqlara bağçada tərbiyəçilərinə "müəllim" deyə çağırmağı öyrətmək, 2) yaşlılara və yaşıdlarına göstərilən köməyə, diqqətə görə təşəkkür etmək, yer göstərmək, öz xahişini dəqiq və aydın ifadə etməyi, təşəkkür etməyi öyrətmək və s. Böyük qrupda: 1) səliqəli yemək vərdişini təkmilləşdirmək, stol arxasında əyləşərkən düzgün vəziyyət tutmağı və onu saxlamağı, yeməyi azca götürüb səssiz yeməyi, salfetdən düzgün istifadə etməyi, yeməkdən əvvəl və sonra əlləri yumağı, dişləri təmizləmək vərdişləri yaratmaq və s. 2) saçları təmiz və səliqəli saxlamaq, asqırarkən, öskürərkən ağzı, burunu dəsmalla örtməyi öyrətmək və s. öyrədilir. Məktəbəhazırlıq qrupunda: 1) insanlara qayğıkeş münasibət, qocalara, xəstələrə, əlillərə, körpələrə kömək etmək lazım gəldikdə onları müdafiəyə qalxmağa təşəbbüskarlıq tərbiyə etmək. 2) uşaqları bağçada və ictimai yerlərdə müəyyən edilmiş mədəni-davranış qaydalarını müstəqil gözləməyə alışdırmaq.

Məktəbəqədər yaşlı uşaqlarda əxlaqi hissi və adətlərinin tərbiyə edilməsində yüksək nəticələrə nail olmaq üçün bu hiss və adətləri uşaqların şüuru ilə əlaqələndirməyə çalışmaq, bununla da əxlaqi hisslərin, adətlərin və şüurun vahidliyinə nail olmaq lazımdır. Məhz bu zaman tərbiyədən gözlənilən nəticəni almaq mümkündür. Uşaqların tərbiyəli hərəkət etmək, ədəb-ərkan dairəsində davranması üçün belə hərəkət və davranışın xarakteri və əhəmiyyəti haqqında müvafiq biliklərə, anlayış və təsəvvürlərə malik olmalı, onları öz əqidəsinə çevirməlidirlər. Bu işdə ilk növbədə məhz şüuru və əqidəni formalaşdırmağa yönəldən tərbiyə məsələlərinə həsr edilmiş söhbətlər, məruzələr, bədii əsərlərin müzakirəsi və s. üsullardan istifadə olunmalıdır. Bu işlərin əsas vəzifəsi tərbiyə ilə bağlı anlayışları uşaqlara aydınlaşdırmaqdan, izah etməkdən, insani keyfiyyət və münasibətlərin, o cümlədən davranış mədəniyyətinin vacibliyinə uşaqları inandırmaqdan, bu barədə onlarda lazımi əqidə yaratmaqdan ibarətdir. Sözün böyük tərbiyəvi gücü ilə uşaqlarda inam və əqidə yaradılmalıdır.

Məktəbəqədər yaşlı uşaqların əxlaq tərbiyəsinə dair bir sıra görkəmli tədqiqatçıların öz dəyərli fikirləri olmuşdur, məsələn, Pavlov deyirdi ki, reflekslərinin köməyi ilə "Uşaq vaxtı bizim hamımızda mürəkkəb fərdi və ictimai davranış yaranır və möhkəmlənir." Təqlid "mənimsəmə yoludur." A.Makarenko valideynlərə müraciət edərək deyirdi: "Sizin şəxsi davranışınız ən həlledici şeydir." A.Makarenko daha bir fikir irəli sürmüşdür ki, "Tərbiyənin başlıca əsasları 5 yaşına qədər qoyulur. Siz 5 yaşına qədər nə etmişsinizsə tərbiyə prosesinin 90 faizini təşkil edir. Sonra isə tərbiyə davam edir. Ümumiyyətlə siz meyvələri dadmağa başlayırsınız. Sizin qulluq etdiyiniz çiçəklər isə 5 yaşına qədər olan vaxt idi." Uşaqların yaşlılarla birgə əməyə cəlb edilməsi onların valideynlərini, tərbiyəçilərini və uşaq bağçalarının digər işçilərini təqlid etmələri onlarda ətrafdakı adamlara münasibətin, müsbət əxlaqi keyfiyyətlərin səviyyəsini yüksəldir. Uşaqlar yaşlıların əməyi haqqında aydın və dəqiq təsəvvür əldə edirlər, onlarda yeni maraq, yaxın adamlara yeni

münasibətlər yaranır. Birgə işdə onlarla mənəvi yaxınlıq əmələ gəlir. Həyat sübut edir ki, ailə nə qədər yaxşı olarsa, ailə münasibətləri düzgün qurularsa, bu uşaqların tərbiyəsinə də olduqca müsbət təsir göstərər, uşaqların aldığı tərbiyə, onlara təsir edən nümunə bir o qədər təsirli olar. Uşaqlarda əxlaqi mənəvi keyfiyyətlərin tərbiyə edilməsində sözün gücündən istifadə edilməsi olduqca əhəmiyyətlidir. Onlarda aşılanması zəruri olan davranış normaları, onların əhəmiyyəti, faydası, nə üçün vacib olması və s. haqqında uşaqlarda söhbət aparılması vacib tərbiyə metodlarındandır. Tərbiyəvi söhbətlər zamanı tərbiyəçi tərbiyə ilə bağlı hər hansı bir məsələni canlı söhbət formasında şərh edir, uşağa həmin məsələyə dair konkret suallar verir, onun fikirlərini aşkara çıxarır, lazım gəldikdə müvafiq dəqiqləşmələr aparır. Uşaqların əxlaq tərbiyəsində onların olduqları mühitin təmizliyinin, sağlamlığının və saflığının böyük əhəmiyyəti vardır.

Uşaqlarla aparılan tərbiyə işində onların tələblərinə, ehtiyac və maraqlarına diqqət verilməsi mühüm əhəmiyyət daşıyır. Uşaqların psixologiyasını, onların fərdi xüsusiyyətlərini, ailədəki həyat şəraitini yaxşı bilən tərbiyəçi hər bir uşağın tərbiyə olunmasına düzgün yol tapmalıdır. Tərbiyəçinin uşaqlara humanist münasibəti, xeyirxahlığı, onun sakit və gözəl davranışı uşaqlarda öz qüvvələrinə inam yaradır. Düzgün danışıq və davranış tərzi rejim tələblərinin sadə ümumyaşayış qaydalarının yerinə yetirilməsində tərbiyəçinin səsinin tonunun möhkəm və qəti olması da mühüm təsir gücünə malikdir. Uşağın əxlaqi təsəvvürlərə yiyələnmə dərəcəsini və əxlaqi mühakiməsini onun bədii əsərlərin qəhrəmanlarına, onu əhatə edən adamların əxlaqi keyfiyyətinə verdiyi qiymətlə və özünün şəxsi keyfiyyəti ilə müəyyənləşdirmək faydalıdır. Davranış normaları və qaydaları, əxlaqi keyfiyyətlər və əxlaqi hərəkətlər haqqında aydın təsəvvürlər lazımi qədər olmadıqda əxlaqi meyllərin səviyyəsi aşağı düşür, uşağın əxlaqi hərəkətlərinin diapozonu məhdudlaşır. Buna görə də uşaqlarda əxlaqi anlayış və təsəvvürlərin müntəzəm olaraq genişləndirilməsi və dərinləşdirilməsinə diqqət verilməlidir. Uşaqların əxlaqi təsəvvürləri ilə əxlaqi davranışları arasında əmələ gələn fərqin digər səbəbi ondan ibarətdir ki, yaşlıların tələbi ilə yaranan uşaqların real davranışı əxlaq haqqındakı biliklərlə əlaqələndirilmir. Yaxşı davranış tələb olunur, ancaq onun mahiyyəti izah edilmir. Buna görə də uşaqlarda pis hərəkətlərə qarşı immunitet tərbiyə etmək üçün onları uşaqlardan gizləmək lazım deyildir. Belə hərəkətlərin pis cəhətlərini uşaqlara izah etməli, pisləməli, onlara qarşı uşaqlarda mənfi münasibət yaradılmalıdır. Uşaqlara valideyn və tərbiyəçinin təsiri çox böyükdür. Hər bir uşağın taleyinə xeyirxah, ədalətli, qayğıkeş münasibət, onun qüsürlarını bilmək və bunları aradan qaldırmaq üçün onların islahına inanmaq, uşağa bir şəxsiyyət kimi yanaşmaq və onun ləyaqətinə hörmət etmək lazımdır. Görkəmli pedaqoq A.S. Makarenko yazırdı: "Tərbiyəçi tərbiyə etdiyi uşağa öyrənilməsi lazım gələn obyekt kimi deyil, tərbiyə edilməsi lazım gələn obyekt kimi baxmalıdır."

**Ədəbiyyat:**

**1**. Əliyeva Ş.Q. Məktəbəqədər pedaqogika. Bakı: ADPU, 2011.

**2.** İlyasov M.İ. Məktəbəqədər yaşlı uşaqların sosial-mənəvi inkişafında ailə mühüm amil kimi. Bakı: 2016.

**3.** Məktəbəqədər təhsilin dövlət standartı və proqramı, Kurikulum, 2010.

**The ways and basic duties of moral education in preschool age**

**Summary**

Moral upbringing is a bilateral process. In this process, the educator, the teacher impresses the child on the one hand and the child on the other hand is active in improving their morals, working on it, learning the importance of acting in the community, as well as the moral norms and principles, and following these principles in their actions and actions to comply with the community living standards.

**Пути и основные обязанности нравственного воспитания в дошкольном возрасте**

**Резюме**

Моральное воспитание - двусторонний процесс. В этом процессе педагог, учитель производит впечатление на ребенка, с одной стороны, и ребенок, с другой стороны, активно работает над улучшением своей морали, работает над ней, осознает важность действий в обществе, а также моральных норм и принципов и следит за этими принципами в своих действиях и действиях. соблюдать стандарты жизни сообществ

**Rəyçi: prof. M.İlyasov**

**Mahmudova Vusalə Valeh qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
mvusala1994@bk.ru

# QARŞILIQLI FƏALİYYƏT ŞƏRAİTİNDƏ MƏKTƏBƏQƏDƏR YAŞLI UŞAQLARIN SOSİAL-ŞƏXSİ İNKİŞAFI

***Açar sözlər:*** *məktəbəqədər, sosial, prinsip, şəxsi,uşaq*
***Key words:*** *pre -school, social , principle, private,child*
***Ключевые слова:*** *дошкольное, социальное, принципы, личностное, ребенок*

Uşaqların sosial şəxsi inkişafı nə cür baş verir?

Bu istiqamətdə aparılan işlərin əksəriyyəti uşaqların uşaq bağçasında olduğu zaman ərzində aparılmışdır.

Uşaqlarla iş səhər yığıncağından başlanır ki, bu zaman uşaqlarla emosional əlaqə yaradılır, söz ehtiyatı zənginləşdirilir, uşaqlara bir-biri ilə qarşılıqlı təsirdə olmaq öyrədilir, hər bir uşağa seçilən mövzu haqqında bildiklərini söyləmək imkanı verilir. Yığıncaq salamlaşma ilə başlanır. Salamlaşma zamanı uşaqlar bir-birini gördüyünə görə sevinc hissini və yaxud yoldaşlarından birinin gəlmədiyinə görə təəssüf hissini ifadə edirlər. Salamlaşma müxtəlif cür həyata keçirilə bilər, məsələn: müxtəlif dillərdə salamlaşma, musiqili salamlaşma, jestlərlə salamlaşma və s. Yığıncağın əsas elementlərindən biri də qarşılıqlı şəkildə komplimentlərin söylənilməsidir. Kompliment əhvalı qaldırır və bizi sonrakı fəaliyyətə stimullaşdırır.

Səmərəli fəaliyyətin təşkili üçün qaydalar uşaqların özü tərəfindən hazırlanır.

Bu hansı qaydalardır?

Qaydalar müxtəlif fəaliyyət sahələrinə toxunur. Uşaqlar nitqi dialoqun qurulması qaydalarını öyrənir, öz hiss və emosiyalarını ifadə edə bilmək bacarığına yiyələnirlər. Qaydalar böyüklərin iştirakı olmaq şərti ilə uşaqlar tərəfindən hazırlanır və qrafik şəkildə tərtib olunur. Qrup daxilində bu kimi qaydalara riayət olunur: dostunla bölüş, cavab vermək istəyirsənsə - əlini qaldır.

Yığıncaq zamanı ən mühüm anlardan biri də yığıncağın didaktik hissəsidir ki, bu zaman uşaqlarla gələcək fəaliyyət planlaşdırılır. Mövzunu uşaqlar öz maraq və tələbatlarından irəli gələrək axşam yığıncağında seçmişlər. Pedaqoq uşaqlarla mövzu üzrə qarşılıqlı əlaqədə olur: ünsiyyət qurur, ümumi fikrə gəlir, gələcək fəaliyyəti planlaşdırır və bunların hamısı qoyulan məqsədə çatmaqda onlara kömək edir.

Tərbiyəçinin vəzifəsi uşaqların ideyalarını tamamlamaq, bu ideyaları həyata keçirmək üçün müxtəlif materiallar toplamaqdır.

Uşaqlar günün böyük hissəsini tərbiyəçi və yaşıdları ilə keçirsə də, onlar üçün vaxtaşırı özlərindən yaşca kiçik olan uşaqlarla əlaqə qurmaq da çox faydalıdır. Belə əlaqələr ünsiyyət sahəsini genişləndirir və sosial təcrübəni zənginləşdirir.

Beləliklə, belə bir nəticəyə gəlmək olar ki, yuxarıda təsvir edilən işlər hər bir uşağın sosial-şəxsi inkişafına səbəb olur. Uşaqlar daha sərbəst və müstəqil, məqsədyönlü və özlərindən əmin, ünsiyyətcil, yaşıdları və böyüklərə qarşı daha diqqətcil və qayğıkeş olurlar.

Uşaq bağçasında uşağın sosial-şəxsi inkişafı

Məhəbbət hissinin uşağı bütün həyatı boyu müşayət etməsi çox vacibdir. Uşaq bağçasından uşaqda formalaşan dünyaya münasibət gələcəkdə onun cəmiyyətdəki vətəndaş mövqeyini müəyyənləşdirəcək. Uşağın bünövrəsinə məktəbəqədər yaş dövründə qoyulacaq sosiallaşma dərəcəsi onun böyüklər aləmində sosiallaşmasını müəyyənləşdirəcək.

Yuxarı məktəbəqədər yaş dövründə uşaq bizim aləmi daha dərindən qavramağa başlayır və pedaqoqların köməyilə onun qanunauyğunluqlarını mənimsəyir. Bu zaman əminliklə demək olar ki, uşaq bağçasının sosial mühiti nəinki məktəbəqədər yaşlı uşaqların tərbiyə olunması vasitəsilə sosiallaşma prosesinin özünü təmin edir, həm də uşaqlarda individuallığın aşkarlanmasına kömək edir.

Məktəbəqədər yaşlı uşaqların sosial şəxsi inkişafı və tərbiyəsi məktəbəqədər təhsil üzrə Dövlət standartı proyektinin əsas komponentlərindən biri olmalıdır. Sosiallaşma problemlərinə olan marağın artması sosial-siyasi və sosial-iqtisadi həyat şəraitinin dəyişməsi, cəmiyyətdə olan qeyri-stabilliklə əlaqədardır. Hal-hazırda cəmiyyətdə yaranan ünsiyyət mədəniyyətinin və xeyirxahlığın qıtlığı, insanların bir-birinə diqqətsizliyi şəraitində pedaqoqlar uşaqlarda kobudluq, emosional karlıq kimi neqativ təzahürlərin profilaktika və korreksiyası məsələlərində çətinlik çəkirlər.

Sosiallaşma prosesinin keyfiyyətli şəkildə inkişaf etdirilməsi üçün aşağıdakı istiqamətlər seçilmişdir:

- uşaqlarla iş;

- valideynlərlə qarşılıqlı əlaqə;
- pedaqoqlarla iş;

Uşaqlarla iş zamanı aşağıdakı aspektlərə diqqət yetirilməlidir:

- erkən yaşlı uşaqların adaptasiyası;
- yuxarı məktəbəqədər yaş dövründə emosiyaların (hisslərin) anlaşılmasına yönəlmiş müştərək oyunlar;
- məktəbəhazırlıq qruplarında şəxsiyyətlərarası münasibətlərin quruluşunun müəyyənləşdirilməsi və korreksiyası.

Erkən yaşlı uşaqlarla, uşaq bağçasının kiçik qruplarında, həmçinin yuxarı yaş qruplarında aşağıdakılardan istifadə olunmalıdır:

- uşaqlarla böyüklər arasında etimad üzərində qurulan qarşılıqlı münasibətləri əşyavi-oyun və fiziki-oyun səviyyəsində formalaşdırmağa, böyüklərin hərəkətlərinə maraq oyatmağa kömək edən, oyun şəraitinə tez uyğunlaşmağı öyrədən uyğunlaşdırıcı oyunlar;
- həmçinin, sosial inkişafa istiqamətlənmiş, yaşıdları və böyüklərlə emosional əlaqə formalaşdıran və oyun tərəfdaşına qarşı müsbət emosional hisslər oyadan oyunlar.

Uşaqlarla iş zamanı növbəti mühüm aspekt emosiyaların keyfiyyətli şəkildə inkişaf etdirilməsidir. Emosiyalar uşaq fəaliyyətinin tənzimlənməsində, dəyər və münasibətlərin təşəkkülündə vacib rol oynayır. Müsbət emosional vəziyyət - insanlara qarşı xeyirxah münasibətin, ünsiyyətə hazırlığın əsasında durur. Əksinə, mənfi emosional vəziyyət paxıllıq, qorxu kimi hisslərin yaranmasına səbəb ola bilər. Pedaqoq-psixoloqun qarşısında ikili məsələ durur: bir tərəfdən, uşağa öz daxili aləmi haqqında danışmağı öyrətmək, digər tərəfdən isə, qarşısındakı uşağı dinləmək, eşitmək və anlamağı öyrənmək.

Məşğələlər zamanı uşaqların emosiyalarla tanışlığı baş verir. Onlar emosiyaları müəyyən əlamətlərinə görə ayırd etməyi öyrənir (məsələn, gözlər geniş açılmış, qaşlar qaldırılmış. ağız bir qədər açılmışdır - qorxu hissi və s.). Daha sonra uşaqlar onlara təqdim edilən süjetli şəkillər üzrə qəhrəmanların emosional vəziyyətini müəyyənləşdirirlər. Öz emosional hisslərini təsvir edərkən, bir qayda olaraq, müsbət hisslərdən danışırlar. Neqativ təcrübələri haqqında danışmaq uşaqlar üçün çox çətindir. Onlar öz ünvanına yaşıdlarının istehzasını eşitməkdən, böyüklər tərəfindən davranışının mənfi qiymətləndirilməsindən qorxur və həyəcan hissləri keçirirlər. Bu səbəbdən də uşaqlara öz hisslərini rəsm vasitəsilə əks etdirmək təklif olunur və bu rəsmlərdən sonrakı işlər üçün istifadə olunur. Rəsmdə əks etdirilən hadisələrin uşaqlarla müzakirə edilməsi hadisəni yaşayan uşağın neqativ hisslərini azaldır və öz davranışının nəticələrini öncədən proqnozlaşdırmağı öyrədir. Hər hansı hərəkəti edərkən uşaq sonradan bu hərəkətin hansı emosiyalar doğuracağını dərk etməyi öyrənir ("Bəs sonra nə olacaq?").

Uşaqların sosiallaşdırılması prosesinin keyfiyyətli şəkildə baş verməsinin vacib aspektlərindən biri qrupda olan mikroiqlimdir. Öz növbəsində, mikroiqlimin yaxşılaşdırılması üçün şəxsiyyətlərarası qarşılıqlı münasibətlərin aşkarlanması və korreksiyası zəruridir. Artıq uşaq bağçasının orta qrupunda uşaqlarda bir-birinə qarşı kifayət qədər möhkəm seçici münasibətlər formalaşır. Bunun nəticəsində uşaqlar yaşıdları arasında müxtəlif mövqe tutmağa başlayır: bəziləri daha çox üstünlük verilən, bəziləri isə daha az. Uşağın yaşıdları arasında bəyənilmə dərəcəsi çox böyük əhəmiyyət kəsb edir. Uşaq münasibətlərinin nə cür qurulması insanın sonrakı şəxsi və sosial inkişaf yolunu müəyyənləşdirir. İlk mərhələdə şəxsiyyətlərarası münasibətlərin sosiometrik tədqiqi aparılır. Əldə edilmiş məlumatlar əsasında sonradan korreksiya işi həyata keçirilir. Bu iş iki istiqamətdən ibarətdir:

- pedaqoqlarla məsləhət işi;
- uşaqlarla iş.

Birinci halda pedaqoqlar diqqəti hamıdan seçilən, müsbət lider keyfiyyətlərinə malik uşaqlardan qrupda qəbul olunmayan, passiv uşaqlara doğru yönəldir. Tərbiyəçi uşaq fəaliyyətini elə təşkil etməlidir ki, özünü müstəqil şəkildə göstərə bilməyən uşaqlara bunu etmək üçün şərait yaransın.

Uşaqlarla süjetli-rollu oyunlar keçirilir və rollar məqsədyönlü şəkildə paylaşdırılır, həmçinin, kommunikativ keyfiyyətlərin inkişaf etdirilməsinə və bir-birinə qarşı xeyirxah münasibətlərin yaradılmasına yönəlmiş, həmçinin, uşaqların hər birinin individuallığını göstərən oyunlar keçirilir.

Uşaq günün böyük hissəsini bağçada keçirdiyindən onun ətrafında xeyirxah, diqqətli, səmimi insanların olması çox vacibdir. Bununla əlaqədar, psixoprofilaktik işlərə böyük yer verilməlidir. Bu işlər çərçivəsində həm individual, həm də qrupşəkilli söhbətlər təşkil edilməlidir. İndividual söhbətlər zamanı şəxsi və peşəkar məsələlər üzrə məsləhətlər verilir. Kollektivlə iş zamanı isə birliyə, stress vəziyyətinin aradan qaldırılmasına, müsbət qarşılıqlı münasibətlərin inkişaf etdirilməsinə istiqamətlənmiş psixoloji treninqlər keçirilir.

**Ədəbiyyat:**

1. Azərbaycan Respublikasında məktəbəqədər təhsil proqramı (kurikulumu) (3-6 yaş) Təhsil Nazirliyinin 10 iyul 2012-ci il .

2.Azərbaycan Respublikasında məktəbəqədər təhsilin Dövlət standartı və proqramı.Bakı, 2010.

3.Солодянкина О.В. Социальное развитие ребенка дошкольного возраста: Методическое пособие. Издательство: "АРКТИ", 2006.

## Social-personal development of preschool children in the conditions of mutual activity

**Summary**

The main activities of preschool educational institutions are social and personal eduction of preschool children. Children get better when they learn. The main direction of activity of pre-school educational institutions is social-personal education of preschool children. Children develop better when they are subject to their own learning.

That’s why we set goals that allow each child to develop the following qualities:
-ability to communicate and interact with each other;
-Ability to think critiaclly and independently;
-ability to see and solve the problem;
-Indifference to the pronlems of society,the country, the environment.

## Социально-личностное развитие дошкольников в условиях совместной деятельности

**Резюме**

Основным направлением деятелъности дошколъных образователъных учреждений является социалъно-личностное воспитание дошколъников. Дети лучше развиваются, когда они сами учатся.

Именно поэтому мы ставим цели, которые позволяют каждому ребенку развиватъ следущие качества:

-умение общатыся и взаимодействоватъ друг с другом;
-умение мыслитъ критически и самостоятелъно;
-умение видетъ и решатъ проблемы;
-равнодушие к проблемам общества, страны, окружающей среды.

**Rəyçi: prof. Ş.Əliyeva**

**Quliyeva Pərvin Qurban qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti

# ERKƏN YAŞ DÖVRÜNÜN DİAQNOSTİKASININ İSTİQAMƏTLƏRİ

***Açar sözlər:*** *diaqnostika, sosial, blok, inkluziv təhsil, qarışıq, qrup*
***Keywords:*** *diagnosis, social, block, inclusive education, mixed, group*
***Ключевые слова:*** *диагностика, социальная, блок, инклюзивное образование, смешанная, групповая*

Erkən uşaqlıq dövrü 1 yaşdan 3 yaşa qədər olan dövrü əhatə edir. Bu dövrdə uşaqlar öz tələbatlarını əşyavi-manipulyativ fəaliyyətin köməyi ilə ödəyirlər. Erkən uşaqlıq dövrü özünəməxsus xüsusiyyətləri ilə fərqlənir. Bu dövrdə uşaq nitqə yiyələnir və nəticədə şəxsiyyətin və fəaliyyət subyektinin formalaşması üçün zəmin yaranır. Hələ körpəlik dövrünün sonunda (11-ci aydan) uşaq nitqin fonetik quruluşuna, yiyələnməyə başlayır, getdikcə söz ehtiyatı artır və üçüncü yaşın axırında 300-400-ə çatır. 1 yaş 10 aylıqdan başlayaraq uşaq ayrı-ayrı sözləri cümlədə birləşdirməyə başlayır. Nitqin inkişafı əsasında uşaq əşyaları ən parlaq zahiri əlamətlərinə görə qruplaşdırmağa başlayır. Bunu ümumiləşdirmənin ilkin mərhələsi kimi qeyd etmək mümkündür. Bu dövrdə psixikanın əsas formaları olan hafizə (tanıma şəklində), əyani-əməli təfəkkür, diqqət, qavrayış fəal şəkildə inkişaf etməyə başlayır. İkinci yaşda uşaq yaxın adamları və obyektləri qavradıqdan bir neçə həftə, üçüncü yaşda bir neçə aydan sonra tanıya bilir. Tanıma ilə yanaşı qavranılmış əşyaların xatırlanması da inkişaf edir.

Erkən uşaqlıq dövründə *nitqin* inkişafı ilə bağlı olaraq ***təfəkkür,*** xüsusilə ***əyani-əməli təfəkkür*** də inkişaf edir. Lakin bu dövrdə uşaqlar öz fikirlərini sözlə ifadə edə bilsələr də, onların təfəkkürləri müəyyən hərəkətlərlə daha çox bağlı olub, bu hərəkətlərdə təzahür edir. Bu dövrdə uşaqların fikri fəaliyyəti əsasən konkret cisim və hadisələrlə bağlı olur. Erkən uşaqlıq yaşında diqqətin yeni xüsusiyyətləri özünü göstərir. Uşağın böyüklərlə nitq ünsiyyəti burada mühüm rol oynayır. Söz siqnalları uşağın diqqətinin müəyyən obyektə yönəlməsinə, qeyri-ixtiyari diqqətin davamlılığına və dəqiqliyinə əsaslı təsir göstərir. Böyüklərin tələbi ilə uşaqlarda ixtiyari diqqətin inkişafı üçün şərait yaranır. Ünsiyyət prosesində uşağın biliyi, təcrübəsi tədricən artır. Nəticədə uşaqda ixtiyari qavrayışın - müşahidənin inkişafı üçün şərait yaranır. Burada böyüklərin uşağın qavrayışını təşkil etməsi əsas rol oynayır.

Erkən uşaqlıq dövründə uşaqlarda şəxsiyyətin inkişafı üçün də zəmin yaranmış olur. Uşaq özünü başqa əşyalardan, onu əhatə edən adamlardan ayırmağa başlayır. Bu isə uşaqda ilkin özünüdərketmə formasının meydana gəlməsinə səbəb olur. Üç yaşında uşaqda özü haqqında təsəvvür yaranır. Nəticədə uşaq özünü adı ilə deyil, “mənim”, “mən” əvəzlikləri ilə adlandırmağa başlayır. Bununla bağlı olaraq ilk yaş “böhranı”, “üç yaşın böhranı” özünü büruzə verir. Uşaq “mən” kəlməsini işlətməklə özünün müstəqilliyə olan meylini büruzə verir; onda mənlik şüurunun ibtidai forması müşahidə olunur. Bununla da uşaq böyüklərdən asılı olsa da müstəqil hərəkət etməyə, “mən özüm” - deyə şəxsi fəallıq göstərməyə başlayır. Uşağın psixi inkişafında ilk “yaş böhranı” böyüklərlə qarşılıqlı münasibət zamanı tərslik, inadkarlıq, höcətlik kimi neqativ keyfiyyətlər halında diqqəti cəlb edir. Uşağın müstəqil olaraq öz tələbatını ödəmək cəhdi, özünü başqa adamlarla müqayisə etməsi, böyüklərin verdiyi tələblərdən boyun qaçırması və hərəkətlərindəki sərbəstliyi “üç yaşın böhranı” haqqında aydın təsəvvür yaradır.

Əgər yaşlılar uşağın müstəqilliyi və sərbəstliyini lazımi şəkildə tənzim və təşkil edərsə yaş böhranı tədricən aradan qaldırıla bilər.

Uşağın erkən inkişaf dövrü (0-3 yaş) insan ontogenezində neyro-psixi funksiyaların təşəkkül etdiyi mühüm dövrdür. Uşaq həyatının ilk illərində köməksiz bir canlıdan mobil, sosial cəhətdən fəal insanadək yol keçir. Məhz erkən uşaqlıq dövründə gələcək inkişafın zəmini olan ümumbəşəri təcrübənin vacib komponentləri mənimsənilir: psixi fəaliyyətin, emosional və motivasiya sahələrinin əsası qoyulur, müstəqil hərəkətlərə və nitq fəaliyyətinə hazırlıq gedir. Erkən uşaqlıq dövrü həm də psixoloji-pedaqoji təsir nöqteyi-nəzərindən çox əhəmiyyətli dövrdür. Buna görə də inkişafda olan pozulmaların erkən diaqnostikası vacib bir məsələyə çevrilir.

İnkişafın pozulmasının fərdi strukturunun kompleks müayinəsi ilkin qüsurun dərəcəsinin və sosial faktorların inkişafı gedişinə təsirinin müəyyənləşdirilməsi ilə, yanaşı xəstəliklərin və uşağın somatik vəziyyətinin xarakteristikasını nəzərdə tutur.

***Erkən kompleks diaqnostika 3 blokdan ibarətdir: sosial blok, tibbi blok və psixoloji-pedaqoji blok.*** Erkən yaş dövründə qeyri-adekvat sosial mühitin təsiri altında uşağın psixofiziki inkişafı pozulur, beyin strukturlarının yetişməsi prosesi deformasiya olur, analizatorlararası əlaqələrin formalaşması ləngiyir. Buna görə də erkən diaqnostika prosesində sosial blok böyük əhəmiyyətə malikdir.

Erkən yaş dövrünün diaqnostikasında tibbi blokun rolu əvəzedilməzdir. Tibbi diaqnostika nəticəsində ilkin nöqsanın strukturu, yanaşı gedən pozulmalar, patoloji prosesin xüsusiyyətləri, nöqsanın etiologiyası və patogenezi və nəhayət,klinik diaqnoz müəyyən edilir. Uşağın psixonevroloji, somatik və antropometrik statusu müəyyənləşəndən sonra, tibbi korreksiyanın (cərrahi müdaxilədən uzunmüddətli bərpaedici müalicəyədək) vaxtı və metodları təyin edilir.

Xüsusi müəllim və xüsusi psixoloqun səriştəsində olan ***psixoloji-pedaqoji blok*** inkişafın aktual səviyyəsini (xüsusi testlər vasitəsilə) müəyyənləşdirməklə, inkişaf və korreksiyaedici proqramların həyata keçirilməsinin zəruriliyini əsaslandırır.

Hər üç mərhələdə valideynlərin fəal iştirakı uşağın sağlamlığının, fərdi təliminin və psixoloji problemlərinin maksimal həllinə kömək edir.

Ümumiyyətlə, xüsusi qayğıya ehtiyacı olan uşaqların inteqrasiyası məktəbəqədər yaş dövründən, onların sosial inteqrasiyasından başlamalıdır. Bu zaman inkişafında problemləri olan uşaqlar zəruri məsləhəti dəstəklə, pedaqoji-korreksion və tibbi-sosial köməklə təmin edilirlər.

İnklüziv tərbiyə və təlimin inkişafı xüsusi və kütləvi təhsil arasında yeni münasibətlərin yaranmasına zəmin yaradaraq, onların arasındakı maneələri aradan qaldırıb, sərhədləri şəffaf edəcək.

Məktəbəqədər yaşlı xüsusi qayğıya ehtiyacı olan uşaqların inklüziv tərbiyə və təlimi onlar üçün yaş normasına uyğun və ya yaxın ümumi və nitqi inkişaf səviyyəsinə çatmaq, normal inkişaf etmiş uşaqların mühitinə daha erkən daxil olmaq imkanı yaradır.

Xüsusi qayğıya ehtiyacı olan məktəbəqədər yaşlı uşaqların inklüziv tərbiyə və təliminə keçərkən, indiki sosial-iqtisadi şəraiti, təhsil sisteminin xüsusiyyətlərini nəzərə alaraq, xarici modellərin mexaniki təqlidini tam istisna etmək lazımdır. Bundan başqa, inteqrasiya qeyri-mütəşəkkil surətdə həyata keçirilə bilməz. O, ancaq məktəbəqədər tərbiyə müəssisələrin müvafiq-maddi texniki, proqram-metodik və kadr təminatı olan zaman düzgün təşkil olunub həyata keçirilə bilər.

Beləki, qarışıq tipli məktəbəqədər tərbiyə müəssisədə müəyyən kateqoriyalara aid uşaqların inteqrativ tərbiyə və təlimini təşkil etmək olar. Məs: normal eşitməsi olan uşaqlarla eşitməsi problemli olan uşaqların, normal görməsi olan uşaqlarla görməsi problemli olan uşaqların, normal psixofiziki inkişafı olan uşaqlarla psixi inkişafında ləngiməsi olan uşaqların və s. Hər belə məktəbəqədər müəssisədə uşaqlara korreksion kömək göstərmək, onları sağlamlaşdırmaq üçün lazımi şərait yaradılmalıdır.

Qarışıq tipli qruplara uşaqların qəbulu onların valideynlərinin ərizəsi və tibbi-psixoloji-pedaqoji komissiyanın rəyi əsasında aparılmalıdır. Nitqi qüsurlu və normal uşaqları bir qrupda birləşdirmək məqsədəuyğun deyil, çünki bu kateqoriyalı uşaqlar, faktiki olaraq, inteqrasiya şəraitindədirlər. Bundan başqa, belə uşaqlara xüsusi loqopedik kömək sistemi xeyli inkişaf edib (uşaq psixonevroloji dispanserdə, ümumtəhsil məktəblərin loqopedik punktlarında, uşaq poliklinikalarında, yeni açılan mərkəzlərdə və s.) .Bu cür tipli məktəbəqədər müəssisələr yaxın xaricdə (Rusiya) artıq fəaliyyət göstərir. Qarışıq tipli qruplarda uşaqların sayı yaşından və ilkin qüsurun xarakterindən asılı olaraq, azaldılır.

## Ədəbiyyat:

1. Azərbaycanda Sağlamlıq İmkanları Məhdud olan Uşaqlara Təhsil Xidmətlərinin Göstərilməsi Haqqında Tədqiqat” Müasir Təhsilə və Tədrisə Yardım Mərkəzi, 2009 (fəsil 3.1. Təhsil imkanları, təlim təcrübəsinin müşahidələri).

2.“Xüsusi qayğıya ehtiyacı olan uşaqlar: Yanaşmaların, siyasətlərin və pratikaların təkminləşdirilməsi. Qiymətləndirmə hesabatı”, Leyla İsmayılova və dig. 2005, Fəsil İİ.3. Təhsil Müəssisəsinin mühiti, pp. 20-26.

3.Hüseynova Nailə -“İnkluziv təhsil” Bakı-2014

4.S.Ə.Qasımov, E.M.Kərimova, İ.Sultanova, T.H.Ağayeva-“İnkluziv təhsil sistemində ailə-məktəb, valideyn-müəllim münasibətləri” Bakı-2006

## The future of the diagnostics of the early age period

**Summary**

Early developmental period of the child (0-3 years) is an important period in the formation of neuro-mental functions on human ontogenesis. Therefore, early diagnosis of developmental disorders becomes an important issue. Early complex diagnosis consists of 3 blocks: social block, medical block and psychological-pedagogical block. Active involvement of parents in all three stages helps to maximize the child's health, individual learning and psychological problems.

In general, the integration of children with special needs should start with the pre-school age, their social integration. At that time, children with problems with development support the necessary counseling, pedagogical-correctional and medical-social support.

**Основные направления диагностики раннего возраста**
**Резюме**

Раннее развитие (0-3) является очень важным периодом для развития нейро-психических функций в онтогенезе человека. Исходя из этого ранняя диагностика нарушений в развитии становится важной задачей. Ранняя комплексная диагностика состоит из трех блоков: социальный блок, медицинский блок и психо-педагогический блок. На каждом этапе активное участие родителей играет большую роль в решении психологических проблем, проблем со здоровьем ребенка и его индивидуальным обучением.

**Rəyçi: dos.N.T.Hüseynova**

**Fərzalı Mələk İzzət qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
mfrzli@bk.ru

# SOSİAL İNKİŞAF MƏKTƏBƏQƏDƏR TƏHSİLİN AKTUAL PROBLEMİ KİMİ

***Açar sözlər:*** *məktəbəqədər, sosial, fəaliyyət, aktual, problem*
***Key words:*** *pre-school, social , activities , urgent, problem*
***Ключевые слова*:** *дошкольное, социальное, деятельность, проблема, актуальное*

Təhsil sisteminin təkmilləşdirilməsi üzrə müasir ideyalar cəmiyyətin, elmin, mədəniyyətin inkişafına uyğun olaraq onun məzmun və metodlarının optimal şəkildə yenilənməsinə olan tələbatların reallaşdırılması ilə bağlıdır. Təhsil sisteminin inkişaf etməsini istəyən cəmiyyətin əsas məqsədi – bəşəriyyətin qlobal problemlərini həll etməyə qadir olan dünya birliyində böyüməkdə olan nəsli aktiv yaradıcı həyat fəaliyyətinə hazırlamaqdır.

Cəmiyyətin müasir inkişaf şəraitində bu məqsədin reallaşmasına demokratik kübar təhsilin ali forması kimi təyin olunan elmi-humanist təhsil sisteminin paradiqması kömək edir ki, o da, mədəniyyət və dünyagörüşlərin sərbəst şəxsiyyətlərarası dialoqu, inkişafetdirici təhsil texnologiyalarının optimal tətbiqi, bütün təhsil qaydalarının təbii humanitarlaşdırılması, müasir aləmin qavranılması əsasında dünya mədəniyyətinin bilik və dəyərlərinin uşaqlar tərəfindən şüurlu şəkildə mənimsənilməsini təmin edir.

Uşaqlıq – insan həyatının doğulandan psixoloji yetkinliyə çatana kimi olan dövrüdür ki, bu dövr ərzində onun sosial inkişafı, cəmiyyətin üzvü kimi təşəkkül tapması baş verir. Sosial inkişaf prosesi zamanı uşaq yaşadığı cəmiyyətin dəyərlərini, ənənələrini, mədəniyyətini mənimsəyir. Oynayarkən, məşğul olarkən, böyüklərlə və yaşıdları ilə ünsiyyətdə olarkən o, digər insanlarla yaşamağı, onların maraqlarını, cəmiyyətdə qəbul olunmuş davranış norma və qaydalarını nəzərə almağı öyrənir, yəni sosial cəhətdən səriştəli olur.

Kiçik vətəndaşın sosial inkişafına nə təsir edir? Şübhəsiz ki, bu prosesin kökləri ilk öncə ailə ilə bağlıdır. Məhz ailə bilikləri, dəyərləri, münasibətləri, ənənələri nəsildən nəslə ötürür. Ailədə olan abu-hava, uşaq və valideynlər arasında olan isti münasibətlər, ailə daxilində qəbul olunmuş və valideynlərin öz uşaqlarına ötürdüyü norma və qaydalarla təyin olunan tərbiyə üslubu – bunların hamısı körpənin ailədəki sosial inkişafına böyük təsir göstərir.

Qrupun tərbiyəçisi uşaq üçün çox vacib bir insandır. Uşaq ona etibar edir, onun şübhəsiz nüfuza, mümkün olan bütün müsbət keyfiyyətlərə – gözəlliyə, xeyirxahlığa, müdrikliyə malik olduğuna inanır. Bu təəccüblü deyil, çünki uşağın uşaq bağçasındakı həyatı bütövlükdə əsasən böyükdən asılıdır. Uşağın nəzərində məhz o, oynamaq və ya gəzməyin, şəkil çəkmək və ya qaçmağın, hətta sakitcə oturub dinləməyin vaxtını təyin edir. Tərbiyəçi müxtəlif maraqlı oyun, rəqs, məşğələ, tamaşalar qurur, kitablar oxuyur, nağıllar, hekayələr danışır. O, uşaqlar arasında baş verən münaqişələri həll edir, qaydalar qoyur, o hər şeyi bilir və hər zaman kömək edə, tərifləyə, bəzən isə fikir verməyə və hətta danlaya bilər.

Uşağın həyatında tərbiyəçi mühüm əhəmiyyət kəsb edir. Onun şəxsiyyətinin, təfəkkürünün və davranışının formalaşdırılması üzrə əsas məsuliyyət tərbiyəçinin üzərinə düşür.

Uşağın sosial inkişafının əsas şərtlərindən biri cəmiyyətin inkişafı, münasibətlərin qurulması, yaşıdları ilə dostluq münasibətlərinin formalaşmasıdır.

Məktəbəqədər yaş dövründə fəaliyyətin inkişafetdirici potensialı onun spesifik xüsusiyyətləri ilə bağlıdır:

— reallığın çoxsaylı problemlərini tez qəbul etmək;
— təxəyyüldə bütöv obyekti qura bilmək imkanını təmin edən universal plastiklik;
— təşəbbüskarlıq;
— motivasiyanın praqmatik olmaması;
— sinkretiklik;
— məna tərəfinin əməliyyat-texniki tərəflə müqayisədə üstünlüyü;
— emosional dolğunluq və ifadəlilik;
— uşağın böyük obrazına istiqamətlənməsi .

Artıq məktəbəqədər yaş dövründə, sosial təcrübə ictimai təcrübənin qavranılmasının nəticəsi olaraq sosiallaşdırma-fərdiləşdirmə prosesi zamanı mühüm əhəmiyyət kəsb edir.

Sosial inkişaf iki yolla həyata keçirilir:

- insanın sosial reallıqla və ətraf aləmlə təbii qarşılıqlı təsirinin gedişində və insanın sosial mədəniyyətə məqsədyönlü şəkildə qoşulması prosesində;

- sosial mədəniyyətin müxtəlif aspektlərindən ibarət olan məqsədyönlü təhsil vasitəsilə.

Məktəbəqədər yaşlı uşaqların sosial inkişaf məsələlərinin reallaşdırılması, pedaqoji metodologiyanın ümumelmi səviyyəsinin əsas yanaşmalarına uyğun olaraq qurulan bütöv pedaqoji sistem olduqda daha effektli olur.

Sosial inkişaf probleminin əsas konseptual tezislərinə qısaca nəzər saldıqda aşağıdakı nəticələrə gəlmək olar:

— sosial inkişaf sosiallaşdırma-fərdiləşdirmənin nəticəsi olmaqla, ardıcıl, çoxtərəfli prosesdir. Sosiallaşdırma-fərdiləşdirmənin gedişində insanın "ümumi sosiallığa" qoşulması və özünü sosial mədəniyyətin subyekti olaraq daim kəşf etməsi, təsdiqləməsi baş verir;

— məktəbəqədər yaş dövrü insanın sosial inkişafının senzitiv dövrüdür;

— məktəbəqədər yaşlı uşaqların sosial inkişafının əsas istiqamətləri bunlardır: sosial istiqamətlənmə, reflektor tənzimləmə, təqlid, emosional identifikasiya, normativ və induktiv tənzimləmə, sosial təcrübə, mədəniyyəti yaratma, nəzarət, qiymətləndirmə, refleksiya;

— sosial inkişaf həm sosial faktorların təbii təsiri zamanı, həm də məqsədyönlü, təşkil olunmuş pedaqoji prosesdə həyata keçirilir;

Hər bir uşağın sosial inkişafının effektivliyi məktəbəqədər yaşlı uşaqların yaş, cinsi, milli xüsusiyyətləri nəzərə alınmaqla nəticələrin vaxtında və keyfiyyətli monitorinqi ilə müəyyənləşir.

## Ədəbiyyat:

1.Azərbaycan Respublikasında məktəbəqədər təhsilin Dövlət standartı və proqramı. Bakı, 2010.
2.Əliyeva Ş.Q. Məktəbəqədər təhsilin aktual problemləri. Bakı, ADPU, 2010
3.Əliyeva Ş.Q. Məktəbəqədər pedaqogika. Bakı, ADPU, 2010.
4.Солодянкина О.В. Социальное развитие ребенка дошкольного возраста: Методическое пособие. Издательство: "АРКТИ", 2006.

## Social development is a problem of preschool education

### Summary

Contemporary ideas on improving the education system are related to the realization of the needs for optimal renewal of its content and methods in line with the development of society, science and culture. The main purpose of a society that wants to develop the education system is to prepare the generation growing in the world community, which is capable of solving global problems of humanity, for active creative life.

## Социальное развитие - проблема дошкольного образования

### Резюме

Современные идеи по совершенствованию системы образования связаны с реализацией потребностей в оптимальном обновлении ее содержания и методов в соответствии с развитием общества, науки и культуры. Основная цель общества, которое хочет развивать систему образования - подготовить поколение подрастающее в мировом сообществе, способное решать глобальные проблемы человечества, к активной творческой жизни.

**Rəyçi: prof. Ş.Əliyeva**

**Həsənova Əzizə Vərqa qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
aziza.hasanova.1995@gmail.com

# TƏHSİLİN İDARƏ OLUNMASINDA MƏKTƏB VƏ İCTİMAİYYƏT PROBLEMİ

***Açar sözlər:*** *obyektivlik, məktəb, idarəetmə, ictimaiyyət, münasibət*
***Key words:*** *objectivity, school, management, community, attitude*
***Ключевые слова:*** *объективность, школа, менеджмент, сообщество, отношение*

21-ci əsr ötən əsrlərdən özünün yüksək sürətli inkişafı və davamlı informasiya axını ilə xarakterizə olunur. Belə bir zamanda, şəxsiyyət azadlığı anlayışının ön plana çəkilməsi, cəmiyyətin demokratik prinsipləri dəstəkləməsi kimi tendensiyaları da bərabərində gətirdi. Bir çox sahələrdə olduğu kimi, cəmiyyətin təhsil sferasında söz deməyə başlaması dövrün tələbindən başqa bir şey deyildir. Bunun nəticəsidir ki, bu gün Azərbaycan təhsil sisteminin önəmli xüsusiyyətlətindən biri dövlət-ictimai əsasda idarəedilməsidir. Dövlət-ictimai idarəetmə nə deməkdir?

Təhsilin dövlət-ictimai idarəetməsinin əsas ideyası təhsil problemlərini həll etmək üçün dövlətin və cəmiyyətin səylərini birləşdirmək, tədris prosesinin məzmunu, forma və metodlarını, müxtəlif tip təhsil müəssisələrini seçməkdə müəllimlərə, şagirdlərə, valideynlərə böyük hüquqlar və azadlıqlar vermək təşkil edir.

İctimaiyyətlə məktəbin qarşılıqlı əməkdaşlığı əslində yeni bir konsepsiya deyildir. Çünki təhsil hər zaman cəmiyyətin tələbləri əsasında formalaşır.

"Təhsilin İnkişafı üzrə Dövlət Strategiyası" adlı sənədin 5-ci istiqaməti bu baxımdan diqqət çəkir.

Strategiyanın 5-ci istiqamətində göstərildiyi tapşırığa əsasən, Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondu 19 fevral 2010 tarixli sərəncam ilə yaradılır. Bu fondun əsas məqsədi: "Fondun əsas məqsədi Azərbaycan Respublikasında elmi müəssisə və təşkilatlar, təhsil müəssisələri, digər müvafiq qurumlar və fiziki şəxslər tərəfindən təqdim olunmuş təbiət, texniki, humanitar və ictimai elmlər sahəsində dövlət və cəmiyyət üçün əhəmiyyət kəsb edən fundamental, tətbiqi, eksperimental, akademik, empirik, innovativ, nəzəri elmi tədqiqat proqramları və layihələrini və digər elmi tədbirləri (bundan sonra - layihələr) qrant şəklində ünvanlı maliyyələşdirmək, alimlərin elmi fəaliyyətini stimullaşdırmaq və onlara azad yaradıcılıq imkanı yaratmaq, habelə elm müəssisələrinin fəaliyyətinin təkmilləşməsini nəzərdə tutan və inkişafını dəstəkləyən tədbirləri həyata keçirmək yolu ilə Azərbaycanda elmi-texniki potensialı qorumaq və inkişaf etdirmək, iqtisadiyyatın inkişafında bu potensialdan səmərəli istifadə etmək, mühüm sosial problemlərin həllində elm və texnikanın rolunu yüksəltmək və dövlətin elmi informasiya və innovasiya ehtiyatlarını artırmaqdır" [1]

Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun əsas mahiyyəti ictimaiyyət qarşısında məsuliyyət daşımasıdır. Hər ilin sonu fond mütləq ictimaiyyət qarşısında hesabat verməli, bir başa ictimaiyyət ilə hesablaşmalıdır. [3]

Məktəblə ictimaiyyətin əlaqəsi məsələsi xüsusi ilə kurikulumların hazırlandığı vaxt daha sıx olmuşdur. Məktəbdə kurikulumların hazırlanması vaxtı ona cəmiyyətin bütün zümrələri cəlb edilmişdi. Belə ki, işçi qrupları tərəfindən hazırlanan kurikulumların layihə variantları dəfələrlə müzakirə olunaraq mərhələ-mərhələ respublikanın pedaqoji mətbuatında – "Azərbaycan müəllimi", "Təhsil problemləri" qəzetlərində dərc edilərək oxucuların və pedaqoji ictimaiyyətin mühakiməsinə verilmişdir. Yalnız müsbət ictimai rəy alındıqdan sonra kurikulumların tətbiqinə icazə verilmişdir.

İctimaiyyətin məktəbə cəlb edilməsinin əsas sahələri aşağıdakılardır:

- Təlim, tərbiyə, İnkişaf, sinifdənxaric və məktəbdənkənar tədbirlərin təşkili, valideynlik fəaliyyəti

Bundan əlavə, məktəb rəhbərliyi müəllimlər, valideynlər və ictimaiyyətlə qarşılıqlı münasibəti aşağıdakı formada həyata keçirir.

İctimaiyyətin cəlb olunmasının əsas növləri aşağıdakı yardımlardan ibarətdir.

Məlumatverici (məlumatverici bülletenlerin hazırlanması), nəzarət, müşahidəçilik (məs. monitorinqlə iştirak etmək), təşkilati (müxtəlif tədbirlərin təşkili), mənəvi-psixoloji (hüquqların müdafiəsi), maddi yardım, professional yardım (şagirdlərin ixtisasyönümü istiqaməti üzrə müxtəlif tədbirlərin həyata keçirilməsi) [52, 4]

Məktəbdə ictimaiyyətlə işin digər bir növü isə "açıq qapı günləridir". "Açıq qapı" günlərinin təşkil edilməsinin əsas məqsədləri məktəbdə tədrisin və keyfiyyətə nəzarət işinin təşkili ilə bağlı təcrübə

mübadiləsi aparmaq, məktəbdə psixoloji işin təşkili səviyyəsi və bu istiqamətdə mövcud olan müasir təcrübələr və yanaşmalarla tanış olmaqdır.

Göründüyü kimi, məktəb və ictimaiyyətin qarşılıqlı əlaqəsi mürəkkəb bir sistem olub, profesional rəhbərlik və müsbət qarşılıqlı əməkdaşlıq tələb edir. Məktəbə ən çox təsir edən amil olan cəmiyyətlə qarşılıqlı əməkdaşlıq,hər tərəfli bir təhsil prosesi üçün çox vacibdir.

**Ədəbiyyat:**

1. 21 iyul 2017-ci il tarixli 1551 nömrəli Azərbaycan Respublikası Prezidentinin Fərmanı ("Xalq" qəzeti, 22 iyul 2017-ci il, № 156, Azərbaycan Respublikasının Qanunvericilik Toplusu, 2017-ci il, №7 , maddə 1361)
2. Rüstəmov F., Paşayev Ə. Pedaqogik,Bakı, Elm və təhsil,s.465
3. Azərbaycan Respublikasının Prezidenti yanında Elmin İnkişafı Fondunun Nizamnaməsi, Bakı şəhəri, 19 fevral 2010-cu il, №223
4. İctimai Fəal Məktəb, Bakı ,Təhsil, 2005, 250 səh.

**The role of the school and the public in education management**

**Summary**

In the scientific article, the problem of public and school education was mutually agreed. At the same time, there is a need to further strengthen public relations in the transition to curriculum in education. This article analyzes the role of public co-operation in the objective and transparent management of the school. The article notes that school leadership can be interacted with teachers, parents, and the public in different ways. Later, some information about the "open door days", which was considered one of these forms of business, was given.

**Роль школы и общественности в управлении образования**

**Резюме**

В научной статье проблема государственного и школьного образования была взаимно согласована. В то же время, существует необходимость дальнейшего укрепления связей с общественностью при переходе к учебной программе в сфере образования. В данной статье анализируется роль общественного сотрудничества в объективном и прозрачном управлении школой. В статье отмечается, что школьное руководство может взаимодействовать с учителями, родителями и общественностью по-разному. Позже была предоставлена некоторая информация о «днях открытых дверей», которые считались одной из этих форм бизнеса.

**Rəyçi: dos. Ə.İmanov**

**Nurullayeva Günel İlham qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
gunel.nurullayeva1990@mail.ru

# MƏKTƏBƏQƏDƏR YAŞLI UŞAQLARIN NİTQİNİN İNKİŞAFINDA ƏTRAF ALƏMLƏ TANIŞLIQ MƏŞĞƏLƏLƏRİNİN ROLU

***Açar sözlər:*** *nitq, təbiətlə tanışlıq, ətraf aləm, nitq ünsiyyəti, diksiya, intonasiya*
***Key words:*** *Introduction speech, nature, environment, speech communication, enunciation, intonation*
***Ключевые слова:*** *Речь, знакомство с природой, окружающий мир, речевое общение, дикция, интонация*

Təhsil sistemimizin demokratik əsaslar üzərində qurulduğu müasir dövrdə məktəbəqədər təhsil müəssisələrinin əsas vəzifəsi uşaqları hərtərəfli inkişaf etmiş bir şəxsiyyət kimi yetişdirməkdir. Bu vəzifəni yerinə yetirmək üçün isə əvvala uşaqlarda ana dilinə məhəbbət oyatmaq, onun zənginliyindən istifadə etmək, öz fikrini aydın, obrazlı və rabitəli şəkildə ifadə etməyi öyrətmək lazımdır. Təbii ki, bütün bunlar nitqin inkişafı ilə bağlıdır. Uşaqların gözəl, aydın rabitəli nitqə yiyələnməsi məktəbəqədər təhsil müəssisələrində nitq inkişafı üzrə təşkil edilmiş məşğələlərdə öz həllini tapır.

Nitq insanların həyatında ən vacib amillərdən biridir. İnsanlar ilk növbədə, nitqin köməyi ilə ünsiyyət saxlayır. Bir – birini başa düşür, öz arzularını, hisslərini ifadə edirlər. Nitq elə bir güclü vasitədirki, bununla insanlar bir – birlərinə təsir göstərməyi bacarırlar. Söz adamları əməyə, qəhrəmanlığa, sülhə çağırır. Pis əməllərdən çəkindirir, ağladır, sevindirir, güldürür, onlarda yaşamağa səmərəli fəaliyyət göstərməyə inam yaradır.

Uşaq dil açdığı gündən onun nitqinin inkişaf etdirilməsi üzərində ciddi iş gedir. Bu işin ən əhəmiyyət kəsb etdiyi yer isə məktəbəqədər təhsil müəssisələrinin məktəbəhazırlıq qruplarıdır. Bu dövrdə şifahi nitqdəki nöqsanların aradan qaldırılması, nitqin təmizliyi, səlsitliyi, rəvanlığı, səlistliyi, rabitəliliyi üzrə xüsusi məşğələlərdə müntəzəm məşqlər aparılır, uşağın ədəbi dilə yiyələnməsi sürətlənir. Təbii ki, bütün bunlarda nitq inkişafı məşğələsi təlimin əsas təşkilat forması olmaqla uşaqlara bilik, bacarıq və vərdişlər aşılamaqla onların nitqini formalaşdırır, inkişaf etdirib təkmilləşdirir. Əlbəttə nitq inkişafı məşğələlərinin yüksək səmərə verməsi həm də onun düzgün təşkil edilməsindən asılıdır.

Müntəzəm aparılan nitq inkişafı məşğələləri uşaqlarda zehni əməyə maraq formalaşdırmaqla yanaşı, onlarda əxlaqi – iradi, estetik keyfiyyətlərin təşəkkülünə şərait yaradır. Ən əsas sözlərin gözəlliyini aşılamaqla uşaqlarda dilimizə məhəbbət hissi oyadır.

Nitq inkişafı üzrə məşğələlər onun sahələri ilə (səs mədəniyyəti, lüğət işi, rabitəli nitqin inkişafı, nitqin qrammatik quruluşu və s.) üzrə ayrı –ayrılıqda deyil, kompleks şəkildə aparılır. Məşğələnin hər mərhələsində (giriş, əsas, yekun) məşğələnin məqsədinə uyğun olaraq metod və priyomlardan istifadə olunur. Nitq inkişafı məşğələlərinin təşkilində didaktikanın əsas prinsipləri yeni təlim metodları və pedaqoji texnologiyaların tətbiqi nəzərə alınır.

Məktəbəqədər təhsil müəssisələrində keçirilən nitq inkişafı məşğələsi prosesində təlim və tərbiyənin vəhdəti həyata keçirilir. Məşğələlərdə təlim işi uşaqlardan ciddi fiziki və əqli gərginlik tələb edir ki, bu da uşağın şəxsi fəallığı ilə həyata keçirilir. Onlar çalışırlar ki, öz fəaliyyətlərində müəyyən nəticə əldə etsinlər. Bütün bunları nəzərə alaraq, uşaqların təlim yükünün müəyyən edilməsində ehtiyyatlı olmaq lazımdır.

Məktəbəqədər təhsil müəssisələrində nitq inkişafı məşğələləri müasir dövrün tələblərinə əsasən qurulur və bu tələblər aşağıdakılardır.

- Nitq inkişafı məşğəsində yüksək təlim, inkişaf və tərbiyə səmərəsi əldə edilməlidir.
- Məşğələdə təlim, tərbiyə və inkişaf vəzifələri vəhdətdə həyata keçirilməli, real nəticələr əldə edilməlidir.
- Nitq inkişafı məşğələsində təlim materialının optimal məzmunu müəyyən edilməlidir. Tərbiyəçi məşğələnin qarşısında duran məqsəd və vəzifələrdən, uşaqların hazırlıq səviyyəsindən çıxış edərək öyrənilən materialın həcmini, çətinlik dərəcəsini, başlıca məsələlərini və məşğələ zamanı məzmununun mənimsənilməsinə nail olmalıdır.
- Nitq inkişafı məşğələsində səmərəli metodik variant seçilib tətbiq edilməlidir. Məşğələnin məqsəd və məzmununa, uşaqların dərketmə fəaliyyətinə müvafiq olaraq fəal təlim metodları müəyyənləşir. Məşğələ o zaman səmərəli olur ki, tərbiyəçi biliyi hazır şəkildə təqdim etməsin, uşaqları fəal axtarışlara cəlb etsin, onlara müstəqil fikirlərini söyləməyə imkan versin.

- Nitq inkişafı məşğələsində əlverişli psixoloji iqlim, müsbət emosional vəziyyət yaradılmalıdır. Məşğələnin səmərəsi onun emosional mühiti ilə sıx bağlıdır, mənfi emosiyalar ( qorxu, kədər və s.) şəraitində keçirilən təlim məşğələsi cansıxıcı, yorucu olur. Məşğələ zamanı tərbiyəçi və uşaqlar arasında qarşılıqlı hörmət, inam, xoş əhval – ruhiyyə, müsbət zehni hisslər olmalıdır.
- Nitq inkişafı məşğələləri uşaqların nitqini inkişaf etdirməklə, dərk etmə fəaliyyətlərinin və zehni əməyə marağının inkişafına kömək edir. Bütün bunlar uşaqların məktəbdə müvəfəqqiyyətlə təhsil almalarına şərait yaradır.

Nitqi inkişaf etdirmək gündəlik həyat üçün çox əhəmiyyətlidir. Nitqin inkişaf etdirilməsi, həmçinin uşaqların ətraf aləm haqqında biliklərinin inkişaf etdirilməsi üçün əhəmiyyətli bünövrə təşkil edir.

Ətraf aləmlə tanışlıq məşğələsi uşaqların dünyagörüşünü genişləndirir, nitq və təfəkkürünü inkişaf etdirir. Kiçik yaşlı uşaqlar Dövlət rəmzlərimizi, Prezdentimizi, Vətənimizi, dilimizi, dinimizi, düşmən-lərimizi, mədəniyyətimizi, Milli Ordumuzu tanımalıdır. Təbiətimizin gözəlliklərini duymalıdır. İlin fəsillərə bölündüyünü hər fəslin öz əlamətləri olduğunu, əldə etdiyimiz nailiyyətlər bizim xalqımızın alın təri, zəhməti olduğunu, ədəbi dilimizin zənginliklərini, nəqliyyat vasitələrini, həmsərhəd olduğumuz ölkələri, paytaxtımızı, Milli qəhrəmanlarımızı, tarixi günlərimizi, iqlimimizi, şəhər və kəndlərimizi, mədəniyyətimizi məhz bu məşğələlər vasitəsi ilə geniş biliklər əldə edir.

Uşaqları ətraf aləm haqqında həqiqi elmi biliklərlə silahlandırmaq, onlarda düzgün elmi dünyagörüşü, saf və tam əqidəni yaratmaq tərbiyə işinin əsasını təşkil edir. Ətraf aləm haqqında geniş biliklərə yiyələndikcə onların lüğət ehtiyyatı artır, artıq öyrəndikləri yeni biliklər hesabına yaşıdları və yaşlılarla dialoq qurur, şəkil üzrə hekayə qurub danışırlar.

Məşğələ prosesi düzgün təşkil olunarsa uşaqlar ətraf aləm haqqında geniş biliklər əldə edər, respublikamızın təbii sərvətlərini – neft, qaz ,faydalı filiz yataqları, doğma təbiəti, əlverişli coğrafi mühiti, iqlimi, ictimai və təbii hadisələri haqqında geniş biliklər əldə edir, onun dünyagörüşü formalaşır. Bununla uşaqlar fəsilləri, meyvə - tərəvəzi, heyvanları, bitkiləri bir – birindən fərqləndirməyi bacarır, mühakimə yürüdür, cisim və hadisələrin hər birinə qayğılı münasibət göstərir, onları qoruyur. Nəticədə uşaqların lüğət ehtiyyatı zənginləşir, dialoji və monoloji nitqləri inkişaf edir. Uşaqlar sərbəst, aydın, rəvan rabitəli nitqə yiyələnirlər.

**Ədəbiyyat:**


1. Həsənov A. - Məktəbəqədər pedaqogika “Nasir” nəşriyyatı Bakı -2011
2. Y.Ş.Kərimov – Məktəbəqədər yaşlı uşaqların nitq inkişafının metodikası, Bakı – 2009
3. Mursaqulova R., Əliyeva Ş. Məktəbəqədər yaşlı uşaqların təbiətlə tanış edilməsi metodikası. Bakı ADPU.2009


**Role of acquaintance workshops in the development of speech of preschool children**

**Summary**

In this article, the word phonetic, lexical and grammatical norms of our language in accordance with the introduction of the outside world, influence the development of mental processes are talking about children using its influence in the development of the child speech communication with the outside world,. The author notes that plays an important role in formation of independent communications each process occurring outside a speech in children.

**Роль занятий окружающая среда в развитии речи у детей дошкольного возраста**

**Резюме**

В этой статье связной речи в развитии нашего языка, лексических, фонетических и грамматических от использования психических процессов, происходящих в окружающей среде. Совместное о том, что каждый процесс играет большую роль в формировании независимой связной речи у детей к развитию детей от знакомства с окружающим миром в соответствии с нормами окружающего мира, влиянии детей.

**Rəyçi: dos. Z.Zeynalova**

**Bədəlzadə Günay Nazim qızı**
Azərbaycan Respublikasının Təhsil İnstitutu

# PSİXOLOJİ VƏ PEDAQOJİ TƏDQİQATLARDA "DAUN SİNDROMU " HAQQINDA FİKİR FORMALAŞMASI

***Açar sözlər:*** *Daun sindromu,Daun sindromlu şəxslər,psixoloji-pedaqoji tədqiqatlar*
***Key words:*** *Down syndrome, People with Down syndrome, Psycho-pedagogical studies*
***Ключевые слова:*** *синдром Дауна, люди с синдромом Дауна, психолого-педагогические исследования*

Müasir Azərbaycanda əlil insanlar üçün münasibətlər tədricən dəyişir. Son zamanlar qəbul edilmiş qanunlar , insanların məhdud imkanları əsasında ayrı-seçkilik etməsinə maneə törətmişdir və Azərbaycanın əlil insanların həyat keyfiyyətinin yüksəldilməsinə yönəldilmişdir. Son illərdə əlillər, o cümlədən Daun sindromu olanlar, uşaq bağçalarına və məktəblərə qatılanların sayı əhəmiyyətli dərəcədə artmışdır,halbuki əvvəlki dövrlərdə bu mümkün deyildi.

Daun sindromu olan şəxslərin inkişafı, onların real inkişafı və inkişaf perspektivləri ilə bağlı fikirlər əksər hallarda bir çox miflər tərəfindən təhrif olunur. İndiyə qədər bir çox miflər var ki,bu cür uşaqlar sevdiklərini tanımırlar, ünsiyyət qura bilmirlər, bağçalara və məktəblərə gedə bilmirlər,təhsildə müvəfəqiyyət əldə etmirlər,müvafiq peşə istiqamətinə hazırlanmırlar ,işlə təmin olunmurlar və b .Bəzi valideynlərin , iddia etdiyi kimi, tərbiyə və təlimlə onların öhdəsindən gələ bilməyəcəklər və buna görə də bu uşaqlar uşaq evlərində böyüdükdə hər kəs üçün daha yaxşı olacaq.Xarakterik olaraq, bu fikir yalnız sıravi insanlar arasında deyil, həm də bəzi mütəxəssislər arasında mövcuddur.(2)

Daun sindromlu bir uşağın dəstəklənməsi -onun müalicəsi, təhsili,reabilitasiyası , sosial adaptasiyasıvə cəmiyyətə inteqrasiyası ilə bağlı problemlərin birləşməsidir.Daun sindromu ən geniş yayılmış genetik anormallıqdır.Statistikaya görə, hər 700-800 yeni doğulmuş uşağlardan biri Daun sindromu ilə doğulur.Oğlan və qızlar eyni sayda anadan olurlar.Tibbi, pedaqoji və psixoloji elmlərdə bir çox illərdir ki, onların şəxsiyyətin inkişafı üçün bu diaqnozun ümidsizliyinə dair bir bəyanat verilirdi.Daun sindromlu bir şəxsin təlim ala bilməsinə inanılmırdı.Dövlətlərin əsas narahatlığı bu insanları cəmiyyətdən təcrid etmək,qapalı tipli bir sistemə yerləşdirib, lazım olduqda yalnız əsas qayğı və müalicə həyata keçirildi.Uşaqların hüquqlarını hörmət etməyən Daun sindromlu uşaqların problemlərinin həllində belə bir dövlət yanaşması, həm uşaqların məktəbəqədər və məktəb təhsili səviyyəsində, həm də əhalinin bu kateqoriyasında işləmək üçün kadr hazırlığı səviyyəsində böhran vəziyyətinə gətirib çıxardı.Bu yanaşma əlilliyin tibbi modelinə əsaslanırdı.

Son illərdə dünyanın ictimai-siyasi dəyişiklikləri, dövlət və hökumət strukturları tərəfindən hazırkı vəziyyətin dəyişdirilməsinə cəhdlər bir sıra qanun və qaydaların qəbulunda ifadə edilmişdir.Qəbul edilmiş nizamnamə sənədləri intellektual, fiziki və psixoloji problemləri olan şəxsləri xüsusi ictimai qayğı və yardım obyekti hesab edir.Cəmiyyətin bu cür münasibətlərə olan münasibəti onun sivilizasiyasının və inkişaf səviyyəsinin qiymətləndirilməsi üçün bir meyar olur.Artıq bütün dünyada müasir təhsil sistemində əlilliyi olan şəxslərə sosial model çərçivəsində yanaşılır.Daun sindromlu bir şəxsin korreksiyaedici-təhsil və sosial-pedaqoji prosesə daxil edilməsi inkişaf səviyyəsini artırır, uşağın sosial fəaliyyətinə yardım edir.Daun sindromu olan şəxslərin gələcəyi artıq hər zamankindən daha çox ümid vericidir.

Daun sindromu haqqında ilk tədqiqat 1846-cı ildən əvvəl bir Fransız həkim və pedaqoq Edouard Seguin tərəfindən tanınmış olsa da, sindromun ilk yazılı təsviri 1866-cı ildə sindromun adını aldığı İngilis həkim Con Langdon Daun tərəfindən nəşr olunmuşdur.1959-cu ildə Daun sindromunun genetik əsasını Fransız genetikçisi və onun həmkarları Jerome Le Jeunetədqiq etdi. (1. s. 6-12)

İntelektual əlilliyi olan şəxslərin psixoloji, şəxsi , məktəbdə oxumağa hazırlıq problemi L. İ. Bojoviç, L. S. Vqotski, N.İ.Qutkina, E.Kravtsova, N.Q Salmina D.B. Elkonin və başqaları kimi tədqiqatçılar və alimlər tərəfindən tədqiq edilmişdir.

Ölkəmizdə on ildən çoxdur ki, intellektual əlilliyi olan uşaqların psixi inkişafının xüsusiyyətləri, tədrisin və təhsilin müasir formalarının axtarılması, yeni düzəliş inkişaf texnologiyalarının inkişafı ilə bağlı intensiv tədqiqatlar aparılıb.Daun sindromlu uşaqlar intellektual əlilliyi olan uşaqlar arasında kifayət qədər böyük bir nosoloji qrup təşkil edir.Təhsil sahəsində mövcud olan vəziyyət sonrakı təhsili üçün Daun sindromlu uşaqların hazırlanmasını yaxşılaşdırmağa zərurət yaradır.Daun sindromlu uşaqların inkişafının müxtəlif sahələrində bacarıqların formalaşmasına müasir yanaşmanın bir xüsusiyyəti onların psixomotor profilini (fenotip) nəzərə alaraq, onların inkişafının güclü və problemli aspektlərini bilməkdir.

İntelektual əlilliyi olan şəxslərə aid yanaşmalara nəzər saldıqda keçmiş əsrin tədqiqatlarından indiyə qədər aparılan tədqiqatlarda elmi cəhətdən böyük bir dəyişikliyi görmək mümkündür.İntelektual əlilliyi olan şəxslərin həyat fəaliyyətinin yaxşılaşdırılması istiqamətində bir çox müzakirələrin edilməsi,

konsepsiyaların qəbulu onların həm elm sahəsində , həm də xidmət sahəsində böyük nailiyyətlər əldə etməsinə səbəb olmuşdur.Daun sindromunu tədqiq etmək məqsədi üçün intellektual əlilliyi anlamaq üçün "inkişaf yanaşması" nın tətbiqi, və bilik pozuntusu olan şəxsləri öyrənmək üçün iki qruplu yanaşmanın sonrakı izahı elmi tədqiqat və xidmətlərin çatdırılmasına təsir göstərir. (3. s. 30-45)

Bu yazıda biz intellektual əlilliyi öyrənmək və Daun sindromu davranış fenotipinin mövcud anlayışımıza xüsusi töhfələrini öyrənmək üçün "inkişaf yanaşmasının" iştirakını nəzərdən keçiririk. Daha sonra koqnitiv, nitq inkişafı, sosial-emosional fəaliyyət, şəxsiyyət-motivasiya, motor inkişafı və psixopatologiya sahəsində Daun sindromu davranış fenotipi üzrə mövcud ədəbiyyatı təsvir edirik.

İntellektual əlilliyə dair tədqiqatın inkişaf perspektivliyi 20-ci əsrin ortalarında intellektual əlilliyi olan uşaqların tipik inkişaf edən uşaqlarla müqayisədə inkişafın dərəcələri və inkişaf strukturlarının araşdırılması ilə başladı.Bu inkişaf tədqiqatları daha çox nüansa çevrildiyi üçün nəzəriyyəçilər, ehtimal ki, iki qrupdan birinə məxsus olan "intellektual əlilliyi olan" şəxslərin anlayışının dəqiqləşdirilməsini müzakirə etməyə başladılar.

"İki qruplu" yanaşma fərdi bir şəxs olduğundan bəhs edir yəni irsi və ekoloji amillərin təsiri ilə intellektual əlilliyə meyarlara cavab verirsə, bu əlillik "ətraf mühit" və ya "ailə" adlanır; fərdi intellektual əlillik meyarlarına əsasən, əsas genetik xəstəliklər, prenatal inkişafın pozulması və ya digər əlaqəli amillər səbəbiylə əlilliyə "üzvi" adlanı. (6)

Bu yanaşma tədqiqatçılara hər bir qrup daxilində əlilliyi olan xüsusi növlərin əsas səbəblərini və nəticələrini daha yaxından araşdırmağa imkan vermişdir. Xüsusilə, "üzvi" əlillik qrupu əhatə edən müxtəlif xəstəliklərə tədqiqat xəttini təyin etmişdir. Daun sindromu kimi genetik mənşəli olan pozulmalar (lakin mütləq irsi deyil), fərqli bir araşdırma üsulu ilə diqqəti cəlb etdi . Tədqiqatçılar, müxtəlif xəstəliklərə sahib olan uşaqlara genetikanın necə təsir etdiyini araşdırmağa başladılar. Bu elmi yanaşma indi "davranış fenotipləri" ya da "Daun sindromu" nun nəticələrinə böyük diqqət yetirməklə və digər xəstəliklərin az qismində , genetik xəstəliklərlə əlaqəli davranış güclü və zəif cəhətlərin tədqiqi kimi başa düşülmüşdür. İki əhəmiyyətli tədqiqat , intellektual əlilliyin xüsusiyyətlərinə əsaslanan iki qrup yanaşmanın anlayışının aşkar olunmasını təmin etmişdir.

Birincisi, artıq üzvi intellektual əlilliyin müxtəlif növləri, xüsusilə də genetik mənşəli əlilliyi olan inkişaf göstəricilərinin fərqli profillərinə gətirib çıxaran çoxlu sübutlar mövcuddur. Beləliklə, Daun sindromu və Williams sindromu kimi fərqli genetik xəstəliklərə məruz qalan iki uşaq IQ-nın ümumi tədbirlərinə oxşar standart bal qazanmaqla, inkişafın xüsusi sahələri araşdırıldıqda olduqca fərqli performans profillərini göstərə bilərlər. Müxtəlif qüsurları olan uşaqların fərqli inkişaf profillərini göstərə biləcəyi ehtimalına əlavə olaraq, bu xətt intellektual əlilliyi olan bir çox xəstəliyin fərdi fəaliyyət sahələrini bərabər səviyyəyə salmasına gətirib çıxarmayıb.

Bu günə qədər təyin edilmiş 1000+ genetik xəstəlikdən Daun sindromu ən diqqətlə araşdırılmışdır. Daun sindromlu uşaqların xüsusiyyətləri təxminən 50 ildir ki araşdırılır. Daun sindromu üçün davranış fenotipi sosial, koqnitiv, linqvistik, motor və psixopatologiya sahələrində təsvir edilmişdir və bundan sonra nəzərdən keçiriləcəkdir.

Şüurun inkişafı, Daun sindromu olan körpə üçün nisbətən tipik olaraq başlamış və ilk iki ildən sonra sürətlə azalmışdır və bu inkişaf dövründə beyin miyelinin gecikmə dərəcələri ilə əlaqəli ola bilər . Faydar, Philofsky, Hepburn və Rogers Daun sindromu olan məktəbəqədər yaşlı uşaqlarda digər inkişaf gecikmələri olan uşaqlara nisbətən vasitə sonu düşüncəsinin inkişafı ilə əlaqədar çatışmazlıqları müşahidə ediblər.

0-11 yaş arasında olan Daun sindromlu uşaqları öyrənmək mövcud bacarıqların qorunması və yeni problemlərin həlli üçün təsirli strategiyaların davamlı istifadəsi zamanı çətinliklər müşahidə oluna bilər.

Məktəb yaşlı Daun sindromlu uşaqların sosial inkişafının öyrənilməsi ətraflı olaraq araşdırıması davam edir. Apardığımız müşahidələrdə Daun sindromlu uşaqların əksəriyyəti əsl dostluq meyarlarına cavab verən qarşılıqlı münasibətlərin sübutunu göstərdi .Daun sindromu olan məktəb yaşlı uşaqlarda zəif inkişafın digər növlərinə malik uşaqlarla müqayisədə artan gülümsəmə tez-tez sosial işlə təmin olunma güclüdür .Digər sindromlu uşaqlara nisbətən onlar daha tez ünsiyyətə adaptasiya ola bilirlər.

Walz və Benson, Daun sindromlu məktəbli uşaqlar üçün digər zehni inkişafı olan uşaqlarla müqayisədə daha çox valideynlərin bildirdiyi pro-sosial davranışları (məsələn, vəzifə, səbr, qrup fəaliyyətlərində iştirak etmək, yönləndirməni qəbul etmə və s.) tez adaptasiya olurlar. Nəhayət, Daun sindromlu məktəbli və yeniyetmə uşaqlar Williams və Prader-Willi sindromulu uşaqlarla müayisədə ən yüksək ümumi sosial səriştə (yəni qruplarda iştirak sayı və dərəcəsi, dostları ilə sayı və yaxınlığı, fərdi necə işləyə biləcəyi və ya mütəqil oynaya biləcəyi və s.) göstərmişdir. (1. s. 35)

Motorikanın inkişafının öyrənilməsi Daun sindromlu uşaqlarda tədqiqatın diqqətini cəlb edən bir inkişaf sahəsidir. Aşağı əzələ tonusu Daun sindromunun xarakterik xüsusiyyətidir. Çünki əzələ tonusunun aşğı olması təkcə əzələ sərtliyinə nəzarətdə çətinliyə səsbəb olmaqla deyil , həm də motorikanın inkişafına mənfi təsir göstərə bilər. Motor mərhələləri tipik inkişafla eyni ardıcıllıqla müşahidə olunmasına

baxmayaraq, ən gecikmiş dərəcələrlə daha da inkişaf edən mərhələlər üçün ən böyük gecikmələrlə inkişaf edir. Daun sindromlu məktəb yaşlı və erkən gənclik dövründə olan şəxslər bir sıra hallarda xüsusi motor pozuntularını nümayiş etdirirlər sürətin, çevikliyin və görmə-motor nəzarəti də daxil olmaqla xüsusi bacarıqlarda, ümumi motor vəzifələri (məsələn, balans, duruş, güc və rahatlıq) və s.vəziyyətlərdə. (5. s. 355-364)

Beləliklə, Daun sindromlu uşaqların psixopatoloji xüsusiyyətlərini öyrənməklə bu günə qədər Daun sindromu üçün bilinən davranış fenotipini üzə çıxarmağa kömək edir. Daun sindromlu uşaqlarda digər zəka geriliyi olan uşaqlarla müqayisədə psikopatoloji riskin təxminən yarısını müşahidə etmək olur.. Buna baxmayaraq, hiperaktivlik, təcavüz, inadkarlıq, itaətsizlik, diqqətsizlik və implusivlik kimi xüsusiyyətlərin hamısı Daun sindromlu uşaqların əksəriyyətində müşahidə olunur.

Hal-hazırda da Daun sindromlu şəxslərin tədqiqatı mütəxəsisslərin diqqət mərkəzindədir.Onların cəmiyyətə sosial inteqrasiyası və peşə reabilitasiyası,təhsillərinin keyfiyyətinin yaxşılaşdırılması üçün araşdırmalar aparılır.

**Ədəbiyyat:**

1. Bruni, Maryanne. Fine Motor Skills in Children with Down Syndrome: A Guide for Parents and Professionals, Second Edition. Bethesda: Woodbine House, 2006.

2. Down Syndrome Myths and Truths.‖ National Down Syndrome Society. http://www.ndss.org/index.php?option=com_content&task=category&sectionid=23&id=58&Itemid=234 (accessed October 10, 2007)

3. Cohen WI. Health care guidelines for individuals with Down syndrome: 1999 revision. Down Syndrome Quarterly. 1999

4.Chapman R, Hesketh L, Kistler D. Predicting longitudinal change in language production and comprehension in individuals with Downsyndrome: Hierarchical linear modeling. Journal of Speech, Language, and Hearing Research. 2002;45(5): 902-915

5. Vicari S. Motor development and neuropsycho-logical patterns in persons with Down syn-drome. Behaviour Genetics. 2006;36(3).

6. www.down-syndrome.org/research

**Forming thoughts about Down syndrome in psychological and pedagogical research**

**Summary**

In reviewing the past century of research on individuals with intellectual disabil-ity, it is possible to identify specific shifts in scientific approach that have had far-reaching impact. Debates and consensus regarding the definition of terms, the identification of the construct “adaptive behaviour”, and discussions regarding quality of life have all had a profound impact on both science and service in the field of intellectual disability. For the purposes of research in Down syndrome, the introduction of the “developmental approach” to understanding intellectual disability, and the subsequent delineation of the two-group approach to studying individuals with cognitive impairments continue to impact scientific inquiry and service delivery.

**Формирование мысли о синдроме Дауна в психолого-педагогических исследованиях**

**Резюме**

Рассматривая результаты исследований лиц с интеллектуальными нарушениями прошлого столетия, можно выявить конкретные сдвиги в научном подходе, которые оказали далеко идущие последствия. Дискуссии и консенсус в отношении определения терминов, идентификации понятия «адаптивное поведение» и дискуссий о качестве жизни оказали глубокое влияние как на науку, так и на службу в области умственной отсталости. В целях исследования синдрома Дауна внедрение «подхода к развитию» для понимания умственной отсталости и последующее разграничение двухгруппового подхода к изучению лиц с когнитивными нарушениями продолжают оказывать влияние на научные исследования и оказание услуг.

**Rəyçi: dos.N.T.Hüseynova**

**Ağayeva Tamilla Hüseyn qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti

# KAR UŞAQLARDA ÜNSİYYƏT ÇƏTİNLİKLƏRİNİN ARADAN QALDIRILMASININ PSİXO-PEDAQOJİ YOLLARI

***Açar sözlər**: kar uşaq, ünsiyyət, nitq, sosiallaşma, şəxsiyyət*
***Key wolds**: deaf children,communication, speech, socialization, personality*
***Ключевые слова**: глухой ребенок, общение,речь,социализация,личность*

Məlumdur ki, kar uşaq normal ünsiyyət prosesinə qoşula bilmədiyi üçün onun şəxsiyyət kimi formalaşması prosesi ya ləngiyir, ya da düzgün formalaşmır. Eşitmə nin itirilmə ağırlığından asılı olaraq nitq inkişafı pozulmuş kar uşaq sosial adaptasiya zamanı bir sıra çətinliklərlə üzləşir.Çox zaman o, insanlarla ünsiyyət prosesinə qoşulmaqdan boyun qaçırır və sosial mühitə bələdləşməsi olduqca zəifləyir. Kar uşaqlarda mənlik şüurunun da gec formalaşması şəxsiyyətlərarası ünsiyyətin qurul masında da müəyyən maniələr yaradır.Mənlik şüurunun gec formalaşması kar uşaq da özünəgüvən,əminlik, gələcəyə inam,hisslərinin yaranmasına mənfi təsir göstərir. Kar uşaq hüquq və azadlıqlarını dərk etməkdə, normal eşidən yaşıdları və böyük lərlə qarşılıqlımünasibət qurmaqda böyük çətinliklərlə üzləşirlər. Kar uşaqda şifa hi nitq bacarıqlarının kifayət qədər inkişaf etməməsi, digər tərəfdən cəmiyyətin jest dilindən istifadə bacarığının olmaması onların sosial mühitdə ünsiyyətə girmə sinə böyük əngəl yaradır, nəticədə bir- birini anlamaqda çətinlik çəkən tərəflər arasında aqressivlik, neqativizm kimi mənfi hallar baş verir. Kar uşaqlarda emosional - iradi sahə, davranış və şəxsiyyətin formalaşmasındakı çatışmazlıqlar sosial reabili tasiya və adaptasiyasının gedişinə, onların tələbat, iddia səviyyəsi və özünüqiymətləndirməsinə də mənfi təsir göstərir. Bu pozulmaların yaratdığı əngəllər onların müvafiq peşəyə yiyələnməsinə və əmək fəaliyyətinə daxil olmasına, nəhayət, sosial yük daşımasına manə yaradır. Kar uşaq ələbaxan, tənbəl, ictimai yükdən boyun qaçıran insan kimi formalaşır.Bu halların baş verməməsi üçün kar uşaqlarla vaxtında ailə və məktəb şəraitində korreksiya-inkişafetdirici işi təşkil etmək lazımdır. Valideyn və müəllimlər tərəfindən sosial mənşəyindən, milliyətindən, dilindən, dinindən, cinsin dən, yaşından, şəxsiyyətindən və davranış xüsusiyyətlərindən asılı olmayaraq, insalara hörmət və səbirlə yanaşmağı tərbiyə etməlidirlər. Kar uşaq əmin olmalıdır ki, ətrafındakılar fiziki qüsuruna baxmayaraq, onu sevir və həmişə köməyinə gəlməyə hazırdırlar. Tərbiyə prosesində uşaqlara digər insanlarla əməkdaşlıq üçün vacib olan davranış mədəniyyəti və dəyərlər: insanlara kömək etmək, birgəyaşayış və birgə işləmək, öz işini planlaşdırmaq, istəyinə nəzarət və idarə etmək, fəaliyyət zamanı tərəf müqabilləri ilə razılığa gəlmək və s. bu kimi keyfiyyətlər aşılanır. Uşaqlarda yaxınları qarşısında börc, məsuliyyət hissi yaratmaq, ətrafındakıların emosional narahatlıqlarını və xüsusiyyətlərini fərqləndirmək, bununla yanaş, öz narahatlıqlarını da ifadə edə bilmək, müxtəlif situasiyalardan baş çıxartmaq, yeni əlaqələr yaratmaq kimi bacarıqlar da formalaşdırılır,

Qeyd edək ki, sosiallaşma nəinki ağır eşitmə qüsurlu uşaqlar, həm də normal eşidən uşaqlar üçün də çətin bir prosesdir. Sadəcə olaraq kar uşaqların eşitmə qavrayışı, nitq və ünsiyyət bacarıqları olmadığı üçün proses daha çətin gedir. Kar uşaqların ilk sosiallaşma addımları böyüklərin köməyi, ikinci addımı isə eşidən həmyaşıdları ilə ünsiyyət prosesi vasitəsi ilə olur. Məhz bu yolla eşitmə qüsurlu uşaq sosial təcrübəni qəbul edib qavraya bilir.

Kar uşaqlarda ünsiyyət probleminin konseptual əsaslarını bir çox tədqiqatçılar: V.M.Bexterev, L.S.Vıqotski, S.L.Rubinşteyn, A.N.Leontyev, B.Q.Ananyev, M.M. Baxtin, V.N.Myasişevin və digərləri araşdırmışlar Onlar ünsiyyətə insanın psixi inkişafının, onun sosiallaşma və fərdiləşməsi, şəxsiyyətinin formalaşmasının vacib şərti kimi baxmışlar. Ünsiyyət problemi ilə bağlı Azərbycan psixoloqları Ə.Ə.Əlizadə, Ə.S.Bayramov, M.Ə.Həmzəyev və başqaları da bir sıra maraqlı fikirlər irəli sürmüşdür.

Ünsiyyət vacib sosial tələbatdır və onun həyata keçməməsi kar uşaq şəxsiyyətinin formalaşmasını ləngidir, bəzən isə tamamilə dayandırır. Kar uşaqlar qeyri-verbal ünsiyyət vasitəsitələri: jest, daktillə bu təlabatı tam ödəyə bilmir, bunun nəticəsində ünsiyyət təlabatlarının ödənilməməsi ciddi problemlərə yol açır. Onun sosial mühitə inteqrasiya üçün sosiallaşması, insanlarla informasiya mübadiləsinə qoşulması, dünya haqqında biliklər toplayaraq, öz həyat təcrübəsində istifadə etməsi çox vacibdir. Məhz ünsiyyət vasitəsi ilə onlar sosial, mədəni, idraki, yaradıcılıq, estetik, intellektual və mənəvi təlabatlarını, maraqlarını tam ödəmiş olurlar. Lakin çox təəssüf olsun ki, eşitməyən uşaqda cəmiyyətə uyğunlaşması, ətraf aləm haqqında lazım olan bilik və bacarıqlara yiyələnməsi, ünsiyyət qurması üçün kifayət qədər bacarıqları olmur.

Təbii ki, kar uşaqlarda verbal nitqin formalaşması məktəbəqədər yaş dövrü üçün olduqca tezdir. Lakin artıq məktəb dövründə təlim-tərbiyə prosesində uşaqda verbal ünsiyyət bacarıqlarının formalamması

istiqamətində məqsədəyönlü, ardıcıl və sistemli iş təşkil edilir. Əgər normal eşidən uşaq ilk başlanğıcda şifahi nitq vərdişlərinə ailədə, ətrafdakı insanların tələffüzünü mexaniki təkrarlamaqla yiyələnirlərsə, kar uşaq yalnız nitq inkişafı üzrə xüsusi təşkil edilmiş təlimlə başlayır. Başqa sözlə, kar uşaqlarda şifahi nitq vasitəsi ilə ünsiyyət vərdişləri yalnız məktəb təlimi dövründə formalaşdırılır. Məktəbdə korreksiya-inkişafetdirici iş elə qurulur ki, kar uşaq ünsiyyət prosesində jest mimiki nitqdən deyil, bilavasitə sözlü nitqdən istifadə etsin. Eşitmə qüsurlu uşaqlarda nitq bacarıqlarının inkişaf etdirilməsi olduqca vacib məsələdir. Əgər ünsiyyət problemi vaxtında reabilitasiya edilməzsə, uşağın şəxsiyyətinin formalaşması, mənlik şüurun inkişafı, davranış pozuntuları, ictimai dəyər və normaların düzgün qavranılmaması, əxlaq dəyərlərinin formalaşmaması və s. kimi problemləri də cəlb edəcəkdir. Bu problemlərin hər biri ayrı-ayrılıqda eşitmə qüsurlu uşağın sosial adaptasiyası prosesini çətinləşdirir.

Adətən valideynlərin və cəmiyyətin düzgün yanaşmaması nəticəsində eşitmə qüsurlu uşaqlarda davranış pozuntuları, ictimai qaydalara riayət etməmək kimi hallar müşahidə edilir. Zamanında əxlaq normalarının tərbiyə olunması gələcəkdə yaranacaq problemlərin qarşısını almaqda xeyli köməklik edir. Çox zaman kar uşaqlar və cəmiyyət arasında qarşılıqlı anlaşılmazlıqlar meydana çıxır. Bu onların ortaq ünsiyyət qurmaq qabiliyyətlərinin zəif inkişaf etməsindən və xüsusilə də eşitmə qüsurlu uşaqların cəmiyyət içində normal davranış qaydalarını bilməməsindən irəli gəlir. Çox zaman mövcud qüsuruna əsaslanaraq ya uşaqlara həddən artıq sərbəstlik verilir, “olmaz”, “eləmə”kimi anlayışlar formalaşdırılmır, ya da valideynlərin özləri maarifləndirilmədiklərindən düzgün təlim-tərbiyə metodikası seçə bilmirlər. Uşaqların məktəbəqədər yaş dövründə düzgün inkişafının təmin olunmasında valideynlərin tərbiyəçilər, pedaqoqlarla birgə əməkdaşlığı effektiv nəticələr əldə etməyə kömək edəcəkdir. Əgər uşaqlara normal əxlaq tərbiyəsi verilsə, onların normal davranış qaydaları, cəmiyyətə adaptasiya və s. kimi problemləri də aradan qalxmış olar.

İnsanların əməyə, bir-birinə, ailəyə, cəmiyyətə, dövlətə olan münasibətlərini müəyyən edən və tarixən təşəkkül tapmış mənəvi və hüquqi davranış normalarına əxlaq deyilir. İnsan cəmiyyəti inkişaf etdikcə əxlaq, davranış normaları zənginləşir, mürəkkəbləşir. Əxlaq insan üçün davranışın əvəzedilməz kompas rolunu oynayır. Bu kompas ictimai həyatda, insan mədəniyyətinin xüsusi aləmində-sosial sərvətlər aləmində bələdləşməyə imkan verir. Əxlaq bələdləşmə, normalar, qadağalar, qiymətlər, ideallar sistemi vasitəsilə insanların davranışını tənzim edir. Əxlaqın müxtəlif funksiyaları vardır. Bu funksiyalara tənzimedici, tərbiyəvi, dərketmə, qiymətləndirici, istiqamətləndirici, kommunikativ və s. daxildir. Əxlaqın həmin funksiyaları qarşılıqlı surətdə həyata keçirilir. Əxlaq insanların ünsiyyətinin xüsusi forması kimi təzahür edir. Bu ünsiyyətdə sosial mühitə, cəmiyyətə və dünyaya sərvət münasibəti vardır. Əxlaq normaları şüurda qarşılıqlı asılılığın və tabeliyin müəyyən sistemində təzahürünü tapır. Əxlaqın tərbiyə edilməsinin vəzifələri insanların sosial mövqeyindən irəli gəlir. Əxlaq kar uşaq şəxsiyyətinin formalaşmasın da mühüm əhəmiyyət kəsb edir. Məktəblərdə fəaliyyət və ünsiyyət prosesində kar uşağın dünyaya, insanlara müəyyən münasibət yaranır. Onlar oyunda, təlimdə, idmanda, əməkdə bir-biri ilə ünsiyyətə girir və müəyyən davranış normalarının yerinə yetirilməsinə, həmin normaların gözlənilməsinə nail olurlar. Əxlaqın tərbiyə edilməsinin vəzifələrinə uşaqları, yeniyetmə və gəncləri müntəzəm olaraq cəmiyyətin əxlaq normalarına cəlb etmək, şagirdlərin özlərinin müsbət əxlaqi təcrübəsini formalaşdırmaq, onlarda milli mənsubiyyətin və milli şüurun inkişafına nail olmaq və s. daxildir. Əxlaq tərbiyəsinin komponentlərinə vətənsevərlik, humanizm, böyüyə hörmət, dostluq və yoldaşlıq, şüurlu intizam, iradi keyfiyyətlərin tərbiyəsi və s. daxildir. İradə insanın qarşıya qoyduğu məqsədə çatmaq göstərdiyi fəaliyyət zamanı meydana çıxan maneələri aradan qaldırmağa xidmət edən psixi prosesdir . İradi keyfiyyətlərin kar uşaqa tərbiyə olunmasının əsası ailədə qoyulur, bağça və məktəbdə bu daha da möhkəmləndirilir. Kar uşaqlarda dözümlülük, səbr, yeni bilik və təcrübəyə yiyələnmək üçün iradi səy tərbiyə edilir. İradə həmçinin kar uşağın həyatda qarşlaşdığı çətinlikllərə sinə gərməyə, onları aradan qaldırmağa kömək edir. Məktəb təlimində iradi bacarıqların formalaşdırılması və inkişafı məqsədəyönlü şəkildə, ümumtəhsil fənlərinin tədrisi prosesində, xüsusu ilə də texnologiya və bədən tərbiyəsi dərslərində aparılır. Kar uşağın Milli qəhrəmanlar, vətən yolunda şəhid olanların əzmkarlığı , onların həyatı, göstərdikləri şücayət haqqında blgiləri onlarda milli qürur hissi ilə yanaşı müsbət şəxsiyyət keyfiyyətlərinin aşlanmasına da müstəsna rol oynayır.

**Ədəbiyyat:**

1.N.Hüseynova, S.Aslanova Xüsusi psixologiya I, II hissə, Bakı, 2018
2.Астафева В.М.Социальная адаптация и интеграция детей с нарушениями слуха М, 2000
3.Речицкой Е.Г.Сурдопедагогока. М., ВЛАДОС, 2004.

### Psycho-pedagogical ways to eliminate communication problems in deaf children

**Summary**

As you know, since a deaf child cannot connect to the normal process of communication, the process of forming his personality is either delayed or incorrectly formed. Depending on the degree of hearing loss in a deaf child, a number of difficulties arise in the process of social adaptation.

### Психо-педагогические способы устранения проблем общения у глухих детей

**Резюме**

Как известно, поскольку глухой ребенок не может подключиться к нормаль ному процессу общения, процесс формирования его личности либо задер живается, либо формируется неправильно. В зависимости от степени потери слуха у глухого ребенка возникает ряд трудностей в процессе социальной адаптации.

**Rəyçi: dos. M.Məlikov**

**Əliyeva Nərgiz Şöhrət qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti

# ƏQLİ İNKİŞAFIN QANUNAUYĞUNLUQLARININ MÜQAYSƏLİ XARAKTERİSTİKASI (NORMA VƏ PATALOGİYA)

***Açar sözlər:*** *əqli, psixi, şəxsiyyət, inkişaf*
***Keywords:*** *intellectual, mental, personality, development*
***Ключевые слова:*** *умственное, психологический, личность, развитие*

Əqli inkişafdan geri qalmani səciyyələndirən bəzi xarakter əlamətlər var. Əksərən bu kimi insanlar başqalarının yardımı olmadan bir iş görməkdə çətinlik çəkirlər. Çox vaxt isə məntiqsiz hərəkətlər edirlər. O cümlədən say, zaman və böyüklük ölçülərindən istifadə zamanı çətinliklə qarşılaşırlar. Yəni, diqqəti mərkəzləşdirə bilmir, təfəkkür sferasında analiz, sintez, ümumiləşdirmə proseslərində çətinlik yaşayırlar. Eyni zamanda onlarda problem yaşayanlarda iradə və emosional sferada kasadlıq, təsəvvür etmədə çətinlik, tez təsir altına düşmə kimi də negativ hallar nəzərə çarpır.

Əqli inkişafdan geri qalan uşaqların psixi proseslərinin və təlim imkanlarının araşdırılması zamanı idrakında, emosiaonal-iradi sferalarında, davranışlarında və şəxsiyyətlərində bəzi spesefik özəlliklər aşkar edilmişdir.Psixi ləngiməsi olan uşaqlar aşağıdakı özəlliklərə malikdir:

- Yüksək zəiflik nəticəsində iş qabiliyyətinin zəif olması;
- İradə və emosiyaların zəifliyi nəzərə çarpır;
- Söz ehtiyyatının azlığı;
- İntellektual fəliyyətin zəif olması;
- Oyun fəaliyyəti natamam formalaşır;
- Hafizənin bütün növlərində inkişafsızlıq nəzərə çarpır;
- Özünə nəzarət səviyyəsi aşağı olur;
- Məktəb təlimi üçün analiz,sintez, müqayisə, ümumiləşdirmə kimi təfəkkür əməliyyatı yaranmış olur.

Əqli cəhətdən zəif uşaqlardan fərqli olaraq psixi inkişaf ləngiməsi olan uşaqların öyrənmə qabiliyyəti nisbətən yüksək olur, müəllimin və böyüklərin yardımından daha doğru şəkildə faydalana bilirlər. Oxu, yazı hesabın öyrənilməsi zamanı psixi inkişafın ləngiməsi olan uşaqlarda da əqli olaraq geri qalan uşaqlar kimi səhvlər müşahidə edilir, ancaq keyfiyyətcə onlardan fərqlənir. Misal üçün: Psixi inkişaf ləngiməsi olan uşaqlar zəif oxu texnikasına baxmayaraq, oxuduqlarını anlamağa cəhd edirlər, mətini yenidən oxuyurlar. Əqli cəhətdən geri qalan uşaqlar isə oxuduqlarını anlaya bilmirlər.

Normal inkişaf zamanı, inkişafın ümumi qanunauyğunluqlarını bütün eynicinsli canlıların inkişafında görmək mümkündür. Yaş xüsusiyyətləri, orqanizmin inkişaf etmə sürəti əvvəlcədən təyin edilmiş qanunauyğunluq şəklində təşəkkül edir. İnkişafın fərdi xüsusiyyətləri kənara çıxma sayılmır. Uşağın doğulduğu ortamın, genetik faktorların təsiri onun inkişafının bəzi qismlərini özünəməxsus şəkildə aparır və nəticədə bu bir daha göstərir ki, qanunauyğunluq mövcud olsa da inkişafın fərdi xüsusiyyətlərini inkar etmək qeyri-mümkündür.

Psixi inkişafa aid əksər mütəxəssislər tədqiqat aparmış və bu mövzu ilə bağlı bəzi nəzəriyyələr vermişlər. Bunlardan bir neçəsinə nəzər salaq.

S.L.Rubinşteyn bu cür qeyd edir: " Böyüyən uşağın istənilən inkişaf dövrü pillə və o biri pilləyə keçiddir. Bu səbəbdən də hər yaşın tərifi sabit ola bilməz; o hər dövrə əsas olan əsas dəyişiklərdən təşkil edilmişdir "

L.S.Vıqotskiya görə, psixi inkişaf prosesi bioloji və sosial faktorların vəhdəti kimi özünü göstərir. Ancaq, bu genetik və sosial amillərin sadə mexaniki və yaxud sabit birləşməsi deyil, bu proses mürəkkəb, təbəqələşdirilmiş, dinamik vəhdət sayılmalıdır. O cümlədən istənilən psixi prosesin inkişafının müxtəlif dövrlərində sosial mühitin təsiri də fərqli olur.

Uşağın psixi inkişafına aid A.N.Leontyev belə vurğulayır: " uşağın psixi inkişafını onun şəxsi həyatı, bu həyatdakı gerçək proseslər, uşağın daxili, xarici fəaliyyətinin inkişafı müəyyən edir ". O cümlədən, o uşağın "Aparıcı fəaliyyət" anlayışına xüsusi nəzər salaraq vurğulayır ki, o, psixi inkişafın istənilən dövründə uşağın ətrafa məhz bu mərhələdə olan yanaşması ilə, həmin mərhələyə məxsus olan əsas fəaliyyəti ilə təyin edilir. İnkişafın bir mərhələsindən başqa mərhələsinə keçidin əlaməti isə məhz uşağın ətrafa olan aparıcı münasibətin və əsas fəaliyyətin dəyişməsidir.

P.P.Blonski, L.S.Vıqotski, A.N.Leontyev, D.B.Elkonin uşağın psixi inkişafının dövrləşməsinə xüsusi nəzər salırlar. Uşağın inkişaf mərhələləri indiki şəraitdə daha çox D.B.Elkonin irəli sürdtəklif etdiyi təsnifata əsaslanır. Biz yaş mərhələlərinin inkişaf əlamətlərini öyrənərək hansı dövrdə psixi funksiyaların nə qədər inkişaf etməsi və yaxud geriləməsini təyin edə bilərik, Misal üçün: məktəbəqədər yaş dövründə uşağın psixi proseslərinin əlamətlərini açıq-aşkar görə bilərik. Bu proseslərin normaya uyğunluğun olub - olmamasını bilmək üçün isə uşağın bu yaş dövründə matorikasının inkişaf əlamətlərini, nitq inkişafını, dərketmə fəaliyyətinin əlamətlərini və başqa proseslərin inkişaf səviyyyəsini bilmək vacibdir. İnkişaf yaşa uyğun baş vermirsə bu artıq psixi proseslərin ləngiməsinə təkan verir.

Rüşeymin ana bətninə düşdüyü vaxtndan ölən vaxtadək keçdiyi inkişaf yolu ontogenetik inkişaf sayılırsa, bu inkişaf zamanı meydana çıxan kənaraçıxmalar isə dizontogenetik inkişafa nədən olur. O cümlədən, hər iki inkişafı normaya uyğun və yaxud qüsurlu inkişaf adlandırmaq olar. Normal inkişafın qanunauyğunluğlarını bilmədən atipik inkişafa sahib uşaqları öyrənə bilmərik. Bu səbəbdən də bir çox kitablarda norma ilə patologiya müqayisəli xarakteristika formasında təqdim edilir.

Tpik və atipik uşaqların psixofiziki inkişafının qanunları demək olar eynidir və deyə bilərik ki, hər bir pozulma inkişafın gedişini əsaslı şəkildə dəyişir. Atipik inkişafın strukturuna eyni zamanda sosial amillər, başqa sözlə desək təlim, tərbiyə və korreksiya şəraiti təsir edir.

İ.P.Pavlovun " Heç bir şey hərəkətsiz, sərt qalmır, hər şey yaxşıya doğru dəyişə bilər, təkcə lazımı şərtlər yaradılarsa" sözlərinə əsasən vurğulamaq olar ki, uşaqlarla tərbiyə və korreksiya işi doğru şəkildə qurularsa, qüsurun azalması və stabilləşməsi üçün kompensator və potensial imkanlar mövcuddur. Psixi inkişafın mühüm əlaməti psixi funksiyaların tək kəmiyyətə görə deyil, həmçinin keyfiyyətcə qarşılıqlı təsirdə dəyişməsidir.

Vurğulamaq olar ki, uşaqlar dünyaya tam formalaşmış, funksiyaların icra edə bilən orqan və yaxud analizatorlarla gəlmir. Psixi proseslərin, beyin sistemlərinin və funksiyaların inkişafı bütün uşaqlarda eyni deyildir. Proseslər adekvat və yaxud qeyri adekvat, bəzi vaxtlar isə formalaşmamış və inkişaf etməmiş ola bilər. Bu səbəbdən də psixi inkişafda ləngimə, bu proseslərin pozulmasına yol açır və normadan kənara çıxma halı yaranmış olur.

Məlumdur ki, uşağın əqli inkişafı nitqin inkişafı və emosional sahənin inkişafı ilə əlaqədə baş verir. Sensor pozulması olan uşaqda intellektual inkişafın ləngiməsi də nəzərə çarpacaq. Onda bu qüsur ikincili qüsur sayılır. Ancaq intellektual çatışmazlıq beyin qabığının xüsusi strukturlarının çatışmazlığı ilə şərtlənərsə, onda bu qüsur ilkin qüsur sayılır. Atipik inkişafın bütün növlərində nəzərə çarpan ortaq xüsusiyyət ilkin qüsurun olmasıdır. Patoloji inkişafın əsası olan ikinci dərəcəli pozulmalar ilkin qüsurun aşkarlanmasınan asılıdır. İlkin qüsur nə qədər tez yaranıbsa, bir o qədər də ikinci dərəcəli pozulmalar ağır formada özünü biruzə verir və normal inkişaf kobud olaraq pozulur.

L.S.Vıqotski vurğulayır ki, psixi proseslərin inkişafını təkcə bioloji inkişafa əsaslanan saymaq doğru deyil, bu mürəkkəb proseslər ünsiyyətdə, cəmiyyətdə mühitin təsiri nəticəsində yaranıb, inkişaf edir və təşəkkül edir. Atipik inkişafda da bu proseslərin ardıcıllığı prinsipi və yaşauyğunluğu normada olduğu kimi, eyni qanunlara uyğun olaraq baş verir. Bir neçə halda inkişaf istənilən bir istiqamətdə pozularaq, psixi fəaliyyətin başqa sahələrində inkişafın hiss oluna biləcək şəkildə ləngiməsinə şərait yaradır. Normal inkişaf edən uşaqlarda psixi inkişaf vaxtı intellektual törəmələr yaranır. Patologiyalı uşaqlarda isə hər qeyri – normal proses və yaxud funksional pozulma - şəxsiyyətin və ümumilikdə, davamlı psixi inkişafa əsaslanaraq gedir və ona təsirsiz qalmır.

Psixi inkişafın tempinin pozulması əsas və törəmə pozulma kimi baş verə bilər. Əsas simptom olaraq bir sıra durumlarda hallarda bu pozulma endogen və ekzogen etioloji faktorların təsiri ilə peyda ola bilər.

## Ədəbiyyat:

1. "Anomal inkişafın psixologiyası " – E. İ. Şəfiyeva – Bakı 2012
2. " Əqli və fiziki inkişafı ləngiyən uşaqların diaqnostikası və korreksiyası " – Səməd Qasımov, Elmira Kərimova – Bakı 2004
3. " Əlahiddə pedaqogikanın əsasları " – Səməd Qasımov, Yusif Talıbov – Bakı 2000

" İnkişaf və yaş psixologiyası " – Mirələm Vəliyev, Azər Mustafayev

4. " Uşaq psixologiyası " – Mirələm Vəliyev, Azər Mustafayev – Bakı 2011

**Comparative characteristics of natural intellectual development (norm and pathology)**

**Summary**

In children, in addition to physiological development, natural psychological development is also carried out on the basis of age principles. Due to the factors affecting the violation of mental development, the pace of psychological development processes changes when mental development is impaired, cognitive activity (thinking, imagination, attention, memory), not formed behavior of the emotional-volitional sphere, manifests itself during speech reproduction. And this is a distinctive indicator of children from children with normal development, if to say differently, characterized as atypical development. In contrast to their peers, children are characterized by signs of the younger generation and in total it is considered beyond the normal development and is evaluated as atypical development. To distinguish the norm from pathology, first we need to deeply examine the natural child development. If we are talking about the identification of potology, it must necessarily be carried out against the background of a comparison of normal development.

**Сравнительная характеристика закономерности умственного развития (норма и патология)**

**Резюме**

Помимо физического развития, психологическое развитие детей также происходит на основе возрастного принципа. Факторы, способствующие нарушению психического развития, также приводят к изменению темпа развитий психологических процессов в отличии от своих сверсников, детям присуще признаки периода младшего возраста, что в результате выходит за грань нормы и оценивается как атипичное развитие. Нарушение психического развития проявляется в познавательной деятельности (память, мышление, внимание, воображение), в несформированной эмоционально-волевой сфере, и в речевой деятельности. Это является отличительным признаком детей от детей с нормальным развитием, иными словами, характеризуется как атипичное развитие. Выявление патологии должно осуществляться в сравнении с нормальным развитием.

**Rəyçi: dos.N.T Hüseynova**

**Ölməz Ümit**
Azərbaycan Dövlət Pedaqoji Universiteti

# MEXANİKİ DİSLALİYA ZAMANI FONEMATİK QAVRAMANIN MÜAYİNƏSİ

***Açar sözlər:*** *fonematik eşitmə, fonematik qavrayış, fonem, nitq.*
***Key words:*** *phonemic insight, phonemic hearing, phonemes, speech*
***Ключевые слова****: фонематический слух, фонематическое восприятие, фонема, речь*

Fonematik eşitmə-bu incə sistemləşdirilmiş öz ana dilinin fonemlərini tanıma ğa və fərqləndirməyə imkan verən bir sistemləşdirilmiş eşitmədir.

Fonematik eşitmə fizioloji eşitmənin bir hissəsi olaraq eşidilmiş səsləri onların in sanın hafizəsində həkk olunmuş etalonları ilə müqayisəsinə yönəldir.

«Fonematik eşitmə» anlayışını fonematik qavrama anlayışından fərqləndirmək lazımdır.

Fonematik qavrayış - bu fonemlərin fərqləndirilməsi və sözün səs tərkibinin müəy yənləşdirilməsi bacarığıdır. Sözdə neçə heca, səs olduğunu, səslərin söz əvvəlində, ortasında və ya sonunda gəlməsi, sait və ya samit olması, kar, cinfilitili və s. məhz fonematik qavrama bu məsələləri həll edir.

Fonematik eşitmə və fonematik qavramanın düzgün inkişafı əsasında uşaqlarda nitqin inkişafı, məktəb təlimi dövründə oxu və yazıya yiyələnmə ilə həyata keçirilir. Aparılan müşahidələr göstərir ki, uşaqlarda çox zaman səs tələffüzünün pozul maları eşitmə qavraması ilə bağlı olur.Uşaqlarda fonematik qavrayışın diaqnostikasından öncə mütləq onun fiziki eşitmə vəziyyəti nəticələri ilə tanış olmaq lazımdır. Tədqiqatlar nəticəsində müəyyən olmuşdur ki. erkən inkişaf mərhələsində eşitmənin cüzi itirilməsi belə nitq səslərinin fərqləndirilməsini, və onların düzgün və dəqiq tələffüzünü çətinləşdirir.Normal eşitmə itiliyi fonematik qavrayışın formalaşması üçün ən başlıca şərtdir. Lakin normal fiziki eşitməsi olan uşaqlarda çox zaman fonemlərin incə differensasiya əlamətlərinin fərqləndirilmə sin də spesifik çətinliklərin olması və onların uşağın nitqinin səs tərəfinin inkişa fı gedişinə mənfi təsiri müşahidə olunur.Eşitmə ilə səslərin differensasiya çətinlik ləri ikincili olaraq səs tələffüzünün formalaşmasına mənfi təsir göstərə bilər.

Uşaq nitqində diffuz səslərin davamsız artikulyasiyasının işlənməsi, təcrid olunmuş halda düzgün, heca və sözlərdə isə əvəzlənmə, qarışdırılma, buraxılma kimi çatış mazlıqlar artikultasiya quruluşunda, onun funksiyasında özünü göstərən pozulma larla sıx bağlılığını və fonematik qavrayışın birincili formalaşmamasını göstərir. Fonematik qavrayışın diaqnostikasının çətinliyi onunla bağlıdır ki, çox zaman fonematik qavrayış çatışmazlığı qabarıq artikulyasiya qüsurları olan uşaqlarda fonem yaradıcı qnostik funksiyaların inkişafı qeyri münbit şəraitdə getməsi ilə meydana çıxır. Buna görə də mütləq artikulyasiya aparatının çatışmazlığı zamanı fonematik inkişafsızlığın ikincili meydana çıxma hallarını, fonematik qavrama çatışmazlığının nitqin səs tərəfinə yiyələnmə pozulmalarını yaradan səbəbdən fərq ləndirmək lazımdır.

Foematik qavrayışın vəziyyətini müəyyən etmək məqsədi ilə adətən səsi tanımaq fərqləndirmək və sadə frazalarda müqayisə etmək, müəyyən söz sırasından seç mək və yadda saxlamaq, səs sırasını, 2 -3 elementdən ibarət heca sıralarını (saitlərin dəyişməsi ilə ma - mo - mu , samitlərin dəyişməsi ilə va- ta- ka, pa -xa - pa və s. ) yadda saxlamaq üsullarından istifadə edilir.

Uşaqlarda səs tələffüzünün yoxlanmasından sonra mütləq onun səsləri eşitmə ilə necə qavraması və fərqləndirməsini müayinə etmək lazımdır. Bu xüsusi ilə artikulyasına görə oxşar,səslənməsinə görə yaxın olan səslərə aiddir.

Uşaqlarda fonematik qavramanın müayinəsinə əks etmə ilə müxalif samitlərdən ibarət və uşağın tələffüz edə bildiyi heca sırasının deyilməsi ilə başlanır.5-6 yaşlı uşaqlara eşitmək və tələffüz etmək üçün 2 heca, 6 yaşdan yuxarı uşaqlara isə 3 heca təklif edilir. Hər bir hal üçün hecaların sayı uşağın inkişaf səviyyəsindən asılı müəyyən edilir. Bu hecalara daha çox təhrif edilən və ya tələffüzündə çətinliklər olan samitlər daxil edilir. Uşaqlarda fonematik qavranmanın müayinəsində əsasən samitlərin növbələşməsi gələn düz hecalardan istifadə edilir və hər dəfə heca sırası dəyişdirilir.

Müayinə prosesində uşaq və loqoped üz-üzə oturur və loqoped ağzını ekranla bağlayır. Loqoped uşağa hecanı bir qədər ləng şəkildə ,lakin dəqiq düzgün, orta hündürlükdə səslə tələffüz edir və uşağın həmin heca sırasını müvafiq düzgün və dəqiq nümunəyə əsasən təkrar etməsini tapşırır.

Müayinə zamanı fitli və fışıltılı səs qrupunun bütün korrelyasiya olunan fonemlərin ( sa - şa, za -ja, sa - za və s.) kar və cingilitili (da - ta, pa -ba, ka -ga və s. ), sonor ( ra -la, ri - li və s.) yumşaq və sərt (sa - sya,la -lya) eşitmə ilə fərqlən dirilməsi yoxlanılır. Bu məqsədlə loqoped uşağa müxalifətdə olan müxtəlif

heca ları onun ardınca tələffüz etməyi tapşırır. Məsələn, sa - şa, şa -sa, aş - aş, sa - ja, ra -la və s. Əgər uşaq bəzi səsləri düzgün tələffüz etmirsə o zaman onların fərqlən dirilmə bacarığı başqa bir üsulla yoxlanılır, uşağa verilmiş hecanı eşitdikdə hər hansı bir hərəkəti etmək təklif edilir. Məsələn əgər sa -za hecaları arasında şa heca sını eşidirsə o əlini qaldırır.Bundan əlavə loqoped uşağa kəsmə əlifbadan istifadə edərək eşitdiyi hecanı yığmağı, yaxud yazmağı tapşıra bilər.

**Ədəbiyyat:**

1. T.Ağayeva, S.Əliyeva Loqopediyanın nəzəri -praktik məsələləri .Bakı., 1999.
2. N.T.Hüseynova T.H.Ağayeva Lopediya Bakı., 2018.
3.Диагностика нарушений речи у детей и организация логопедической рабо ты в условиях дошкольного образовательного учреждения: Сб. методи ческих рекомендаций. – ДЕТСТВО-ПРЕСС, 2002
5. Парамонова Л.Г. Логопедия для всех. - СПБ: Питер, 2004.

**Examination of Phonemic Perception in Mechanical Dyslalia**
**Summary**

The basic concept of phonemic perception is the phonemic process. Phonemic - is the ability of a person to analyze and synthesize speech sounds, that is, hearing provides the perception of the phonemes of a given language. Phonemic hearing means that hearing by means of which the semantic perception of a word as a set of phonemes is carried out and control over it. Phonemic perception performs the operations of distinguishing and recognizing the phonemes constituting the sound envelope of a word.

With mechanical dyslalia, there are violations of the sound-speech side of speech. As a result, a violation of phonemic perception can be observed. Phonemic perception requires certain research methods. Namely, a violation of the phonemic perception of hissing and whistling sounds, sonorous sounds, etc. Given these disorders, the diagnosis of dyslalia has its own distinctive feature, i.e. phonetic violation goes phonetic-phonemic violation (FFI).

**Обследование фонематического восприятия при механической дислалии**
**Резюме**

Основное понятие фонематического восприятия – это фонематический процесс. Фонематическое – это способность человека к анализу и синтезу речевых звуков, то есть слух обеспечивающий восприятие фонем данного языка. Фонематический слух, означает, что слух, посредством которого осуществляется смысловое восприятие слова как комплекса фонем и контроль над ним. Фонематическое восприятие осуществляет операции различения и узнавания фонем составляющих звуковое оболочку слова.

При механической дислалии происходит нарушения звукопроизносительной стороны речи. В результате, можно наблюдать нарушение фонематического восприятия. Фонематическое восприятие требует определенных методов исследования. А именно, нарушение фонематического восприятия шипящих и свистящих звуков, сонорных звуков и т.д. Учитывая эти нарушения, диагноз при дислалии имеет свою отличительную особенность, т.е. фонетическое нарушения переходит фонетико-фонематическое нарушение (ФФН).

**Rəyçi: dos.N.T Hüseynova**

**Avcı Sümeyra**
Azərbaycan Dövlət Pedaqoji Universiteti

## RİNOLALİYALI UŞAQLARIN ERKƏN DİAQNOSTİKASI

***Açar sözlər:*** *dodaq və damaq yarıqları, rinolaliya, loqopediya, diaqnostika, nitq*
***Key words:*** *cleft lip and palate, rhinolalia, speech therapy, diagnosis, speech*
***Ключевые слова:*** *расщелины губ и нёба, ринолалия, логопедия, диагностика, речь*

Dodaq və damaq yarıqları ilə şərtlənmiş açıq rinolaliya loqopediya, psixologiya və tibb elminin bir çox sahələrinin tədqiqat obyektidir. Bu patologiya ağız və burun boşluğunun təcridini istisna edib, uşağın anadan olduğu vaxtdan psixo-fiziki inkişafını ağırlaşdıran funksional pozulmaların yaranmasına gətirib çıxarır. Açıq rinolaliyanın korreksiyası cərrah, ortodont, loqoped və psixoloq - pedaqoq kimi mütəxəs sislərin sistemli və ardıcıl kompleks təsirini nəzərdə tutur.

Aparılan tədqiqatlar göstərir ki, dodaq və damaq yarıqlarının meydana çıxması hamiləliyin 2-3 ayında nitq aparatının periferik hissəsinin embrion mərhələdə inkişafdan qalması səbəbindən baş verir. Rüşeymin inkişafında belə ağır pozulmanın mənşəyi toksoplazmoz, ananın hamiləlik dövründə düzgün qidalanmaması və psixi zədələnmələr hesab edilir.

Qeyd etmək vacibdir ki, yarıqlar başdan-başa, tam və ya natamam, ikitərəfli və ya birtərəfli sağ və ya sol tərəfli olurlar. Başdan-başa yarıqlar üst dodaqdan başlayaraq üst çənə, yumşaq və sərt damaq boyunca dilçəyə qədər ola bilir. Bəzən dilçəyin paralanması da müşahidə edilir.

Açıq rinolaliya zamanı bəzən selikli qişa ilə örtülmüş sərt damağın sümük əsasında da müəyyən qüsurların – submukoz yarıqlarının olması da müşahidə edilir. Bu yarıqlar sərt damağın arxa kənarının yüngülcə basılması və "ç" səsinin hündürdən kəsik-kəsik tələffüzü zamanı yarıq olan yerin üçbucaq şəklində dartılması zamanı aşkara çıxarılır.

Yumşaq damağın bütün yarıqları eyni zamanda sərt damağın deformasiyasını şərtləndirir. Üst çənə və sərt damaq yarıqları sonralar uşağın normal dişlərinin formalaşmasına əngəl törədir. Damağın yarıqları periferik nitq aparatının tələffüz və səs şöbələrində heç bir anatomik pozulmalar yaratmadığı halda, artikulyasiya şöbəsində kobud dəyişmələrə səbəb olur. Uşaqlarda açıq rinolaliyanın aradan qaldırılması üçün müxtəlif üsullar tətbiq edilir və onların sırasına aşağıdakılar daxildir:

a) tibbi üsullar, anadangəlmə artikulyasiya aparatı deformasiyalarının cərrahi korreksiyası (cərrah-stomatoloqun müdaxiləsi ilə xeyloplastika, uranoplastika, faringoplastika, adenotomiya işləri);

b) psixoterapevtik üsullar;

c) loqopedik müdaxilə;

Açıq rinolaliylı uşaqların erkən diaqnostikası çox vacib məsələ olub bir sıra mütəxəssislər: həkim, loqoped, pedaqoq və başqaları tərəfindən kompleks şəkildə aparılır. Açıq rinolaliyanın tibbi müayinəsi iki mərhələdə keçirilir: birinci mərhələdə somatik, nevroloji, psixiatrik və digər müayinələr uşaq haqqında məlumatları daha da zənginləşdirir; ikinci mərhələdə uşağın inkişafındakı özünəməxsus çatışmazlıqlar təhlil edilir və son nəticə kimi diaqnoz qoyulur. Diaqnozun qoyulması zamanı eyni zamanda əsas qüsur və qüsurun təsiri ilə yaranmış digər pozulmalar aşkarlanır və nitq pozulmalarının ümumi mənzərəsi üzə çıxır.

Rinolaliyalı uşağın müayinəsi, həmçinin onun psixi inkişafının xüsusiyyətlərini də aşkar etməli və şəxsiyyətin inkişafının qanunauyğunluqlarını üzə çıxarmalıdır. Uşağın fərdi və nitq xüsusiyyətləri ilə yanaşı,həmçinin beyinin ən yüksək qabıq funksiyalarının pozulmasının simptomatikasının ətraflı öyrənilməsi düzgün diaqnoz qoymağa, uşağın inkişafının potensial imkanlarını və onun qüsurunun korreksiya yollarını müəyyən etməyə imkan verir. Açıq rinolaliyanın müalicə metodikasının, qüsurun korreksiyası yollarının seçimi nitq pozulmalarını doğuran səbəblər və anomaliyanın növündən asılı olaraq dəyişir.

Bir çox tədqiqatçılar Q.V.Çirkina, T.V.Volosoveç və başqaları uşaqların anatomik qüsurlarının kompleks öyrənilməsinin vacibliyini göstəmişlər. Nitq qüsurunun korreksiya işinin düzgün təşkili və qüsurun spesifik xüsusiyyətlərini tam anlamaq üçün həmin uşağın geniş, hərtərəfli, kompleks şəkildə tibbi psixo-pedaqoji müayinəsi aparılmalıdır.

Çatışmazlığın düzgün diaqnozunu qoymaq və qüsurun strukturunu müəyyənləşdirmək, yalnız psixoloq, loqoped, stomatoloq, nevropatoloq, psixiatr, ortodont, çənə-üz cərrahları, pediatrlar və digər mütəxəssislərin sıx əməkdaşlığı nəticəsində tam şəkildə əldə oluna bilər.

Rinolaliyalı uşaqların diaqnostikası çox erkən yaşlarda başlanarsa, onun müalicəsi və yara dığı digər çatışmazlıqların korreksiya və kompensasiyası da bir o qədər uğurlu olar. Rinolaliyanın diaqnostikasının

səmərəli olması üçün uşaqların bir sıra sahə mütəxəssisləri tərəfindən müayinə edilməsi vacibdir. Bu mütəxəssislərə aşağıdakılar daxildir:

- otolorinqoloq;
- defektoloq;
- loqoped;
- nevropatoloq;
- ortodont;
- fonotriya üzrə mütəxəssis;
- pediatr və başqaları.

Sahə mütəxəssislərinin müayinəsi xəstəliyin etiologiyasını aşkarlamağa patoloji dəyişmələrin xarakterini və onun bütün simptomlarının qabarıqlığını dəqiq xarakterizə etməyə imkan verir. Uşaqlarda rinolaliyanın diaqnostikasında instrumental metodlardan geniş istifadə edilir. Bunlara aşağıdakılar daxildir:

- rinoskopiya;
- burun -udlağın rengenoqrafiyası;
- farinqoskopiya
- kompyuter tomoqrafiyası;
- elektro-maqnit tomoqrafiya;
- elektromioqrafiya;

Bu metodikalar patoloji dəyişikliklərin xarakterini və hər bir pasiyentdə onun qabarıqlığını dəqiqləşdirməyə imkan verir. Əlbəttə, rinolaliyanın diaqnostikasında loqopedik müayinə, bu məqsədlə onun istifadə etdiyi proqressiv metodlar aşağıdakı parametrləri dəyərləndirməyə kömək edir:

- artikulyasiya aparatının quruluşu;
- artikulyasiya aparatının hərəkətliliyi;
- səsin pozulması;
- tənəffüsün fizioloji, fonasiya parametrləri və s.

Açıq rinolaliyanın diaqnostikasında Qutsmanın metodikasından geniş istifadə edilir. Bu metodika pasiyentin [a] və [i] səslərini növbə ilə tələffüzünə, həkimin isə bu zaman burun yollarını növbə ilə açıb-bağlamasına əsaslanır. Patoloji dəyişmələr zamanı çox aşkar şəkildə burun pərələrinin titrəyişi hiss edilir. Burun yollarının sıxılması zamanı isə [a] və [i] səsləri bir qədər karlaşmış tələffüz olunur. Beləliklə də rinolaliyanın açıq forması dəqiq diaqnozlaşdırılır.

## Ədəbiyyat:

1. T.Ağayeva, S.Əliyeva Loqopediyanın nəzəri -praktik məsələləri .Bakı., 1999.
2. N.T.Hüseynova T.H.Ağayeva Lopediya Bakı., 2018.
3.И.И.Урмакова Коррекция речи при ринолалии у детей и подростков М.,1998
4. А.Г.Ипполитова Открытая ринолалия М., 1983.

## Early diagnosis of open rhinololia

**Summary**

Open rhinolalia, caused by congenital cleft lip and palate, is the subject of studies for speech therapy, psychology and a variety of medical sciences. This pathology leads to the absence of isolation of the oral and nasal cavities, which entails the appearance of functional disorders that complicate the psychophysical development of the child from birth. Correctional work involves a systematic, consistent and comprehensive impact of such specialists as surgeons, orthodontists, speech therapists and educational psychologists.

## Ранняя диагностика детей с ринолалией

**Резюме**

Открытая ринолалия, обусловленная врождёнными расщелинами губы и нёба, является предметом изучения логопедии, психологии и целого ряда медицинских наук. Данная патология приводит к отсутствию изоляции ротовой и носовой полостей, что влечет за собой появление функциональных нарушений, осложняющих психофизическое развитие ребёнка с рождения. Коррекционная работа предполагает системное, последовательное и комплексное воздействие таких специалистов, как хирургов, ортодонтов, логопедов и педагогов-психологов.

**Rəyçi: dos.N.T Hüseynova**

**Abdullah Erdəm**
Azərbaycan Dövlət Pedaqoji Universiteti

# AĞIR İNTELLEKTUAL ÇATIŞMAZLIĞI OLAN UŞAQLARIN TƏLİM-TƏRBİYƏ XÜSUSİYYƏTLƏRİ

***Açar sözlər***: *intellektual çatışmazlıq, idrak fəaliyyəti, təlim-tərbiyə, korreksiya*
***Key words:*** *intellectual inadequacy, cognitive activity, training, education correction*
***Ключевые слова:*** *интеллектуальная недостаточность, познавательная деятельность, обучение-воспитание, коррекция*

Ənənəvi olaraq, intellektual çatışmazlıqlar baş beynin üzvü zədələnməsinin nəticəsi hesab olunur. Baş beynin fəaliyyətinin üzvü pozulmaları daha çox ağır əqli gerilikli uşaqlarda aşkar edilir. Yüngül və orta səviyyəli intellektual çatışmazlıqları olan uşaqlarda üzvü zədələnmələr çox nadir hallarda qeyd edilir. Bu o deməkdir ki, əqli geriliyin müxtəlif formalarının patogenezi birmənalı deyil, intellekt və baş beyin quruluşunun üzvü zədələnmələri arasındakı əlaqə hələ də tam açıqlanmamışdır.Əqli geriliyin aparıcı əlaməti ali psixi funksiyaların formalaşma pozulması kimi özünü göstərən idrak proseslərinin (duyğu, qavrayış, diqqət, hafizə, təfəkkür, təxəyyül, nitq) zəifliyi və ya deformasiyası, emosional-iradi sahə və motorikada kənara çıxmalar , bütövlükdə şəxsiyyətin formalaşmaması ilə ifadə olunmuş intellektual çatışmazlıqdır.

Ağır intellektual çatışmazlığı olan uşaqlarla aparılan korreksiya tərbiyə işinin məqsədi ətrafdakı sosial mühit şəraitində onların həyata uyğunlaşdırılmasıdır.

Qarşıya qoyulmuş məqsədə çatmaq üçün belə uşaqlarla işin təşkilində aşağıdakı vəzifələrin yerinə yetirilməsi nəzərdə tutulur:

1. Uşaqlarda bütün ali psixi funksiyaların və idrak fəaliyyətinin inkişafı təlim-tərbiyə və korreksiya prosesində həyata keçirilməsi. Bu işdə əsas diqqət uşaqların əqli inkişafına yönəldilir;
2. Düzgün davranışın formalaşdırılması;
3. Əmək təlimi və uşağın potensialına uyğun əmək hazırlığı;
4. Özünəxidmət vərdişlərinin formalaşması;
5. Məişətdə bələdləşmə və sosial adaptasiya.

Ağır intellektual çatışmazlığı olan uşaqlarla aparılan korreksiya işi üç mərhələdən ibarətdir:

1) 4 yaşdan 8 yaşa qədər olan mərhələ. Bu mərhələdə uşaqda sanitar -gigiyenik vərdişlərin formalaşması üzərində iş aparılır. Uşaqlar ev şəraitində adekvat davranışa yiyələnirlər. Bu zaman xüsusi diqqət uşaqda nitqin, motorikanın, idrak fəaliyyətinin inkişaf erdirilməsinə yönəldilir.

Əqli geriliyi olan uşaqların inkişafı ilk yaşam ilində normal uşaqlardan fərqlənir Oliqofren uşaqlarda qamət çox gec formalaşır, yəni onlar çox olaraq gec başını dik saxlamağa, imakləmə, oturma, durma və yeriməyə başlayırlar.

Adətən, bütün əqli gerilikli məktəbəqədər yaşlı uşaqların ətrafdakılara marağın yoxluğu və ya az olması, ümumi patoloji ətalətlilik müşahidə edilir. Sonralar onlarda böyüklərin əlində olan və ya asılmış oyuncaqlara maraq meydana çıxsa da oyuncaqlarla oyun zamanı normada balacalara xas olan yeni ünsiyyət forması - jestli ünsiyyət yaranmır.Bu isə əşyalarla ilkin fəaliyyətin inkişafında əl ilə tutma və əl manipulyasiyası ilə bağlı olan qavrayışın inkişafında özünü göstərir. Uşaqlarda nitqin inkişaf ehtimalı, əşyaları qavraması, böyüklərlə ünsiyyət, xüsusilə də nitqdən öncəki ünsiyyət zamanında inkişaf etmir. Artikulyasiya aparatı və fonematik eşitmənin inkişafsızlığı uşaqlarda qığıldamanın, həm də hecalamanın vaxtında yaranmamasına səbəb olur. Bu proseslər reflektor olub normada uşağın ilk yaşam aylarında meydana çıxır və ətraf mühitdən, böyüklərin təsirindən asılı olmadan, mərkəzi sinir sisteminin vəziyyəti ilə bilavasitə bağlı baş verir. Əqli geri olan uşaqlarda perseptiv fəaliyyət məktəbəqədər mərhələdə formalaşmağa başlayır. Uşaqlarda ətrafdakılara, oyuncaqlara maraq yarandıqca, onlar da əşyaların xüsusiyyətləri və onlara münasibət haqqında ən sadə təsəvvürlər formalaşmağa başlayır. Beş yaşından başlayaraq əqli geriliyi olan uşaqlar əşyaları rəng, forma və həcminə görə fərqləndirməyə başlayırlar. Uşaqlarda qavrayışın müəyyən dərəcədə inkişafı öz növbəsində əyani-əməli təfəkkürün inkişafına təsir göstərir. Lakin qeyd etmək lazımdır ki, normal inkişaf edən uşaqlarla müqayisədə əyani -əməli təfəkkürün yaşla bağlı əyani-obrazlı təfəkkürə keçidi təlimsiz mümkün deyil. Belə ki, məktəbəqədər yaş mərhələsinin sonunda faktiki olaraq, onlarda əyani- obrazlı məsələlərin həlli imkanı olmur. Əqli geriliyi olan məktəbəqədər yaşlı uşaqlarda sadə sözlü -məntiqi təfəkkür çox gec inkişaf edir və özünəməxsus keyfiyyətə malik olur. Məktəbəqədər yaşlı əqli gerilii uşaqlarda oyun fəaliyyəti yalnız onun müəyyən inkişaf səviyyəsində əşya fəaliyyəti əsasında yaranır. Lakin əqli geriliyi olan uşaqlarda məktəbəqədər yaş dövrünün

başlanğıcında faktiki olaraq əşya fəaliyyəti tam deyil, çox zaman yalnız manipulyasiya səviyyəsində olur.Əşyalara, oyuncaqlara maraq çox qısa müddətli, həm də xarici görüşlərinə marağın yaranması ilə bitir. Əqli geriliyi olan uşaqlarda beş yaşından sonra oyuncaqlarla oyun həqiqi oyun kimi yox, daha çox prosesual xarakter daşıyır. Xüsusi təşkil edilmiş təlim almadan uşaqlarda nitq funksiyaları inkişaf etmir. Əmək fəaliyyəti elementləri (ilk öncə özünəxidmət vərdişləri) əqli geriliyi olan uşaqlarda ətrafdakıların köməyi ilə formalaşmağa başlayır.

Beləliklə də, xüsusi məktəbəqədər təlim-tərbiyə işi aparılmadan əqli geriliyi olan uşaqlarda nitq, təfəkkür, fəaliyyət və digər psixi funksiyaların inkişafı bəzən mümkünsüz, bəzən isə qismən ola bilir .

2) 8 yaşdan 12 yaşa qədərki mərhələ. Bu mərhələdə də özünəxidmət və şəxsi gigiyena vərdişlərinin möhkəmləndirilməsi davam etdirilir. Təsərrüfat - məişət əməyinin təlimi üzrə iş aparılır, əvvəlki kimi nitqin inkişafına böyük diqqət yetirilir və uşaqlara sadə savad, hesab vərdişləri aşılanır.

3) 16 yaşdan 18 yaşa qədərki mərhələ. Bu mərhələdə korreksiya işinin əsas vəzifəsi uşaqların sosial adaptasiyasıdır. Ağır intellektual çatışmazlığı olan uşaqların təlimi öz fərdiliyi ilə fərqlənməlidir. Belə uşaqların təlim-tərbiyəsinin əsas vəzifəsi onların müstəqil həyata hazırlığı, ətraf mühitdə bələdləşmə bacarığına, insanlarla ünsiyyətə girmək bacarığına, ən sadə əmək vərdişlərinə yiyələnməsidir.

**İstifadə edilmiş ədəbiyyatın siyahısı :**

1. N.Hüseynova, L.Rüstəmova «Xüsusi pedaqogika» Bakı. 2004
2.N.Hüseynova, S.Aslanova «Xüsusi psixologiya».Bakı 2018
3.Пирогова Г. Н. Логопедическая работа с детьми с умеренной и тяжелой умственной отсталостью в период начального школьного обучения // Специальное образование. 2008. №9 С.57 - 59.

## Features of training and education of children with severe intellectual impairment

**Summary**

Organic disorders of brain activity are found mainly in deeply mentally retarded children. In children with moderate and mild intellectual deficiency, organic disorders are extremely rare. This means that the pathogenesis of various forms of mental retardation is ambiguous, the relationship between intelligence and organic damage to brain structures is not disclosed.

The leading sign of mental retardation is intellectual failure, manifested in the violation of the formation of higher mental functions, which is expressed in the deformation and weakness of cognitive thinking processes (sensation, perception, memory, thinking, imagination, attention, and speech), deviations in emotional-volitional and motor sphere, in the formation of the individual as a whole.

## Особенности обучения и воспитания детей с тяжелой интеллектуальной недостаточностью

**Резюме**

Органические нарушения деятельности мозга обнаруживаются преимущественно у глубоко умственно отсталых детей. У детей со средней и легкой интеллектуальной недостаточностью органические нарушения выявляются крайне редко. Это означает, что патогенез различных форм умственной отсталости неоднозначен, не раскрыта зависимость между интеллектом и органическим поражением структур мозга.

Ведущим признаком умственной отсталости является интеллектуальная недостаточность, проявляющаяся в нарушении формирования высших психических функций, что выражается в деформации и слабости познавательных мыслительных процессов (ощущение, восприятие, память, мышление, воображение, внимание, речь), в отклонениях в эмоционально-волевой и в моторной сфере, в становлении личности в целом.

**Rəyçi: dos.N.T Hüseynova**

**Eyvazova Yasəmən Çingiz qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
e.yasmin@mail.ru

# ŞAGİRDLƏRİN HƏYAT TƏRZİNİN FORMALAŞMASINDA KOLLEKTİVİN ROLU

***Açar sözlər:*** *təhsil, kollektiv, adaptasiya*
***Key words:*** *education,, collective, adaptation*
***Ключевые слова*****:** *образование, коллективно, адаптированный*

Şagirdlərin bir-birilə qarşılıqlı münasibətlərinin inkişafı bir çox amillərdən, o cümlədən ailə tərbiyəsindən ,böyüklərlə münasibətindən, fərdi xüsusiyyətindən ,təlim fəaliyyətindən və s. amillərdən asılıdır. Bütün bu qeyd etdiyimiz amilər içərisində təlim fəaliyyəti xüsusi yer tutur. Bu amillər də öz növbəsində şagirdlərin kollektivdəki rolunu müəyyənləşdirir. Psixoloqlar məktəb yaşı dövründə fəaliyyət və davranış motivlərini 2 qrupa ayırırlar:

1.Təlim fəaliyyəti ilə bağlı olan idrak motivləri

2.Sosial motivlər

İdrak motivləri bildiyimiz kimi yeni biliklərin qazanılması ilə bağlıdır və əksər məktəblilər üçün xarakterikdir. Bu isə ilk növbədə, kollektivə adaptasiya olunmaq üçün kollektiv həyatı ilə bağlı yeni biliklərin mənimsənilməsinən irəli gəlir. İdrak motivlərinin formalaşmasında daha çox müəllimlər xüsusi əhəmiyyət kəsb edirlər. Müəllimlər şagirdlır tərəfindən hələ tam qavranılmayan idrak motivlərini möhkəmləndirmədikdə şagirdin bu sahəyə olan marağı azalır və tədricən itir və beləliklə şagirdlər gərginlik keçirirlər.

Sosial motivlər isə şagirdlərin kollektivdə mövqe tutmaq, təriflənmək, yaşıdları və böyükləri arasında nüfuz sahibi olması mahiyyətidir. Yaxşı bir şagird olmaq şagirdin məktəbə və dərsə olan marağını artırır və nəticədə şagird çalışır ki, daima dərslətinə hazır olsun, müəllim onu yüksək qiymətləndirsin və tərifləsin.

Müəllimlər şagirdlərin sosial təlim motivlərini qabartmaq üçün yarışlar keçirirlər və bu yarışların başlıqları bu ad altında olur: “Kim tez tapşırığı yerinə yetirər?”, “Kim tapşırığı tez həll edər?” və s. Bir çox hallarda əlaçı şagirdlərdə birinci olmaq motivi dominantlıq təşkil edir bu isə özünü digər şagirdlərlə münasibətdə göstərir. Belə şagirdlər təlimdə müvəffəqiyyət qazanmalarına baxmayaraq yoldaşları ilə problemlər yaşayırlar.

İdrak motivləri ilə sosial motivlər qarşılıqlı vəhdət şəklində olur və biri digərinə təsir göstərir.

Şagirdlərin kollektivdəki mövqeyi onların davranışından və şəxsi keyfiyyətlərindən çox asılıdır. Adətən kiçikyaşlı məktəblilər parta yoldaşını seçərkən eqoist motivlərindən çıxış etmirlər. Onlar yaxşı oxuyan şagirdlərlə oturmaq istəyirlər.

Şagirdlər adətən kollektiv işə müsbət münasibət bəsləyirlər. Lakin kiçikyaşlı şagirdlərdə kollektiv qarşısında olan məsuliyyət hissləri tam formalaşmayıb. Şagirdlərin təlim fəaliyyətinə əyləncə elementlərini daxil etdikdə daha müsbət və səmərəli nəticə verir. Böyükyaşlı məktəblilərdən fərqli olaraq kiçikyaşlı məktəblilər özlərinə dost və ya yoldaş seçərkən, asudə vaxtlarını keçirərkən valideynlərinin tövsiyələrinə qulaq asmağa çalışırlar. Onlar öz sevinc və kədərlərini valideynləri ilə bölüşür, onların təriflərinə ehtiyac duyurlar.

Kiçikyaşlı şagirdlərin qarşılıqlı münasibətlərində onların təlim fəaliyyətində aldıqları qiymət, xüsusilədə müəllimin şagirdə söylədikləri tariflər xüsusi əhəmiyyət kəsb edir. Pis oxuyan və ya pis qiymət alan şagirdlərin yoldaşları yanında nüfuzu aşağı olur. Psixoloqlar qarşılıqlı münasibətləri psixi inkişafla əlaqələndirir və hər bir yaş üçün onların inkişaf dinamikasını vacib sayırlar.

Şagirdlərin kollektivə adaptasiyası , həmçinin qarşılıqlı münasibətlərin qurulmasında bir neçə amil təsir göstərir. İlk növbədə məktəbəqədər yaş dövründə uşağın məktəbə psixoloji hazırlığı ilk növbədə nəzərə alınmalıdır. Uşaq məktəbə daxil olana kimi 3 mərhələdən keçir:

1.Ümumi insane dəyərləri mənimsəmək

2. Qarşılıqlı münasibətləri dərk etmək

3.Ətraf aləmi emosional şəkildə öyrənmək

Şagird məktəbə daxil olduğu andan onun yerinə yetirməli olduğu bir sıra çətinliklər meydana gəlir. Bu çətinliklər şagirdin imkanlarından artıq olduqda şagirddə stress, həyəcanlanma baş verir. Bu çətinliklər şagirdlərin məktəb həyatına uyğunlaşmasını çətinləşdirir və qarşılıqlı münasibətlərinin mənfi hallara səbəb olur. Şagirdlərin ilk növbədə təlim fəaliyyətinin müəyyən müddət oyun xarakteri daşıması şagirdlərin fəaliyyət formalarının, həyat tərzlərinin tədricən dəyişməsinə və məktəb həyatına adaptasiya olunmasına

şərait yaradır.

Şagirdlərin kollektivə adaptasiya olunmasında müəllimlər birbaşa və dolayısı ilə rol oynayır. Kiçikyaşlı məktəblilərin kollektivə alışması mürəkkəb prosesdir.Burada onların ailə tərbiyəsi, məktəbə psixoloji cəhətdən necə hazır olması, həmçinin fərdi xüsusiyyətləri də mühüm rol oynayır. Şagirdlər birgə fəaliyyət prosesində qarşılıqlı münasibətlərində dəyişikliklər baş verir. Bu zaman şagirdlərin bir-birilə qarşılıqlı münasibətləri aktivləşir və müəllim-şagird münasibətləri arxa plana keçir. Həmçinin şagirdlərin kollektiv şəkildə birgə fəaliyyəti müıllimi təşkilati və nəzarət işlərindən qismən də olsa azad edir. Bu da öz növbəsində müəllimə imkan verir ki, şagirdlərin fəaliyyətini, fərdi xüsusiyyətlərini, davranışlarını və qarşılıqlı münasibətlərini izləyə bilsin.

Təlim prosesində şagirdlərin müstəqil fəaliyyət göstərmələri təlim fəaliyyətinin səmərələliyini də artırır. Təlimin qrup formasında təşkil olunması şagirdlərin özlərinə və yoldaşlarına olan inamını da artırır. Kollktiv şəkildə şagirdlərin birgə fəaliyyəti zamanı onlar diskussiya aparır, mübahisə edir, müqayisə edir və problemlərinə müstəqil şəkildə həll axtarmağa çalışırlar. Bu proses daha çox təlimdə geri qalmış şagirdlərə daha səmərəli təsir göstərir. Lakin ənənəvi təlim formasında şagirdlər passiv iştirak edir və müəllim onlara sualla müraciət etdikdə və ya lövhəyə çağırdıqda narahatlıq keçirirlər.

Kollektiv şəkildə şagirdlərin birgə fəaliyyəti zamanı kifayət qədər fəallıq və müstəqillik göstərirlər. Bu zaman şagirdlərin müəllimdən asılılığı xeyli azalır. Həmçinin şagirdlər kollketiv fəaliyyətin qaydalarını mənimsəyir, eyni zamanda kollektiv fəaliyyət şagirdlərin psixi inkişafını daha da gücləndirir.

**Ədəbiyyat:**

1. Oqtay Abbasov.”Təhsilin idarə olunması”.Bakı 2016
2. Rüfət Hüseynzadə.”Pedoqogika” Bakı 2009.
3. Aslanov A.S ”Şagirdlərin ictimai fəallıq tərbiyəsi”

**The role of the collective in shaping students lifestyle**
**Summary**

The scientific article deals with the joint activities and collective work of younger pupils. The joint activities of the pupils further increase their interest in the training. The use of small-sized pupils in the collective is a complicated process.

Here's how their family education, how psychologically they are prepared for the school, and their personal characteristics play an important role. Teachers should use joint activities to increase students' interest in learning. If so, the training will yield a more effective outcome

**Роль коллектива в формировании студенческого образа жизни**
**Резюме**

Научная статья посвящена совместной деятельности и коллективной работе младших школьников. Совместная деятельность учеников еще больше повышает их интерес к обучению. Вот как важную роль играет их семейное воспитание, психологическая подготовка к школе и их личные качества Учителя должны использовать совместные действия, чтобы повысить интерес учащихся к обучению. Если это так, обучение даст более эффективный результат.

**Rəyçi: dos.M.B.Həsənov**

**Eyvazova Yasəmən Çingiz qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
e.yasmin@mail.ru

# KİÇİK YAŞLI ŞAGİRDLƏRİN HƏYAT TƏRZİNİ ŞƏRTLƏNDİRƏN AMİLLƏR

***Açar sözlər:*** *təhsil, təlim, prinsip*
***Key words:*** *education,, training, principle.*
***Ключевые слова:*** *образование, обучение, принцип.*

Kiçik yaşlı məktəblilərin inkişaf tarixi çox ziddiyətli və mürəkkəb prosesdir. Bu dövrdə insan çox şeyi anlamalıdır onun həyatının hər günündən istifadə edilməlidir. Bu yaşın ən xarakterik vəzifəsi insan münasibətlərini anlamaq, ətraf-aləmi dərk etməkdən ibarətdir.Bu yaş dövründə bütün mənəvi və əxlaqi keyfiyyətlər intensiv şəkildə inkişaf edir və onların həyatları boyunca dəyişilməz olaraq qalır.

Kiçik yaşlı məktəblilərin mənəvi həyatlarının formalaşmasında ,mənəvi adətlərin ən vacib komponentləri olan- xeyirxahlılıq,ədalətlilik,yaxşılıq,məsuliyyət, düzlük və s. keyfiyyət və hisslərinin formalaşmasında və inkişafında dərsdən sonra onlarla birgə təşkil olunan tədbirlər xüsusi əhəmiyyətə malikdir. Sinifdən xaric işlər müzakirə görüş ekskursiya uşaq filmlərinə və tamaşalarına baxış və s. xüsusi yer tutur. Sinifdən xaric tədbirlərin keçirilməsi zamanı kiçikyaşlı məktəblilərdə şəxsi təcrübə yaranırdı. Şəxsi təcrübənin yaranması kiçikyaşlı məktəblilərdə mənəvi inamın formalaşmasına böyük köməklik göstərirdi.

Prof Y.Ş.Kərimov yazır: "Kiçikyaşlı məktəblilərin tərbiyəsi üzrə işi bəzi müəllimlər çox asan bir proseskimi qiymətləndirirlər. Həmin müəllimlər uşaqlarda hələ xarakterin möhkəmlənməsi onların sözəbaxan, ağıllı olmalarına istinad edərək bu qənaətə gəlmişlər. Şübhəsiz, onlar səhv edir şəxsiyyətin tərbiyəsinin ilkin xarakter xüsusiyyətlərinin məhz bu dövrdə formalaşdığını yaddan çıxarırlar"

Sinifdənxaric iş zamanı şagirdlərlə iş fərdi aparılmalıdır. Davranış qaydalarını formal şəkildə şagirdlərə öyrətmək yüksək nəticə vermir yalnız göstəriş əsasında, hərəkətlərin zəruriliyini hiss etdirərək yüksək şəxsiyyət yetişdirmək olar. Şagirdlər formal olaraq bilirlər ki yalan danışmaq pis bir hal və vərdişdir. Ancaq onlara " nə üçün pis bir hal və vərdişdir? " sualını versək onlar suala belə cavab verirlər: "Buna görə insanı cəzalandıra bilərlər". Müəllim onlara humanistlik hissinin qorxudan irəli gəlməməsini və ya məcburiyyətə əsasən yaranmamasını izah etməlidir. Sinif rəhbəri bütün bunları sadəcə xatırlatmamalı həm də konkret nümunələrə müraciət etməlidir. Belə olan halda onlar şagirdərə düşünməyi və dərk etməyi öyrədir və beləliklə şagirdlərdə şüuru inkişaf elətdirirlər.

Kiçikyaşlı məktəblilərin bir şəxsiyyət kimi formalaşmasına dərsdənkənar işlər də təsir edir. Dərsdənkənar işlərdə daha çox şagirdlərin əmək tərbiyəsi məsələsi ön plana çəkilir. Bunun üçün bu xüsusiyyətlər nəzərə alınmalıdır.

1. Tərbiyə işi üçün şəraitin yaradılması
2.Tərbiyə işinin planlaşdırılması
3. Tərbiyə işinin həyatla əlaqələndirilməsi.
4.Tərbiyə işinin məqsədyönlülüyü
5.Tərbiyədə sözlə əməlin vəhdət təşkil etməsi.
6.Tələblərdə vahidlik.
7. Şagirdlərin yaş, fərdi və cinsi və s. xüsusiyyətlərinin nəzərə alınması.

Bu proses zaamanı dərsdənkənar işin müxtəlif formalarından istifadə olunur. Kiçikyaşlı məktəblilərin oyunlara maraq və həvəs hisslərinin olduğunu nəzərə alaraq, onların maraq və həvəslərinə uyğun olaraq tədbirlər keçirilməlidir. Bu proses həyata keçirilərkən ilk öncə müəllim hansı nəticələr əldə edəcəyini müəyyənləşdirməlidir . Oyunun niyyəti məktəblilərdə maraq yaratmaqdan ibarətdir. Bu niyyətlər şagird aləmi ilə əlaqədar olmalı, gündəlik həyatda gördükləri və rast gldikləri hadisələr olmalıdır. Müəllim şagirdlərə oyunun qaydalarını izah etməli, onlara oyunda maraq və həvəs oyatmalıdır. Oyun prosesi zamanı müəllim şagirdlərin səhvsiz hərəkətlərini təmin etməlidir.

Dərsdənkənar tədbirlər zamanı şagirdlərlə təşkil olunmuş didaktik oyunlar şagirdlərdə təşkilatçılıq qabilliyyətlərinin inkişafına təkan verir.

Müəllimlə valideyninin fikirlərinin üst-üstə düşməsi şagirddə əməyə qarşı münasibəti yaxşı mənada dəyişir. Bu əməksevərlik tərbiyəsində olduqca mühümdür. Kiçikyaşlı məktəblilər əmək prosesində digər şagirdlərlə fəaliyyətdə olur, onlar bu fəaliyyətdə özlərinə və digərlərinə qiymət verməyə və hörmət etməyə başlayırlar. Kiçikyaşlı məktəblilərin yüksək əxlaqi sifətləri bu zaman, yəni dərsdənkənar vaxtlarda

təşkil edilmiş əmək tərbiyəsi zamanı özünü göstərir. Kiçikyaşlı məktəblilər bu proses zamanı yüksək nəticə etdikləri zaman qiymətləmdirilirlər. Şagird müvəffəqiyyət qazanadığı zaman o lider səviyyəsinə yüksəlir və o şagird digər şagirdlərə nümunə olaraq göstərilir.

Bəzən şagirdlərdə hansı bacarıq və vərdişlərin hansısa keyfiyyətlərin olmasına əhəmiyyət verilmir. Bu zaman isə şagirdlər bacarıqlılara və bacarıqsızlara bölünməli olur. Əməyə münasibət tərbiyəsi ilə yanaşı, eyni zamanda əməklə bağlı bacarıq və vərdişlərin nəzərə alınması olduqca mühümdür.

Qabiliyyətlər şagirdlərin psixi həyatının mühüm hissəsini təşkil edir. Qabiliyyətlər kiçik yaşlardan formalaşmağa başlayır. Kiçikyaşlı məktəblilərin qabiliyyətlərə yiyələnməsi onlar üçün zəruridirş Belə ki kiçikyaşlı məktəblilər onlar üçün zəruri olan bilik və bacarıqlara yiyələnməyiblərsə hər hansı bir qabiliyyətləri inkişaf edə bilməz. Bu səbəbdən kiçikyaşlı məktəblilərdə qabiliyyətlərin formalaşıb inkişaf etməsi zəruridir. Kiçikyaşlı məktəblilərdə öz qabiliyyətlərini və nailiyyətlərini qiymətləndirmə bacarığını formalaşdırmaq lazımdır. Bu proses onlarda tənqidi təfəkkürlərinin inkişaf etdirilməsinə kömək edir. Şagirdlər inkişaf etdikcə onların tənqidi təfəkkürü də formalaşıb inkişaf edir və şagirdlərdə yeni keyfiyyətlər yaranır.

Kiçikyaşlı məktəblilərdə birinci sinifdən başlayaraq onlarda ətraf aləm haqqında müəyyən biliklərə yiyələnirlər. Artıq onlarda diqqət,yadasalma,müşahidəçilik kimi və ən əsası da nitq inkişaf edir.

Əməyə düzgün yanaşmaqla bağlı sistemli işin əsası ibtidai siniflərdə qoyulur. Kiçik yaşlı məktəblilər əmək prosesində digər uşaqlarla birgə fəaliyyətdə olurlar. Kiçikyaşlı məktəblilərin arasında tənbəl calışmaq istəməyən uşaqlara da rast gəlirik. Onlar öz valideynlərinin mövqeyindən istifadə edərək asan yaşamağı öyrənmişlər. Yuxarı sinif şagirdərindən fərqli olaraq kiçikyaşlı məktəblilər özlərinə fayda gətirən işlərə daha həvəslə və ürəklə qoşulurlar. Şagirdlərin özlərinə fayda gətirən işlərə qoşulması onlarda ilkin əmək bacarıqlarının yaranmasına səbəb olur. Onlar nisbətən də olsa kiçik kollektivlə işləməyi öyrənir öz işlərini yoldaşlarının fəaliyyəti ilə əlaqələndirməyi öyrənir.

**Ədəbiyyat:**

1. Oqtay Abbasov.”Təhsilin idarə olunması”.Bakı 2016
2. Rüfət Hüseynzadə.”Pedoqogika” Bakı 2009.
3. Aslanov A.S ”Şagirdlərin ictimai fəallıq tərbiyəsi”

**Factors conducive to the lifestyle of younger students**

**Summary**

The scientific article deals with the management of lifestyles of younger pupils. Given the peculiarities of the pupils, it is about their approach and personal qualities. Starting from the first grade, little-grown schoolchildren have some knowledge of the surrounding world. The attitude to labor in pupils is born of younger ones. This is primarily placed in primary classes. Successful students' leisure time can be used to reveal some of their abilities and skills

**Факторы, способствующие образу жизни младших школьников**

**Резюме**

Научная статья посвящена ведению образа жизни младших школьников. Учитывая возрастные особенности учеников, речь идет о том, как подойти к ним, скрыть их личностные качества. Начиная с первого класса, маленькие школьники знакомятся с окружающим миром. Отношение к труду у учеников рождается у младших. Это в первую очередь размещены в начальных классах. Свободное время успешных студентов можно использовать для раскрытия некоторых их способностей и навыков.

**Rəyçi: dos.M.B.Həsənov**

# PSİXOLOGİYA PSIXOLOGY ПСИХОЛОГИЯ

**Mansurova Sevda İbrahim qızı**
Bakı Slavyan Universiteti
mansurova_sevda@ mail ru

## AİLƏ TƏRBİYƏSİNİN ŞƏXSİYYƏTİN FORMALAŞMASINA TƏSİRİ

***Açar sözlər:*** *ailə, şəxsiyyət,tərbiyə, cəmiyyət, ünsiyyət*
***Key words:*** *family, person, education, society, comunication*
***Ключевые слова:*** *семья, личность, воспитание, общество, общение*

Hər bir insan dünyaya fərd kimi gəlir və müəyyən sosial keyfiyyətlərə yiyələndikcə şəxsiyyətə çevrilir. Fərdin şəxsiyyət kimi formalaşmasında bioloji amillər, sosial amillər və tərbiyənin xüsusi rolu vardır. Məlum olduğu kimi hər bir fərdin cəmiyyətdə bir şəxsiyyət kimi formalaşmasında digər faktorlarla yanaşı ailə tərbiyəsinində rolu danilmazdır. Ailə hər bir fərdin doğulub, boya - başa çatdığı kiçik bir cəmiyyətdir. Uşaq hələ müəyyən yaşa çatıb, sosiallaşana qədər ailədə mövcud mühitə uyğun olaraq tərbiyə alır və bu istiqamətdə inkişaf edir. Təbii ki, uşağın genetik xüsusiyyətlərini də nəzərə alaraq ailə tərbiyəsinin onun formalaşmasına təsiri məsələlərinə diqqət yetirək. Belə ki, bildiyimiz kimi hər bir uşaq anadan olarkən müəyyən sinir tipinə, temperament xüsusiyyətinə malikdir. Bir ailədə doğulan bir neçə övladın hər birinin fərqli temperament tipinə malik olması hamıya məlumdur. Temperament tipindən asılı olaraq hər bir uşağın fərqli davranışı, reaksiyaları, həsaslığı, aktivliyi, ümumiyyətlə fərqli xüsisiyyətləri yaranacaqdır. Bu isə o deməkdir ki, hər hansisa bir situasiyada bacı-qardaşların hər biri fərqli reaksiya, münasibət göstərəcəkdir. Əgər bir ailədə fərqli xarakterli uşaqlar böyüyürsə, bu ailədə valideyinlərin onlara eyni tərzdə yanaşmaları, ümumiyyətlə ailədə bir təriyə üsulunun tətbiq edilməsi nə dərəcədə düzgün olar.?

İnsanın həyat yolu şəxsiyyətin ailədə və ictimai tərbiyənin müxtəlif vasitələrində formalaşması prosesindən başlayır (1, s.243). Ailə tərbiyəsi şəxsiyyətin formalaşmasına cox böyük təsir göstərir. Hər bir uşağın böyüdüyü ailədə mövcud olan münasibətlərin forması, ailə üzvlərinin həyat tərzi, dünya görüşü, maraqları, dəyərlər sistemi, hörmət, sevgi həmin ailədə böyüyən uşağa tərbiyəvi təsir göstərəcəkdir. Təbii ki, valideyinlər hər zaman öz övladlarına öyüd-nəsihət verir, onlara nəyin düz, nəyin yalnış olduğunu başa salır, onları düzgün böyütmək üçün tərbiyə verirlər. Uşaqlıq dövründən valideyinlərin onlara qarşıbütün diqqəti, sevgisi, ümumiyyətlə münasibət tərzi uşağın hafizəsinə həkk olunur. Bunu her birimiz epizodik olsa da xatırlayırıq. Bəzən hər bir şəxs cəmiyyətdə özünütəsdiq edərkən, münasibətlər qurarkən təbii ki, xatirələrinə, keçmiş biliklərini xatırlamağa ehtiyac duyur. Hafizənin tərbiyə edilməsi şəxsiyyətin ümumi inkişafı ilə qarşılıqlı vəhdətdə həyata keçirilir (2,s.87). Bu baxımdan ailədə uşaqlara qarşı göstərilmiş şiddət, zorakılıq, laqeyidsizlik də təsirsiz ötüşmür. Onlar bu halları daima xatırlayir, bəzən xatırlamasalar da zamanında onlara qarşı yönəldilmiş zorakılıq şüuraltı olaraq onları aqressiv, əsəbi, nevroz olaraq formalaşdırır. Lakin bir cəhəti də nəzərə almalıyıq ki, uşaq böyüdüyü mühitin xüsusiyyətlərini mənimsəyir, yaşadığı həyat tərzi onu daima şüuraltı olaraq formalaşdırır. Bu baxımdan hər bir ailədə ailə başçıları övladlarına tərbiyə verərkən öz davranışlarına da daima nəzarət etməli, düzgün şəxsiyyətlərarası münasibətləri təmin etməli, övladlarına aşılamaq istədikləri əxlaqi, mənəvi dəyərləri öz həyatlarında yaşayaraq, tətbiq eərək nümunə olmalıdırlar.

Ailədə ailə üzvləri arasında mövcud olan psixoloji uyğunluq xüsusilə ər və arvad arasında olan qarşılıqlı hörmət, sevgi sağlam ailə üçün vacib şərtlərdən biridir. Lakin bu qarşılıqlı hörmət, psixoloji uyuşma, təkcə ər-arvad arasında deyil digər ailə üzvləri arasında da olmalıdır. Çünki, ailə üzvləri arasında mövcud münasibət tərzi, həmin ailədə böyüyən uşaqlar üçün tərbiyə rolunu oynayir. Hər bir ailədə valideyinlərin uşaqlara qarşı tətbiq etdikləri tərbiyə üslubları, onların övladları ilə aralarında olan münasibətlərin forması uşağın sinir tipinə, temperament xüsusiyyətinə uyğun olmalıdır. Ailədə böyüyən uşaqların hər birinə fərqli yanaşılmalı, hər biri ilə fərqli tərbiyəvi dildə danışılmalıdır. Çünki, bildiyimiz kimi hər bir uşaq eyni ata-ananın övladları olmağından asılı olmayaraq fərqli temperament xüsusiyyətinə malık olurlar. Temperament xüsusiyyətindən asılı olaraq onlar fərqli dinamikliyə emosionallığa, aktivliyə malik olurlar. Bu baxımdan hər hansı bir situasiyada valideyinlərin uşağa göstərdikləri eyni reaksiya uşaqlar tərəfindən fərqli qarşılana bilər. Uşaqların fərqli təbiətə malik olmalarını nəzərə alıb, onlara qarşı fərdi, individual yanaşmanı təmin etmək lazımdır.

Bu günün hər bir ailəsi gələcək sağlam cəmiyyət üçün şəxsiyyətlər yetişdirir. Hər bir ailədə böyüyən sağlam, mənəvi-əxlaqi dəyərlərə malik savadlı, tərbiyəli övladlar sağlam cəmiyyət və sağlam gələcəyimizın təminatıdırlar. Bu baxımdan hər bir ailə öz üzərinə düşən funksiyaları, vəzifələri layiqincə yerinə yetirməlidir.

Hər bir ailənin özünəməxsus funksiyaları, icra üsuları var. Ailənin funksiyaları həmin ailənin həyat fəaliyyətinin başlıca istiqamətlərini təşkil edir. Bu baxımdan ailənin reproduktiv, təsərrüfat-iqtisadi, tərbiyə, bərpaedici və s. funksiyalarını qeyd edə bilərik. Bu funksiyaların hər birinin ailədə psixoloji iqlimin saflaşdırılmasında öz yeri vardır. Lakin məqalənin məqsədindən çıxış edərək, şəxsiyyətin formalaşmasında ailə tərbiyəsinin rolunu öyrənmək məqsədi ilə ailənin tərbiyə funksiyasına xüsusi yer verəcəyik.

Cəmiyyətin sosial əsası hesab edilən ailə öz üzərinə düşən vəzifələri layiqincə yerinə yetirməlidir. Çünki bunun əksi olduğu halda cəmiyyətimiz üçün sağlam şəxsiyyət yetişdirə bilməyəcəyik. Bu da bəşəriyyətin inkişafı üçün böyük itki deməkdir.Lakin ailənin uşağa verdiyi sağlam həyat tərzi bunun əksi olaraq cəmiyyətimizi, dövlətimizi inkişafa aparacaqdır. Sağlam həyat tərzinin tərbiyə olunmasına lap kiçik yaşlarından başlamaq lazımdır. Elə etmək lazımdır ki, uşaqlarda sağlam həyat tərzinə daxili tələbat yaransın (1, s.607).

Bildiyimiz kimi insanın fəaliyyət və ünsiyyət dairəsindən asılı olaraq tələbatları dəyişilir. Sağlam həyat tərzinə olan tələbatın formalaşması üçün uşağın fəaliyyətini bu istiqamətə yönləndirməli, ailədə şəxsiyyətlərarası münasibətləri, ünsiyyət formasını bu istiqamətdə qurmalıyıq.

Uşaqlar və yaşlılar arasında ünsiyyətin forması düzgün tənzimlənməlidir. Lakin davranışda müstəqillik elementlərinin yarandığı dövrdə uşaqla yaşlılar arasında narazılıqlar artır. Müstəqilliyə can atan uşaq qadağalalarla üzləşir (2, s.210). Bildiyimiz kimi yeniyetmələrin münasibətlər sistemində yaşadıqları narahatlıq sosial-psixoloji motivlərdən asılıdır. Bu narahatlığa əsasən ünsiyyətdə çətinliyi aid edə bilərik. Belə kommunikativ maneələr, bəzən rəqabətə, bəzən konfliktli situasiyalara yol aça bilər. Bu kimi halların qarşısını almaq üçün onlara ünsiyyət mədəniyyətini aşılamaq lazımdır.

Ümumiyyətlə yeniyetməlik dövründə onların öz şəxsiyyətlərinə marağı artır. Bu maraq özünü dərketmənin səviyyəsinə müvafiq olur.Yeniyetmə inkişafının bu həssas dövründə ətrafdakılardan, onu əhatə edən çevrəsindən qayğı, ilgi və diqqət gözləyir. Yəni ətrafdakıların onun fikirlərinə hörmətlə yanaşmaları, onunla hesablaşması, bir şəxsiyyət kimi qiymətləndirməsi onun özgüvəninə müsbət təsir edəcəkdir. Lakin həmin dövrdə psixoloji inkişaf, qarşılıqlı münasibətlər heç də həmişə arzuolunmaz səviyyədə reallaşmır. Z.Freyd bunu cinsi inkişafla əlaqədar olaraq orqanizmdə gedən fiziolji dəyişmələrlə əlaqələndirir. Hesab edir ki, bu təsirlərlə yeniyetmələrin davranışında müxtəlif formalı yayınmalar, daxili narahatlıq və qorxu əmələ gəlir (3,s.308).

Gənc nəslin tərbiyəsində ailənin xüsusi rolu vardır. Valideynin uşağa münasibəti həm valideynin, həm də uşağın fərdi xüsusiyyətərindən asılı olaraq tətbiq edilir (4,s.200). Bu baxımdan ailənin hər bir fərdinin yenidəntərbiyəyə ehtiyacı ola bilər. Ailədə övladlar dünyaya gəldikdən sonra valideyinlərin öz həyat tərzinə ciddi yanaşmaları son dərəcə vacibdir. Çünki bu bir başa uşaqların bir şəxsiyyət kimi formalaşmasına təsir edəcəkdir. Bu zaman tərbiyənin ailənin həm yaşlı üzvlərinə verilməsi, eyni zamanda ailə kollektivinin özünün ailənin hər bir üzvünə üzünmüddətli, məqsədyönlü, sistemli və müntəzəm tərbiyəvi təsiri və uşaqların öz valideyinlərinə daimi təsiri məsələləri həll olunacaqdır. Bu şəraitdəailədə valideyinlərin özünütərbiyə ilə fəal surətdə məşğul olmalarına zırurət yaranacaqdır. Belə ki, ailə mühiti belə qurulduqda bu mühit ailənin hər bir üzvünə sağlamlaşdırıcı, psixoterapevtik təsir göstərəcəkdir.

Məlum olduğu kimi hər bir şəxs bir ailədə böyüyür, tərbiyə alır və həmin ailənin tərbiyəsini, həyat tərzini əks etdirir və bu ailənin adət-ənənələrini davam etdirir. Bu baxımdan bir ailənin yetişdirib, tərbiyə verdiyi bir şəxsiyyət gələcək nəslin davamçılarıdır. Belə ki, biz övladlarımıza tərbiyə, təhsil verərkən təkcə onların sağlam gələcəyini təmin etmir, cəmiyyətimiz üçün sağlam şəxsiyyət yetişdirmiş oluruq. Bu tərbiyənin nəticəsi gələcəkdə insanın cəmiyyətdə digərləri ilə münasibətlər qurmasını, özünü bir şəxsiyyət kimi tanıtmasını, cəmiyyətdə özünə status və nüfuz qazanmasına gətirib çıxaracaqdır.

**Ədəbiyyat:**

1. Ə.S.Bayramov, Ə.Ə.Əlizadə. Psixologiya. Bakı, "Çinar-cap", 2002,620s.
2. Əzizov Q.Q. Psixologiya. Bakı: Mütərcim, 2013, 328s.
3. Əmrahlı L.Ş. Rzayeva N.T. Uşaq psixologiyası. Bakı, "Nurlan", 2015, 344
4. Mirələm Vəliyev, Azər Mustafayev. İnkişaf və yaş psixologiyası. Bakı, "Elm", 2013, 297s.
5. N.Z.Çələbiyev. Ailə psixologiyası. Bakı, "Mütərcim", 2015,424s.
6. S.İ.Seyidov, M.Ə.Həmzəyev. Psixologiya. Bakı, "Nurlan", 2007, 700s.

**The influence of family education to forming of person**
**Summary**

The given article is dedicated to one of the actual problems of psychologies – to forming a psychological health of family. The article emphasizes an importance of that problem for future life of young people and old generation. In the article is given necessary recommendation for increasing of level of psychological health of family.

**Влияние семейного воспитания на формирование личности**
**Резюме**

Проблема воспитание детей в семье, является актуальной сферой приложения научных усилий исследователей. Она привлекает внимания своей объемностью, многофакторностью исследования как проблема в целом, так и ее составных частей. Исследование только лишь морально психологического климата семьи, царящих в ней форм межличностных отношений, вопросов согласования интересов и потребностей старшего и младшего поколений очень важный аспект углубленного изучения психического здоровья семьи.

**Rəyçi: dos. G.A.Həsənova**

Məktəbəqədər təhsil müəssisələrində keçirilən təsviri fəaliyyət məşğələləri – rəsm, applikasiya, quraşdırma uşağın görmə qabiliyyətini, qavrayışını, bədii hisslərini, zövq və yaradıcılıq qabiliyyətini inkişaf etdirir, uşaqları cism və hadisələrin mahiyyətinə daha dərindən nüfuz etməyə yönəldir, forma və məzmun gözəlliyini seçməkdə, bu gözəlliyi qiymətləndirə bilməkdə ona yardım edir. Təsviri fəaliyyət məşğələlərində əldə edilən qabiliyyət, bacarıq və vərdişlər uşağın ümumi inkişafına, o cümlədən estetik tərbiyəsinə ciddi kömək edir. Uşaqlar təsviri fəaliyyət məşğələlərində həyatda gördüklərini öz işlərinin köməyi ilə, çəkdikləri şəkillərin vasitəsi ilə, applikasiyaların köməyi ilə başqalarına çatdırmağa çalışırlar. Bu məşğələlərin əsas məqsədi uşaqlarda həyatda gördüklərini öz əl işləri vasitəsilə obrazlar şəklində ifadə etmək bacarığı tərbiyə etməkdir.

Təsviri fəaliyyət məşğələlərində uşaqların estetik tərbiyəsinin mühüm bir cəhəti onların bilavasitə təcrübi, bədii qabiliyyətlərinin imkanları ilə əlaqədardır. Məşğələlərdə uşaqlar praktik olaraq adi və rəngli karandaşlarla, habelə sulu boya ilə işləmək və plastilindən yapma və s. kimi qabiliyyətlərə yiyələnirlər. Belə təsviri fəaliyyət məşğələlərindən biri də rəsm məşğələsidir.

Rəsm çəkməklə bütün uşaqlar maraqlanır və bu onların ilk sevimli işlərindən biri hesab olunur. Uşaqlar çox həvəslə şəkil çəkirlər. Rəsm uşaqların görmə qavrayışını, bədii hisslərini, təxəyyülünü, zövq və yaradıcılıq qabiliyyətlərini inkişaf etdirir. Bu məşğələlər uşağı cism və hadisələrin mahiyyətinə daha dərindən nüfuz etməyə alışdıraraq cisimlərin forma və məzmun gözəlliyini seçməkdə, bu gözəlliyi qiymətləndirə bilməkdə onlara yardım göstərir.

Rəsm məşğələlərində uşaqların həm də rəssamların həyat və yaradıcılığı ilə tanış olur, onların çəkdikləri şəkillərdəki ideya və süjet duymağı öyrənirlər. Rəssamların çəkdikləri şəkillərdən tərtib olunmuş albomlar və eləcə də sərgilər, uşaqları təsviri incəsənət aləminə daxil edir, gözəlliyi duymaq və qiymətləndirmək sahəsində onlarda həssaslığı artırır. Rəsm məşğələlərində uşaqların əldə etdikləri müvəfəqiyyətlə kifayətlənməməli, onların rəsm üzrə bacarıqlarını möhkəmləndirmək lazımdır.

Uşaqları ardıcıl olaraq rəsm sərgilərinə aparmalı, görkəmli rəssamların əsərləri haqqında məlumatlar verməlidir. Rəsm əsərləri uşaqların ruhuna, hiss üzvlərinə qüvvətli təsir göstərən sənət növüdür.

Uşaq bağçasında tətbiq edilən dekorativ rəsmin də bünövrəsi xalq incəsənəti üzərində qurulmuşdur. Çünki bu, özünün sadə forması, əlvan və yaraşıqlı olması, aydın dərk edilməsi ilə uşaq anlayışına münasibdir.

Xalq incəsənəti uşağa yaxın olan öz doğma xalq yaradıcılığı vasitəsilə incəsənət əsərlərini yaxşı və dərindən dərk etməyə kömək edir. Məsələn, rəsm məşğələsində “Buta” rəsminin çəkilməsi zamanı tərbiyəçinin “buta” təsvir olunmuş mütəkkənin uşaqlara göstərməsi və bu əsasda sual-cavab onlarda estetik zövqün formalaşmasına kömək edir.

Uşaq bağçalarında təsviri fəaliyyət məşğələlərinin düzgün pedaqoji ustalıqla aparılması, uşaqlara kiçik yaşlardan düzgün istiqamət verilməsi onların estetik tərbiyəsinə öz yüksək təsirini göstərmiş olur. Buna görə də bu məşğələlər uşaqların estetik inkişafı baxımından həmişə diqqət mərkəzində saxlanılmalıdır.

İncəsənət insan fəaliyyətinin ayrılmaz tərkib hissəsidir. İnsan şəxsiyyəti yalnız incəsənətin köməkliyi və fəal iştirakı ilə tam formalaşa bilər. Müasir uşaqların tərbiyəsində incəsənət onun humanizm ruhunda formalaşmasına, ondakı yaradıcı qabiliyyətlərin üzə çıxarılmasına əhəmiyyətli şəkildə təsir göstərir. Uşaqların harmonik tərbiyəsinə cəhd göstərməklə onun estetik duyumunun inkişaf etdirilməsinə qayğıkeşliklə yanaşmaq lazımdır. Gerşəkliyin incəsənət vasitəsilə estetik şəkildə mənimsənilməsi yaradıcılıq prosesində həyata keçirilir.

Beləliklə, estetik dünyagörüş uşaqları, digər məşğələləri də dərindən öyrənməyə alışdırır və onlara uşaq bağçasının bütün ictami həyatında iştirak etməyə istiqamətləndirir.

## Ədəbiyyat:

1. A.M. Həsənov. Məktəbəqədər pedaqogika. Bakı: Nasir, 2000.
2. V.Xəlilov. Ümumtəhsil məktəblərində estetik tərbiyənin inkişafı yolları. Bakı: Maarif, 1995.
3. M.Muradxanov. Ümumi pedaqogika. Bakı: Maarif, 1964.
4. N.Rüstəmova. Məktəbəqədər pedaqogika tarixi. Bakı: 2004.
5. Uşaq bağçasında tərbiyə və təlim proqramı. Bakı: Maarif, 1983.

**The role of classes in the development of aestetic education of children**

**Summary**

Aesthetic education should be closely interconnected with the process of shaping the outlook of mans moral education, science and morals. High ideals should be ensured in aesthetic education. Material that is used for aesthetic purposes should be carefully selected, especially if they are ideally high, figuratively valuable adn rich.

**Роль занятий в развитии эстетического воспитания детей**

**Резюме**

Эстетическое воспитание должно проводиться в неразрывной связи с нравственным воспитанием. Научное и нравственное мировоззрение тесно взаимосвязано с процессом формирования нравственного воспитания, научного и нравственного мировоззрения человека.

Эстетическое воспитание должно быть обеспечено высокими идеалами. Материал, используемый с целью эстетического воспитания, в эстетических целях, должен быть тщательно отобран, особое внимание следует уделят идейной, художественной ценности.

**Rəyçi: prof. M.İ.İlyasov**

**Quliyeva Səmayə Akif qızı**
Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyası

# ALİ MƏKTƏBLƏRDƏ NİTQ VƏRDİŞLƏRİNİN FORMALAŞDIRILMASININ LİNQVİSTİK ƏSASLARI

***Açar sözlər:*** *nitq vərdişləri, kommunikativ bacarıq, bədən dili, linqvistika*
***Key words:*** *speech habits, communicative skill, body language, linguistics*
***Ключевые слова:*** *речевые привычки, коммникативный навык, язык тела, лингвистика*

Xarici dilin tədrisi metodikası dilçilik elmi ilə sıx bağlıdır. Metodika bir elm kimi, özünün bir sıra problemlərini nəinki dilçiliklə birgə, həm də onun köməyilə həll edir. Bu fikirlər metodika ilə dilçiliyin ümumi əlaqəsini əks etdirir. Bəs bu əlaqə nitq vərdişlərinin formalaşdırılmasına necə təsir edir? Bu sualı aydınlaşdırmadan öncə nitqin tədrisi prosesində metodistləri və müəllimləri daim düşündürən məsələlər və maraq doğuran suallara nəzər yetirək:

- Nitqdə hansı aspektlərə önəm verilməlidir?

-Qrammatik qaydalardan başqa hansı qaydalara dil öyrənənlər nitq prosesində ehtiyac duyurlar?

- Nitq fəaliyyətlərinin hansı növü auditoriyada daha çox istifadə olunur?

- Nitqin formalaşdırılmasında hansı materiallardan istifadə edilir?

-Düzgün ünsiyyət qurmaq üçün hansı növ semantik-qrammatik biliyə ehtiyac var? [2, s.90]

Bu suallar xarici dilin tədrisində çox aktualdır və praktik olaraq cavablandırılmalıdır.

Biz qrammatik qaydaların mənimsənilməsi prosesində aşağıdakı çətinliklərlə qarşılaşırıq:

Söz sırası tələbələr üçün ən çətin hesab edilən qrammatik məsələdir, çünki ingilis dilində söz sırasını dəyişsək məna da dəyişəcək. Lakin Azərbaycan dilində söz sırası sərbəstdir. Biz sözlərin yerini dəyişə bilərik və məna dəyişikliyi olmur.

İngilis dilində feillərin zamanlarının öyrənilməsi çətinlik yaradan növbəti məsələdir. Azərbaycan dili ilə müqayisədə İngilis dilində zamanların sayı və strukturu, uzlaşması mürəkkəbdir. Əlbəttə, bütün zaman formalarını mənimsəmək və nitq prosesində istifadə etmək tələbələrdə çətinlik yaradır [5, s.25]. Ümumilikdə metodiki cəhətdən qəbul olunmuşdur ki, tələbə öz ana dilinin qrammatikasında olmayan qaydaların öyrənilməsində çətinlik çəkir, çünki dillərin öyrənilməsində müqayisə metodu bu prosesi asanlaşdırır. Bir məsələni qeyd edək ki, biz qrammatikanın tədris edilməsi dedikdə müəyyən qrammatik qaydalar sisteminin əzbər, mexaniki öyrənilməsini nəzərdə tutmuruq. Biz nitq prosesində bu qaydalara əsaslanaraq fikrin düzgün ifadə edilməsi bacarığına diqqət yetirməliyik.

Şifahi kommunikasiya təkcə düzgün qrammatik, leksik və fonetik aspektlərin mənimsənilərək nitq aktının icra edilməsi deyil. O həm də qeyri-verbal ünsiyyəti nəzərdə tutur. Qeyri-verbal ünsiyyət sistemindən məlumatsızlıq ünsiyyət prosesində ziddiyyətlər yaradır. Şifahi nitqin əsas xüsusiyyətlərindən biri də mimika, jest və başqa hərəkətlərin icrasıdır. Ünsiyyət zamanı nəyi söylədiyimizlə yanaşı necə söyləməyimiz də önəm daşıyır. Bədən dili, jestlər, göz kontaktı, fiziki məsafə və digər qeyri-verbal məsələlər mühümdür. Nitq prosesi bu zaman daha aydın olur. Tələbələr bilməlidirlər ki, nitqdə bədən dilindən istifadə normaları yerinə və mənsub olduğu dil mədəniyyətinə görə fərqlənir. Kommunikativ səriştə bu amilləri nəzərə almadan effektiv ola bilməz [2, s.198-199]. Müəyyən olunmuşdur ki, qeyri-verbal yolla çatdırılan məlumatlar verbal yoldan daha güclü təsirə malikdir.

Auditoriyada müəllim real həyatda tələbələrin daha çox rastlaşdığı ünsiyyət modellərindən, autentik materiallardan, şifahi ünsiyyətə motivasiya edən tapşırıqlardan istifadə etməlidir. Tələbələrdə həm səlistlik, həm də qrammatik dəqiqlik aşılanmalıdır. Qrammatika dilin mühüm aspektlərindən biridir. Tələbə xarici dildə danışılanı başa düşmək və özünü düzgün ifadə edə bilmək üçün öyrənilən dilin qrammatik xüsusiyyətlərini mənimsəməlidir. Əlbəttə, tələbə cümlədə bütün sözləri bilməyə bilər. Lakin verilən cümlədə sözlər arasındakı əlaqəni görə bilməsə onu başa düşməkdə çətinlik çəkəcək. Qrammatika biliyi olmadan nitq mümkün olmayacaq. Tələbə dilin qrammatik mexanizmini mənimsəsə xarici dildə düzgün cümlələr qura biləcək [5, s.24].

Nitqin effektivliyinə təsir edən komponentləri mütləq vurğulamalıyıq. Dilşüna Dell Haymes vur-ğulayır ki, tələbələr nəinki dilin linqvistik xüsusiyyətlərini, eyni zamanda müxtəlif situasiyalarda və münasibətlərdə digərləri ilə düzgün kommuniksiya üçün gərəkli olan komponentləri bilməlidirlər. Haymesin nəzəriyyəsinə əsaslanaraq, M.Canale və M.Svain təklif etdilər ki, kommunikativ səriştəyə qrammatik səriştə, diskurs səriştəsi, sosiolinqvistik səriştə və strateji səriştə daxildir və linqvistik sistemin istifadəsini

əks etdirir. Qrammatik səriştə morfologiya, sintaksis, sözlərin tələffüzü, vurğusu və digər məsələlərin nitq prosesinə tətbiqidir. Qrammatik səriştə dilin strukturlarının dəqiq, tərəddüd etmədən başa düşməyə və səlist nitqə zəmin yaradır. Diskurs səriştəsi ünsiyyətin mənalı qurulmasını tələb edir. Sosiolinqvistik səriştə isə dilin sosiolinqvistik tərəfinin başa düşülməsidir və tələbəyə imkan yaradır ki, ünsiyyət prosesində nə zaman sual vermək, söhbətin məqsədinə uyğun olaraq necə cavab vermək məsələlərini mənimsəsin. Strateji səriştə bütün kommunikativ səriştə elemenlərindən ən mühümü hesab edilir. Strateji səriştə nə zaman və necə ünsiyyətə başlamaq, bu prosesi necə davam etdirmək, yekunlaşdırmaq və problem yarandıqda necə həll etmək məsələlərində bacarıqlı olmaqdır [8, s.207-208].

Nitq vərdişlərinin mənimsədilməsində əsas götürülən aşağıdakı linqvistik faktorlara diqqət yetirək:

1. Tələffüz, qrammatika, və lüğət. Düzgün söz sırasının düzgün tələffüz forması ilə istifadəsi zəruridir. Bu məsələ linqvistik əsas olaraq qiymətləndirilir.

2. Sosial və mədəni qaydalar və normalar. Yəni sosiolinqvistik və sosiomədəni amillərin kommunikasiya prosesində nəzərə alınmasını tələb edir [4, s.213].

Metodist Penni Ur nitq vərdişlərinin mənimsənilməsində fonetik məsələlərin, yeni sözlərin öyrənilməsi və praktik istifadəsi, dinləmə bacarıq və vərdişlərinin inkişafı, dinləmə və danışma bacarıqlarına əsaslanan kommunikativ tapşırıqların icrası, interaktiv və maraqlı tapşırıqların planlı icrasını məqsədəuyğun hesab edirdi [7, s.188].

Biz danışıqda istifadə edilən, dialektlərə yol verilməyən, radio, televiziya və digər ictimai sahələrdə istifadə edilən standart ingilis dilini tədris etməliyik. Düzgün nitq üçün tələbələrin söz ehtiyatının olması, öyrəndikləri qrammatik, leksik materialları yadda saxlaması əsas linqvistik faktorlar hesab olunur.

Uğurlu nitq üçün lüğət ehtiyatı artırılmalıdır. Əksər metodistlər inanırlar ki, xarici dildə ünsiyyət prosesində iştirak edə bilmək söz ehtiyatının çoxluğu ilə əlaqəlidir. Lakin müasir dilçilik nəzəriyyələri lüğət ilə yanaşı dilin struktur, funksiyası, əsas anlayışlar və kommunikativ strategiyalara da önəm verməyi zəruri hesab edir.

Metodist D.Braun şifahi nitqin tədrisində aşağıdakı məsələlərin mühümlüyünü vurğulayır. Qeyd edək ki, bu xüsusiyyətlər linqvistik məsələlərin icrası üçün mühümdür.

1. İngilis dilinin fonemləri və allofonik variantları arasında fərqləri bilmək ;

2. İngilis dilinin vurğu nümunələri, vurğulu və vurğusuz sözlərin müqayisəsi, nitqdə ahəngdarlıq və intonasiya ilə bağlı məqamlar;

3. Sözlərin və ifadələrin qısaldılmış formaları;

4. Praqmatik məqsədin çatdırılmasına uyğun leksik vahidlərdən istifadə edilməsi;

5. Qrammatik söz vahidləri (isim, sifət, fel, zərf və s), sistemləri (felin zamanları, mübtəda-xəbər uzlaşması, kəmiyyət kateqoriyası, söz sırası), elliptik formaların düzgün istifadə edilməsi;

6. Eyni məzmunlu cümlənin müxtəlif qrammatik formalarda ifadə edilməsi;

7. Danışıq strategiyalarının (əsas sözlərin vurğulanması, sözlərin mənasının şərh edilməsi üçün uyğun kontekstin yaradılması) istifadə edilməsi [3, s.257-258]. Bu fikirlərə əlavə olaraq metodist Con Munbi tərəfindən təklif olunan "dil bacarıqlarının taksonomiyasını" nümunə göstərə bilərik. Bura ayrı-ayrı sözlərdə səslərin fərqləndirilməsi, tələffüz edilməsi, vurğunun düzgün qoyulması, intonasiya nümunələrinin mənimsənilməsi, məlumatin birbaşa, aydın, lazım gəldikdə üslubi çalarlarla ifadə edilməsində səriştəli olmaq daxildir [6, s.127-130].

Dili öyrənən şəxs xarici dildə danışdıqda söylədiyi fikri ana dilində düşünür, sonra xarici dildə deyir. Bu əslində mexaniki prosesdir. Lakin dil materialları elə öyrədilməlidir ki, o, öyrədilən dildə məqsədli düşünüb danışa bilsin. Müasir metodikada nitq vərdişlərinin formalaşdırılması və inkişafı çox aktual məsələdir.

Təəssüflər olsun ki, ana dilindən mütəmadi istifadə olunması bu məsələni reallaşdırmağa mane olur. Ana dilinin istifadəsinin ikinci dilə təsiri geniş müzakirə obyektidir və biz bir neçə vacib məsələlərə toxunmadan keçə bilmərik. Çünki nitqdə səriştəlilik ikinci dildən davamlı istifadəni tələb edir. Akademik Şerba dilin öyrədilməsində əsas etalon müqayisəni hesab edirdi. O vurğulayırdı ki, xarici dil ana dili ilə müqayisə vasitəsilə öyrədildikdə, dil materialı daha yaxşı qavranılır. Belə olmadıqda onlar öz ana dilində belə qaydaları ləng öyrənirlər.

Ümumiyyətlə, nitq vərdişlərinin formalaşdırılması ilə bağlı metodiki ədəbiyyatda müxtəlif fikirlər və nəzəri məsələlərlə rastlaşırıq. Məsələn, Dilçi Ç.Friz ilkin mərhələdə söz ehtiyatının artırılmasına deyil, dilin səs quruluşunu şagirdlərə öyrətməyi təklif edirdi. O, danışıq bacarığını dilin sütununda durduğunu vurğulayırdı. Nitq vərdişlərinin tədrisində dinləmə bacarığının əsas rol olması danılmazdır. Adətən istənilən

şəxs danışanda digəri dinləmə vasitəsilə qarşı tərəflə dialoqa girir və interaksiya (qarşılıqlı ünsiyyət) baş verir. Əgər tələbə nə deyildiyini başa düşməsə cavab verməkdə də bacarıqsız olacaq [8, s.205].

Məlumdur ki, tələbələr nitq vərdişlərini yalnız auditoriya daxi+lində təcrübədən keçirə bilirlər. Onlar auditoriyadankənar yalnız yazılı tapşırıqların edilməsinə, sözlərin əzbərlənməsinə, mətnlərin öyrənilməsinə yönəlirlər. Bu səbəbdən kommunikativ tapşırıqların tərtib edilməsi və tələbələrin buna cəlb edilməsi zəruridir. Effektiv, interaktiv tapşırıqlar mənalı, kommunikativ, dilin digər xüsusiyyətlərini də əks etdirməlidir. Xüsusilə də bu tapşırıqlar autentik mənbələrə əsaslanmalı, dilin praktik istifadəsinə yönəlməli, onların real həyatda ehtiyac duyduğu kommunikativ situasiyalara əsaslanmalı, dil öyrənmənin psixolinq-vistik prosesini aktivləşdirməlidir. [8, s.208-209].

Ümumiləşdirərək qeyd etməliyik ki, nitq vərdişlərinin formalaşdırılmasının linqvistik əsasları başlığı altında biz dil materiallarının mənimsənilməsinə önəm verməliyik. Bura lüğət, qrammatika, sintaktik biliklər daxildir. Biz öyrətməliyik ki, xarici dildə düzgün cümlə qurmağı, sözlərin işlənmə yerini öyrənmədən nitq prosesi mümkün ola bilməz. Tələbələr səlist, düzgün nitq bacarıq və vərdişlərinin formalaşdırılması üçün onların zəruri fonetik, qrammatik, leksik biliklərə yiyələnməsi mühümdür. Onlar təkcə linqvistik biliklərlə kifayətlənməyib, ingilis dilinin mədəniyyəti, ənənələri haqqında məlumatlandırılmalıdırlar. Nitq bacarığı təkcə tələffüz və intonasiya ilə bağlı olan məsələ deyildir. Kommunikativ bacarıqların inkişaf etdirilməsi üçün isə davamlı olaraq dildən praktik istifadə zəruridir.

**Ədəbiyyat:**

1. Brown H.D. Principles of language learning and teaching. New York, 1980
2. Dubin F., Olshtain E. Course design. Cambridge University Press, 2000
3. Brown H.D. Teaching by principles: An interactive approach to language Pedagogy. New Jersey: Prentice-Hall, 1994
4. Ismailova D.A. Teaching English as a foreign language. Baku, 2011
5. Karimov F., Safiyev A. Methods of teaching English in Azerbaijan. Baku, ADU
6. Munby J. Communicative syllabus design. Cambridge University Press, 1991
7. Penny Ur. A course in language teaching. Practice and Theory. Cambridge University Press, 2004
8. Richards J., Renandya W.A. Methodology in language teaching. Cambridge University Press, 2002

**Linguistic bases of formation of speech habits in high schools**
**Resume**

The role of linguistic knowledge in the formation of speech habits is essential. The students don’t live in a foreign language environment and needs grammar rules.

Semantic-grammatical knowledge is important for communicating correctly. In the article, we focus on the ability to express ideas correctly based on linguistic rules in the speech process. If the student fails to see the connection between words in the sentence, he will have difficulty in understanding it. It is important to know the peculiarities of spoken language along with linguistic issues.

The article also reflects the views of linguists and methodologists on the application of linguistic issues in the speech process.

**Лингвистические основы формирования речевых навыков в вузе**
**Резюме**

Роль лингвистического знания важна в формировании речевых навыков.

Студент не живет в языковом среде и нуждается грамматических правилах. Семантико-грамматические знания важны для правильного общения. В статье мы акцентируем внимание на умении правильно выражать идеи на основе лингвистических правил в речевом процессе. Если ученик не видит связи между словами в предложении, ему будет трудно понять это.

Важно знать особенности разговорной речи наряду с языковыми проблемами. В статье также отражены взгляды лингвистов и методистов на применение языковых проблем в речевом процессе.

**Rəyçi: dos. Ş.Ağakişiyeva**

**Fərzəliyeva Əsmər Ağa qızı**
Azərbaycan Dövlət Pedaqoji Universiteti

# X SİNİFDƏ "YENİ DÖVR AZƏRBAYCAN ƏDƏBİYYATI II MƏRHƏLƏ (XIX ƏSR)" İCMAL MÖVZUSUNUN TƏDRİSİ MƏSƏLƏLƏRİ

***Açar sözlər:*** *kurikulum, ədəbiyyat dərsləri, təlim, təhsil, interaktiv təlim metodları, icmal mövzuları*
***Key words:*** *curriculum, literature lessons, education, teaching, interactive methods of education, review topics*
***Ключевые слова:*** *курикулум, уроки литературы, образование, преподавание, интерактивные методы обучения, обзорные темы*

Azərbaycan ədəbiyyatı tarixində XIX əsr yeni səpkidə əsərlərin meydana gəldiyi, ədəbiyyatda yeni janrların, maarifçiliyin yarandığı, milli mətbuatın və teatrın əsasının qoyulduğu, maarifçi realizm ədəbi cərəyanının formalaşması əsasında yeni tipli ədəbiyyatı özündə əks etdirən bir dövr olmaqla bərabər, bu yüzillik tarixdə zidiyyətli bir dövr kimi səciyyələndirilir. Əsrin əvvəllərində Rusiya imperiyasının Azərbaycana qarşı işğalçılıq siyasəti, onsuz da parçalanmış bir halda olan ölkənin yadellilər tərəfindən 1813-cü il "Gülüstan", 1828-ci il "Türkmənçay" müqavilələri ilə bölüşdürülməsi nəticəsində Azərbaycan iki hissəyə parçalanır; şimalda Rusiya, cənubda İran hakimiyyəti bərqərar olur.

Ədəbiyyatımızın bu dövrü ədəbiyyat tarixinə dövrləşməyə uyğun olaraq, "Yeni dövr Azərbaycan ədəbiyyatının ikinci mərhələsi" kimi daxil olur. Bu dövr ümumtəhsil məktəblərində X sinif ədəbiyyat kursunda tədris olunur. XIX əsrin görkəmli nümayəndələrindən olan Q.Zakir, M.F.Axundzadə, B.Şakir, Aşıq Ələsgər, S.Ə.Şirvani, N.Vəzirov, S.Ə.Nəbatinin həyat və yaradıcılıq yolu müstəqil mövzu kimi tədris olunsa da, bildiyimiz kimi, bütün ədəbiyyat materialları dərsliklərə salınmamaqla bərabər, daxil olan materialların da hamısını müstəqil mövzu kimi tədris etmək mümkün deyil. Bu baxımdan, müəyyən dövrlərin ümumi xüsusiyyətləri müstəqil mövzu kimi tədris olunmasa da, bir çox ədəbi-tarixi şəxsiyyətlərimiz haqqında məlumatlar, dövrün mühüm hadisələrini və sosial-siyasi mənzərəsini əks etdirən icmal mövzularının xüsusi əhəmiyyəti vardır.

"Yeni dövr Azərbaycan ədəbiyyatı II mərhələ (XIX əsr)" adlı icmal mövzusu Azərbaycan ədəbiyyatı tarixində mühüm əhəmiyyətə malik olan bir dövrün səciyyəvi xüsusiyyətlərini əks etdirir. Belə ki, həmin dövrdə maarifçilik ideyaları geniş vüsət almağa başlayır. Kövrək addımlarını atan realizmin əsas yaradıcıları maarifçilər idi. Maarifçilik əzilən kütlənin, xüsusən kəndlilərin mənafeyini müdafiə edən mütərəqqi hərəkat kimi meydana çıxmışdır. [1, s. 113]

Ölkədə milli teatrın və mətbuatın əsası qoyuldu. H.Zərdabi qarşısına çıxan böyük çətinliklərə baxmayaraq, Azərbaycan dilində ilk mətbu orqan olan "Əkinçi" qəzetini çap etdirir. Qəzetin ömrü az olsa da, yaratdığı ideyalar özündən sonrakı mətbu orqanların yaranmasında böyük rol oynadı. Dövrün iki böyük mütəfəkkiri Həsən bəy Zərdabi və Nəcəf bəy Vəzirovun rəhbərliyi ilə 1873-cü il mart ayının 10-da Bakı real gimnaziyasının bir qrup tələbəsi əvvəlcə M.F.Axundovun "Sərgüzəşti-vəziri-xani-Lənkəran" əsərini, az sonra isə "Hacı Qara" komediyasını səhnələşdirirlər.

Ədəbiyyatda yeni növ və janrlar meydana gəldi. Realist ədəbiyyatın uğuru kimi qiymətləndirilən bu addım dramatik növün bütün janrlarında əsərlərin meydana gəlməsi idi. Bu ənənə M.F.Axundov məktəbinin davamçıları tərəfindən uğurla davam və inkişaf etdirildi (Nəcəf bəy Vəzirov, Cəlil Məmmədquluzadə, Əbdürrəhim bəy Haqverdiyev və b. sənətkarların fəaliyyəti ilə ).

Bundan əlavə ölkədə yeni tipli məktəblər açılır, dərsliklər yazılmağa başlayır. Bakıda və Azərbaycanın digər bölgələrində qəza məktəblərinin sayı artırıldı, az da olsa "realni" məktəblər fəaliyyətə başladı, dərsliklər tərtib olundu. Qori Müəllimlər Seminariyasının "müsəlman şöbəsi"nin yaradılması Avropaya pəncərə rolunu oynadı.

İcmal mövzuların tədrisinə xas xüsusiyyətlərdən biri də həm fənni tədris edən müəllimin, həm də şagirdlərin mövzu ilə bağlı ciddi hazırlığı olmalıdır. Tədrisinə cəmi 1 saat vaxt ayrılan icmal mövzularının şagirdlər tərəfindən yaxşı qavranılması, bir çox məlumatın qısa bir vaxt ərzində çatrılıması baxımdan isə fənn müəlliminin əvvəlcədən hazırlığı vacibdir. Məsələn, "XIX əsr Azərbaycan ədəbiyyatı" icmal mövzusunun tədrisi ilə bağlı əvvəlcədən hazırlıq işləri görülməlidir. Şagirdlər dərs ilinin əvvəlindən A.Bakıxanovun "Nəsihətlər", M.Ş.Vazehin "Nə qədər kim fələyin sabitü-səyyarəsi var" qəzəli, İ.Qutqaşınlının "Rəşid bəy və Səadət xanım", X.Natəvanın qəzəlləri("Ey dust", "Xudahafiz", "Qərənfil" və

s.), N.Vəzirovun "Müsibəti-Fəxrəddin" faciəsini müstəqil oxumalı olduqlarını bilməli, mövzunun öyrənilməsinə qədər onlarla tanış olmaq imkanı əldə etməlidirlər. [3, s. 281-282]

İcmal mövzuların tədrisi zamanı müəllimin dərsdə interaktiv mühazirə, ifadəli oxu, dialoq, şagirdlərin müstəqil çıxışları vasitəsilə tədrisi daha məqsədəuyğun və şagirdlərin qavraması baxımdan daha faydalıdır. Bundan əlavə, yaxın fənlərlə inteqrasiya icmal mövzuların səmərəli öyrənilməsində faydalıdır. Bildiyimiz kimi, müasir dövrdə inteqrativlik müsir dərsin qarşısında duran əsas tələblərdən biridir. Bu mövzuların tədrisi zamanı müəyyən dövr, şərait, zaman, məkan haqqında məlumat verərkən tarix, coğrafiya kimi yaxın fənlərə, şagirdlərin həmin fənlərdən mənimsəmiş olduğu əlavə biliklərə müraciətlə, xəritə və sxemlərdən istifadə edərək daha faydalı bir dərs qurmaq olar.

**Ədəbiyyat:**

1. Əliyev S., Həsənov B., Mustafayeva A. Ümumtəhsil məktəblərinin 10-cu sinfi üçün Ədəbiyyat fənni üzrə dərslik. Bakı, "Bakı" nəşriyyatı, 2017 – 208 s.
2. Əliyev S., Həsənov B., Mustafayeva A. Ümumtəhsil məktəblərinin 10-cu sinfi üçün Ədəbiyyat fənni üzrə dərsliyin metodik vəsaiti. Bakı, "Bakı" nəşriyyatı, 2017 – 208 s.
3. Həsənli B. Ədəbiyyatın tədrisi metodikası. Bakı, "Müəllim", 2016 – 452 s.
4. Hüseynoğlu S. Ədəbiyyat dərslərində yeni texnologiyalar: fəal/interaktiv təlim(müəllim üçün vəsait). Bakı, 2009 – 200 s.
5. Yusifov F. Ədəbiyyatın tədrisi metodikası. Bakı, ADPU-nun nəşri, 2017 – 304 s.

**Issues of teaching the modern era of azerbaijan literature of the 2nd stage (19th century) in the 10th grade**

**Summary**

The XIX century is known as new genres works, the foundation of national press(mass media) and theatre. This period in the history of our literature is known as "A new period of Azerbaijan literature, the second stage". This period is studied at schools in the programmes of the 10th form. It is given the information about the events in the history of Azerbaijan the separation of Azerbaijan by Russia and Iran. Political events influence on literature. The new types of schools, press education in the country make a progress. With the help of review topics the students have the imagination about the development of cultural-literature destination in Azerbaijan.

**Вопросы преподования новейшей эпохы азербайджанской литературы II этапа (xix век) в x классе**

**Резюме**

XIX век вошёл в историю литературы как век новых литературных жанров, век возрождения просвещения, век зарождения национальной печати и основы национального театра. Этот период литературы вошёл в общий литературный процеес, как «Второй этап нового периода Азербайджанской литературы» В этот период в X классах общеобразовательных школах литература преподаётся на курсах по литературе. При изучении тем в школах даются исторические сведелия о раздем Азербайджана между Ираном и Россией в 19-ом веке. Политические события, происходящие в стране, не могли не оказать влияние на литературный процесс. В стране открываются школы нового типа, издаются газеты, журналы, наблюдается развитие в области литературы. Путём обзора темы у учащихся формируются представления о развитии Азербайджана в литературном-культурном направлении.

**Rəyçi: f.f.d. Xoşbəxt Əliyeva**

# SƏNƏTŞÜNASLIQ ART CRITICISM
# ИСКУСТВОВЕДЕНИЕ

**Раджабли Ляман Назим гызы**
Азербайджанская государственная академия художеств
lamanradjabli@gmail.com

## ДРЕВНИЕ ТРАДИЦИИ КЯЛАГАИ В НАШЕ ВРЕМЯ

***Ключевые слова:*** *кялагаи, Азербайджан, изделие, шелк, шелководство, традиции.*
***Açar sözlər:*** *kəlağayı, Azərbaycan, məhsul, ipək, baramaçlıq, ənənə.*
***Keywords:*** *kalagai, Azerbaijan, product, silk, sericulture, traditions.*

В связи с местоположением Азербайджана на протяжении многих веков между севером и югом, западом и востоком, а также ввиду прохождения Великого шелкового пути через территорию этой страны, одним из ремесел, появившихся тут около двух тысяч лет назад, стало шелководство. А в связи с развитием шелководства, шелкопроизводства, следовательно, стало развиваться и производство шелковых изделий.

Одним из таких изделий является кялагаи. Кялагаи является одним из видов азербайджанской национальной одежды. Это традиционный женский головной убор, предназначенный как для повседневной носки, так и для особых случаев. Ввиду своеобразному композиционному решению, а также изобилию и разнообразию орнаментов, выполненных в технике «горячий батик», или «басманахыш», как эту технику называют в Азербайджане, кялагаи можно смело отнести к нашему национальному декортивно-прикладному искусству.

Кялагаи упоминаются как шелковые изделия иностранными путешественниками еще в античных источниках и в средние века. Еще в XVII веке немецкий писатель, публицист, этнограф, политический деятель, ученый-естествовед и кругосветник Иоганн Георг Адам Форстер писал о производстве и изделиях из шелка в Азербайджане. Русский путешественник Петр Пашино отмечал кялагаи в газете «Кавказский вестник» в 1862 году. О шелке и изделиях из него упоминают так же в своих трудах в X веке арабские географы Абу Исхак Ибрагим ибн Мухаммад аль-Истархи и Шамсуддин Мухаммад ибн Ахмад аль-Мукаддаси. Об использовании шелка в Нахчиване и его успешном производстве в шеки писал османский путешественник Эвлия Челеби. Марко Поло, дважды побывавший во II половине XVII века в Азербайджане так же упоминал о производстве в здешних городах шелка. Немецкий математик, историк и географ, прибывший в качестве члена посольской делегации в 30-х годах XVII века к шаху Сефеви I так же отмечал о таких занятиях жителей Шамахи, как тканье, прядение и вышивание шелком и бумагой. В различные времена и исторические периоды, Шамаха была известна везде как центр шелководства, а также как поставщик шелка в другие города, в том числе в Дербент. Я.Я. Стрейс, Р. Джонсон, Т. Олкок, так же посещавшие Азербайджан, отмечали о Шамашинских базарах, где продавались изысканные, с красивыми узорами и орнаментами шелковые ткани и женские головные уборы.

Все это свидетельствует о развитии шелководства в Азербайджане, и с развитием шелководства-появления и постепенного усовершенствования изделий из этого материала. В те годы городами и селами-производителями шелка являлись Шуша, Нахчиван, Куба, Тебриз, Гянджа, Шеки, Баскал и Мюджи. Но проводя исследования нужно отметить, что изготовление кялагаи начиналось сперва в Баскале и только потом распространилось в другие города. Баскальские кялагаи до сих пор высоко ценятся и выделяются среди других.

Во второй половине XVI века, Азербайджан уже поставлял шелк в другие страны и города мира, а именно в Голландию, Англию, Стамбул, Алеппо, Марсель, Амстердам и Венецию. Тогда Ордубад и Джульфа занимали лидирующие позиции среди азербайджанских городов по экспорту шелка на мировой рынок. В 1862 году в Лондоне была проведена международная выставка, где азербайджанские кялагаи были моментально раскуплены, а купец-ткач получил а свой товар серебряную медаль.

В то время, когда мусульманские женщины всего мира носили паранжу, азербайджанские женщины надевали кялагаи, которые отличались красотой узоров.

Неудивительно, что в XIX-XX веках азербайджанские кялагаи пользовались так же успехом на всемирных выставках. И несмотря на то, что в 90-е годы XX века кялагаи потерял свою популярность, в связи с упадком шелководства в Азербайджане, в 2014 году кялагаи был включен в список нематериального культурного наследия ЮНЕСКО, как «Символизм кялагаи, традиции его изготовления и ношения».

Изготовление этого шелкового изделия является не простым процессом. Для создания кялагаи всегда использовался специальный шелк кялагаи, который состоит из нити неокрашенной трощенной пряжи, состоящей в свою очередь, из 2-3 шелковых волокон. Кялагаи по традиции бывает квадратным по форме, из низкоплотной ткани. Хотя, современные кялагаи часто изготавливаются в прямоугольной форме. Ткется кялагаи из цельного полотнища, бывает не больше 160 сантиметров. Это изделие во все времена изготавливалось вручную в специальных мастерских.

Следует отметить, что к XVII веку в Шамахинском уезде, включая Баскал, селение Мюджю и саму Шамаху, находилось самое большое количество таких шелководческих мастерских. А именно-107, тогда как в Шуше их было всего 5. Мастера по кялагаи назывались кялагаичи.

При создании кялагаи, шелковую ткань, снятую со станка сначала подвергают термической обработке в специально предназначенном для того растворе, а затем, после высыхания ткани, мастер подбирает соответствующие виду кялагаи специальные инструменты-формы, штампы, называющиеся галибами, и наносит орнамент на материал. При этом используется канифоль, или масло, изготовленное из парафина, необходимое для того чтобы цвет не проникал под масло. Если кялагаичы должен бывает изготовить многоцветное изделие, то снова повторяется этап нанесения орнамента, а также выкраски изделия в чане с другой нужной краской. Эта процедура повторяется столько раз, сколько бывает нужно. После этого краску закрепляют с помощью специальных растворов на открытом воздухе. Затем изделие помещается в горячий раствор, и потом снова сушится, а после сушки складывается и ставится под пресс. Эта традиция изготовления даже по сей день не теряет актуальность. Кялагаи могут быть даже восьмицветными.

Композиция кялагаи, использующийся материал галиба, цвет орнамента, цвет поля кялагаи влияют на то, к какому виду оно относится. Также, по тому или иному орнаменту, можно определить к какому региону относится, когда было создано изделие и какой смысл носит, ибо каждый узор на нем что-то символизирует. Многие узоры идут из древности. Если в древности большей популярностью пользовались изображения павлинов, сложные геометрические узоры, сочетающиеся с рисунками листьев и цветов, различные растительные мотивы, то в наше время эти узоры все еще не теряют актуальность. Хотя, к изображению павлинов, в наше время мастера прибегают все меньше и меньше. Из древних орнаментов в наше время самым широко используемым орнаментом продолжает оставаться бута. И даже у одного узора бута имеется множество разновидностей, таких как, например, «парная бута», «миндалевидная бута», «бала-бута», «влюбленные бута», «беременная бута», «цветочная бута», «обиженные бута», «сердитые бута», «шах-бута» и другие, которые очень часто используются в XXI веке современными мастерами, перенявшими все техники изготовления этого изделия. Некоторые галибы, с помощью которых печатают узоры и составляют те или иные композиции, дошли до наших дней имея возраст от двухсот до трехсот лет. И многие современные мастера-кялагаичи используют эти галибы, чтобы воспроизвести их копии для создания традиционных орнаментов на современных изделиях. Для кялагаи по сей день используют либо деревянные, либо металлические галибы.

Существуют определенные законы изготовления кялагаи, а также нанесения на него орнамента. Более того, каждый орнамент имеет свою символику. Например, как отмечает психолог Рена Ибрагимбекова, которая занималась изучением наследия кялагаи, бордюрные орнаменты ассоциируются с горами, что по поверью издревле означает защиту человека-носителя кялагаи, а бордюр посередине платка обозначает, судя по сложности узора и цвету- потусторонний, более сложный для нашего понимания и более яркий, по сравнению с нынешним, мир. В общем, орнаменты на изделии символизируют строение мира и вселенной, изображая при этом жизнь человека.

Выделяют два типа композиций кялагаи-это концентрические, или как их называют по-другому «хончалы»-с центральным кругом, и бордюрные-в которых кайма идет по всему периметру платка. Самой распространенной самостоятельной группой галибов орнамента композиции хончалы является

«гебек», а самыми распространенными среди галибов, использующихся в бордюрных композициях считаются «джир нар», «айпара», «дик хашийе», «бюльбюль», «солнце» и т.д.

Если раньше каждый узор носил не только эстетический характер, но также имел свое символическое значение, и при этом изобилие орнаментов, цвет изделия обозначали социальный статус, возраст женщины, и кялагаи определенного вида и цвета носились в конкретных случаях, то в наши дни такой символизм со временем начинает пропадать, и кялагаи больше носит эстетический характер, используется не только в качестве платка, но и шали .



Бордюрный кялагаи.



Концентрический кялагаи.

Однако, до сих пор в Азербайджане сохранилась традиция, в которой при сватовстве и на свадьбе на голову невесты накидывают кялагаи красного цвета с замысловатой арабеской, ибо красный цвет по народному поверью издревле считается цветом, носящим значение защиты от сглаза, злых сил и прочего. Такая традиция, как отмечала Рена Ибрагимбекова, относится не только к невестам. Так же в Азербайджане до сих пор имеет место быть обычай, при котором на свадьбе на жениха так же накидывают кялагаи ярких цветов. Еще считается, что если завязать кялагаи синего цвета на то место, которое болит, то человек вскоре будет излечен.

В настоящее время изготовлением кялагаи занимаются в Баскале и Шеки.

Одним из современных азербайджанских мастеров-кялагаичи является Амираслан Шахинов, владеющий цехом по производству шелка и кялагаи, который в наше время успешно продолжает традиции его изготовления.

Успешным дизайнером кялагаи можно так же назвать Мензер Гаджиеву, которая вдохновляясь традиционными узорами и методами изготовления кялагаи, привнесла свое видение, активно стилизуя традиционные орнаменты и добавляя что-то свое.

Сегодня, как и раньше, молодые женщины в большинстве отдают предпочтение кялагаи более пастельных тонов, а женщины средних лет-ярким изделиям, в то время как более темные кялагаи выбирает пожилое поколение. Как среди местных женщин, так и среди иностранок.

Существует даже традиция складывания кялагаи, которая имеет свой смысл, и которую на сегодняшний день так же строго соблюдают, как веками ранее, хотя люди стечением времени подзабыли смысл этого. А именно, сначала кялагаи трижды складывается по длине, что носит значение законов природы, двух начал-добра и зла, жизни и смерти. Затем, после этого его снова трижды складывают поперек. Так, чтобы образовался квадрат со стороной 18-20 сантиметров. Эти изгибы уже обозначают то, какую дорогу выберет для себя сам человек-будет ли он мудрым, или глупым, праведным или нет, плодотворной ли будет его жизнь или совсем наоборот. То есть тут олицетворяется человеческая сущность.

Как видно, кялагаи- это непросто предмет нашего национального традиционного декоративно-прикладного искусства, это еще и целая философия жизни и бытия, которая передается из поколения в поколение.

Несмотря на то, что традиция ношения кялагаи в течение столетий потерпела некоторые изменения, она не перестала существовать. Так, если раньше это изделие носили исключительно как головной убор, то в наши дни его используют и в качестве шали, в основном с вечерним платьем. Так же мусульманки могут покрывать голову не обычными платками, а именно кялагаи, так как это изделие является наследием нашего народа, которое нужно беречь и передавать из поколения в поколение, как это делали наши предки.

## Литература:

1. R.F. İbrahimbəyova, C.C. Tariverdiyev, Z.C.Müller Tariverdi. «Kəlağayı» Bakı 2016.
2. T. Babayev, T. Şahbazov. «Sirli-sehrli dünyamız: Azərbaycan kəlağayısı haqqında bir neçə söz». Xalq qəzeti. 11.01.2015. s.7.
3. www.trend.az. «Кялагаи-история, изготовление, орнамент: «Струящийся шелк-символ нежности». 28.11.2014
4. Азербайджанский Конгресс России. «Мудрость веков-келагаи». vakrf.ru 2016
5. Ə. Məlikova. Azərbaycan Xalq Tətbiqi Sənəti/Azerbaijan Folk Applied Art. «Kəlağayı Sənəti». Bakı 2018.

## Müasir dövrdə kəlağayının milli ənənələri

### Xülasə

Böyük İpək Yolunun Azərbaycanın ərazisindən keçməsi səbəbindən, iki min il bundan əvvəl ortaya çıxan sənətlərdən biri də baramaçılıq olmuşdur. Baramaçılığın inkişaf etməsi səbəbindən isə ipək məhsullarının istehsalı da inkişaf etmişdir. Kəlağayı qədim mənbələrdə və orta əsrlərdə xarici səyyahlar tərəfindən ipək məhsulu kimi istinad edilir. Bu ipək məhsulun istehsalı asan bir proses deyi. Və 20-ci əsrin sonunda Klaagi populyarlığını itirməsinə baxmayaraq, o, 2014-cü ildə UNESCO-nun qeyri-maddi mədəni irs

siyahısına daxil edilmişdir. Hal-hazırda kəlağayı istehsalı ilə Basqal və Şəkidə məşğul olurlar. Bu məhsul xalqımızın mirasıdır. Biz onu qorumalı və nəsildən-nəslə ötürməliyik.

**Ancient traditions of kalagai in our time**
**Resume**

Due to the passage of the Great Silk Road through the territory of Azerbaijan, sericulture became one of the crafts that appeared here about 2000 years ago. In connection with the development of silk production, the production of silk products began to develop. Foreign travelers mentioned kalagai in ancient sources and in the middle ages. Making this silk product is not a simple process. And although the kalagai lost its popularity at the end of the $20^{th}$ century, in 2014 it was included in the list of intangible cultural heritage of UNESCO. Currently, kalagai is manufactured in Basqal and Sheki. This product is the heritage of our nation. So we must cherish it and pass on from generation to generation.

**Рецензент: доктор философии по искусствоведению Э.Абдуллаева**

**Məmmədzadə Arzu Asəf qızı**
Azərbaycan Dövlət Rəssamlıq Akademiyası
arzu-memmedzade96@mail.ru

# MÜSTƏQİLLİK DÖVRÜNDƏ YARADILAN PORTRETLƏRDƏ QADIN OBRAZLARI

***Açar sözlər:*** *portret , qadın, kolorit ,müstəqillik, müasir, milli*
***Key words:*** *portrait, woman, coloring, independence, modern,national*
***Ключевые слова:*** *портрет,женщина,раскраска,независимость,современный, традиция*

Müstəqillik qazandıqdan sonra Sovet ideologiyasından azad olmuş Azərbaycan incəsənəti yeni irəliləyiş yoluna qədəm qoyur.Əvvəlki dövrlərdə olduğu kimi bəhs etdiyimiz dövrdə yaradılan portretlərdə də qadın obrazları aparıcı yer tutmaqda davam edirdi.Rəssamlarımız ailə üzvlərinin,dostlarının həmçinin ictimai həyatın hər bir sahəsində fəaliyyət göstərən xanımların da obrazlarını portret qaleriyalarına daxil edilirdilər.

Müasir rəngkarlığımızın görkəmli nümayəndələrindən olan Altay Sadıqzadənin maraqlı işlərindən biri "Axşam" (1993) əsəridir. Burada günəşin istisindən əldən düşmüş şlyapalı qadın günün günbatan çağında ağacın yarpaqları arasında əlində böyük tut yarpağı ilə təsvir olunub. Primitiv və lakonik təsvir üslubuna baxmayaraq portretdə insanın istirahət dəqiqələrində ətraf aləmə olan etinasızlığı, laqeydliyi ,sakitlik və rahatlıq halı olduqca dəqiq əks olunub. Rəsmə mavi rənglə çəhrayı rəng arrasındakı effektli kontras əlavə ifadəlilik bəxş edir. Həmçinin Altay Sadıqzadənin sərbəst şəkildə yaratdığı portretlər sırasında "Günəş altında" ( 1993 ) əsəri özünəməxsus yer tutur.Yenə də çılpaq və qurşağa qədər təsvir olunan obraz qarşımızda dayanıb. Bənövşəyi rəngdə həll olunan obraz kompozisiyanı son dərəcə ifadəli edir.Günəşdə yanmış model sanki ona ayrılan məkana güclə sığışır. Əsərə baxdığımız zaman qızmar yay günündə xilas edici kölgənin sərinliyini hiss edirik. Özünün fərqli üslubu ilə seçilən sənətkar Tahir Salahovun yaradıcılığı təsviri sənətimizdə xüsusilə maraqlıdır . Onun 1997-ci ildə xüsusi diqqət və sevgi ilə yaratdığı "Varvaranın məktubla portreti" əsəri qadın obrazlarının yer aldığı ən maraqlı işlərindən biridir.Rəssamın yaxından bələd olduğu həyat yolaşının obrazı zəriflik , zahiri cizgilərin incəliyi ilə fərqlənir. Tabloda kompozisiyaya fərqlilik gətirən əsas məqamlardan biri də əlavə detalları özündə əks etdirən güzgünün təsviridir. Otağın divarındakı güzgüdə obrazın zəif işıqlandırılmış simasını və siluetini rəssam dəqiqliklə çatdırmağa çalışıb.

Azərbaycan təsviri sənətinin yaşlı nəslinin nümayəndəsi Oqtay Sadıqzadənin 1997-ci ildə çəkdiyi aktrisa Şəfiqə Məmmədovanın portreti də maraqlıdır.Obrazın üz cizgiləri əsərin əsas məzmununu açıqlayır.

Rəssamın obrazın dərinliyi ilə seçilən qadın portretlərindən biri də görkəmli yazıçı Hüseyn Cavidin həyat yoldaşı Müşkinaz xanımın portretidir. Kətan üzərində yağlı boya ilə 1999-cu ildə yaradılmış portretdə Müşkinaz xanım kresloda əyləşmiş halda təsvir olunub. Əlini digər əlinin üzərinə qoyan xanım dalğalı saçlarla əhatələmiş başını sola doğru əyib. Obrazın geyiminin həllində seçilmiş tünd rənglər, kədər və ciddilik ifadəsi vəhdət yaradır. Şübhəsiz ki, XXI əsrin ilk on illiyində yaradılan ən gözəl portret əsərlərindən birinin müəllifi Oqtay Sadıqzadədir.Söhbət sənətkarın 2002-ci ildə ərsəyə gətirdiyi kraliça II Yelizavetanın portretindən gedir.Kraliçanın taxta çıxmasının 50 illiyi münasibətilə yaradılan tablo kətan üzərində yağlı boya ilə çəkilib.Bütün xırdalıqlarına kimi gözəl tərtib olunmuş kompozisiyada detallar məntiqə uyğun ardıcıllıqla işlənilib. Ağ,uzun libaslı kübar obraz dekorativ interyerin fonunda ,dəbdəbəli sütünun qarşısında ayaq üstdə dayanıb. Burada tac və boyunbağının təsviri əsəri daha da təntənəli edir.

Yaradıcılığında qadın obrazlarına xüsusi əhəmiyyət verən müasir rəssamlarımızdan biri də Altay Hacıyevdir. Onun 1995-ci ildə yaratdığı Ağa bəyim Ağanın portreti (Şəkil.1) maraqlı məziyyətləri ilə fərqlənir. Əsərin qəhrəmanı Qarabağ xanı İbrahim Xəlil xan Cavanşirin qızı, ədəbiyyatımızda özünəməxsus yeri olan incə ruhlu şairədir. Milli geyimdə təsvir edilən qadının zərif, incə daxili aləmi sənətkar tərəfindən təbiətin gözəlliyi ilə qarşılaşdırılır. Altay Hacıyev yaradıcılığında bununla kifayətlənməyib Məhsəti Gəncəvinin, Qönçəbəyimin, Həcərin, Tutu Bikə və Xan qızı Xurşudbanu Natəvanın da kamil obrazlarını yaradıb. Kompozisiya biçimi və rəng həlli baxımından təkrarsız yaradılan bu əsərləri birləşdirən əsas cəhət obrazların hər birinə xas olan mübarizə ruhu,yaşayıb-yaratmaq əzmidir. Daha sonra rəssam bu silsiləyə Aşıq Pərinin obrazının əlavə edilməsini də vacib bilmiş və beləliklə 2002-ci ildə yeni bir portret yaratmışdır. Saz-söz ustadının çöhrəsində öz dolğun ifadəsini tapmış psixoloji yaşantılar Qarabağın əsrarəngiz təbiəti fonunda yaddaşlara əbədi həkk olunur.

Əli Verdiyev politrasında sərt və ciddi rənglərlə yanaşı,lirik və şairanə,zərif rənglərlə də qarşılaşırıq.Bu baxımdan rəssam yaradıcılığında qadın obrazlarına geniş yer vermişdir.

"Fatma" (2000),"Selda" (2005),"Televizor qarşısında" (2005), "Nagihan xanım" (2004),"Ayişə" (2008),"Aylin" (2008) əsərləri onun türk qadınlarına həsr etdiyi portretlərdir. Bu əsərlərin hər birində rənglərin və cizgilərin harmonik vəhdəti canlanır.

"Fatma" əsərində əsas diqqəti tünd qırmızı örtüyə bürünmüş qadınının sönük baxışları çəkir . Abstrakt fon və əlvan qırmızı rəng obrazın həddən artıq fikirli aurası ilə birləşərək dramatizmi artırır

Rəssamın 2005-ci ildə yaratdığı ,həyat yoldaşınının təsvir olunduğu portretin zərif qəhrəmanı müdrik yaşlarında təsvir olunub.Tamaşaçıya qarşı yönəlmiş ifadəli baxışlarındakı təmkinlilik və daxili güc həyatdan öz payını almış obrazın əsas xüsusiyyətləridir.

1991-ci ildə çəkilmiş "İspan qadını" əsərində pəncərə qarşısında kresloda əyləşmiş kübar qadın təsvir edilib.Qarışıq texnikada ərsəyə gəlmiş bu əsərdə əsas diqqət qadının geyiminin plastikasına yönəlib.

Əli Verdiyevin qadın obrazlarını yaradarkən milliliyə və dekorativliyə daha çox can atdığını görürük . Bu qəbildən olan "Milli geyimli türk qızı" (2000-ci illər) tablosunda adından da göründüyü kimi türk milli geyimində gözəl gənc qadın təsvir olunub.Dekorativ həll olunmuş tabloda rəssamın türk qadınlarına rəğbəti özünü təcəssüm etdirir.Şərq koloritindən istifadə əsərə emosional əhval-ruhiyyə bəxş edir. Nəticədə Şərq qadınına məxsus sadəlik,gözəllik,utancaqlıq kimi xüsusiyyətlər özünü daha qabarıq büruzə verir.

Müasir Azərbaycan rəngkarlığının formalaşmasında, həmçinin bu günki inkişafinda misilsiz xidmətləri olan sənətkar Sakit Məmmədov hər zaman özünəməxsus dəst-xətti ilə fərqlənmişdir.Təəccüblü deyil ki, bu cür zəngin yaradıcılıq irsi olan sənətkar yaratdığı portret qaleriyasında qadın obrazlarına xüsusi yer verir. Onun "Aida" (2000) əsərində təsvir olunan gənc xanım düşüncələr aləminə qərb olub. Obraz nə qədər fikirli olsa da gözlərini kənara deyil tamaşaçıya yönəldib.Xanımlara məxsus nazlanmaq xüsusiyyəti bu obrazdanda yan keçməyib. Qadının geyimindəki rənglər , arxa fon, həmçinin əlində tutduğu gül-bütün bunlar bir -birləri ilə çox gözəl harmoniya yaradır. "Nərgiz" (2010) tablosu da rəssam tərəfindən yaradılan gözəl portretlərdən biridir. Gənc qadının qaranlıqlar içərisində işıq saçan siması əsas diqqəti qeyri iradi olaraq öz üzərinə çəkir.Bu əsərdə də obrazın tutqun gözləri fikirli halda uzaqlara yönəlmişdir.

Sakit Məmmədovun 2010-cu ildə yaratdığı "Aynur" əsəri də olduqca maraqlıdır. Gözəl bir yay günündə kölgəlikdə əyləşən balaca qız əlində xoşladığı çiçəkləri saxlamışdır. Burada balaca qızın əlində tutduğu yenicə çiçək açmış, zərif güllər obrazın həyatı ilə qarşılaşdırılır. Aynurun geyimi, şlayapası ,bir az küskün siması obraza bir qədər şıltaqlıq abu-havası gətirir. Daha bir qadın portreti 2012-ci ildə yaradılmış "Lalə" əsəridir. Rəssam təsvir etdiyi qadının müasirliyə və dəbə olan meylini vurğulamaq üçün bəzək əşyalarından məharətlə istifadə etmişdir. 2015-ci ildə yaradılan "Portret" əsəri digərlərindən fərqlənir. Bu dəfə sənətkarın canlandırdığı obraz sıltaq ,gənc xanım deyil, artıq ömrünün çox hissəsini geridə qoymuş yaşlı bir qadındır. Obrazın baş örtüyü əsərə millilik gətirib.

Sakit Məmmədovun yaratdığı qadın obrazları sırasında biz həmçinin dünya miqyasında tanınmış şəxslər ilə də rastlaşırıq. Monika Beluççinin, Şahzadə Diananın, Ajda Pekkanın portretləri bu qəbildəndir .

Anna Mariya Belluççi" (Şəkil.2) əsərini 2015-ci ildə yaradıb. Öz gözəlliyi ilə hər kəsi heyran edən aktrisa sanki hansısa jurnalın üz qabığı üçün poz verir. Obraza incə yanaşma , dərin maraq onu olduğu kimi ifadəli təsvir etməyə kömək edir.

**Ədəbiyyat:**

1.Анар. Литература, искусство, культура Азербайджана. I том. «Letterpress», Баку - 2010. 874 стр

2.Əsgərova X. X XX əsr Azərbaycan boyakarlığının inkişafı. Bakı,. 2015.

3.Fərzəliyev. Ç Azərbaycan rəngkarlığı antologiyası. Bakı: Mega 2007.

**Women portraits created during the independence period**

**Summary**

After the collapse of the Azerbaijani art, unconditionally from the Soviet ideology, got acquainted with the new way. As in the previous periods, the portraits of women continued to lead the leading positions. Our artists are also members of their family, friends and family in all areas of society who have been included in their gallery.

One of the most interesting works of Altay Sadigzadeh, one of the prominent representatives of our modern painting, is "The Evening" (1993). Here, a lady who misses the heat of the sun is depicted with a big leaf in the hands of the leaves of the tree during the sunset.

